*Bu kitab* ***“Səməd Vurğun.*** *Əsərləri. Yeddi cilddə. III cild”*
*(Bakı, Elm, 1986 ) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Aslan Salmansoy**

Redaktoru: **Aybəniz Vurğunqızı**

**894.361 - dc 21**
**AZE**
**Səməd Vurğun. Seçilmiş əsərləri.** Beş cilddə. III cild. Bakı, “Şərq-Qərb”, 2005, 424 səh.

Xalq şairi Səməd Vurğun yalnız dili, ifadə tərzi, üslubu etibarilə deyil, düşüncəsi, təfəkkürü etibarilə də məhz Azərbaycan şairidir. Vurğun yaradıcılığının tarixi əhəmiyyəti özünü bir də onda göstərir ki, XX əsrin ortalarından başlayaraq Azərbaycan poeziyasında böyük bir məktəb – Səməd Vurğun məktəbi formalaşıb inkişaf edir.

Seçilmiş əsərlərinin III cildinə ölməz şairin poemaları, o cümlədən Vurğun istedadının, poetik təfəkkürünün əsl miqyasını və möhtəşəmliyini göstərən “Komsomol” poeması, “Bəsti”, “Bakının dastanı”, “Muğan”, “Aygün” kimi şah əsərləri daxil edilmişdir.

Təbiətin bütün ömür boyu şeir demək istedadı qismət elədiyi Səməd Vurğunun poetik nəfəsi o dərəcədə nəhayətsizdir ki, hər poema qurtaranda onun bitdiyinə inanmaq olmur. Çünki bu əsərlərdən hər birinin qurtardığı yerdə poetik nəfəs daha çox açılır. Təb və genişlik hüdud bilmir, sərhəd tanımır.

Sözün həqiqətini almaq üçün min cürdən birini yazdığındandır ki, yazanda yaşayan Vurğunun bitib-tükənməz ilhamdan yaranan sözləri bu qədər işıqlıdır.

**ISBN 9952-418-46-6**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# KOMSOMOL POEMASI

## QIŞ GECƏSİ

Ayazlı, şaxtalı bir qış axşamı
Yeddi yoldaş olub yola düzəldik,
Qarlarla örtülü bir düzə gəldik;
Ayazlı, şaxtalı o qış axşamı,
O, ay dediyimiz göylərin şamı
O qarlı düzlərə baxıb yanırdı,
Yolçular getdikcə yol uzanırdı...

* * *

Bəxtiyar qabaqda quş kimi səkir,
Murad bir tərəfdə papiros çəkir,
Cəlal da zil səslə deyir bayatı,
Tutub qışqırığı bütün elatı.
Gecənin qoynunda bir zümzümə var,
Ən arxadan gələn xəstə Şahsuvar
Tövşüyə-tövşüyə durub bağırır,
– Bir dayanın! – deyib bizi çağırır.
Qüvvəsi qalmamış artıq yeriyə,
Tələsik fırlanıb döndük geriyə,
Aldıq ortalığa Şahsuvarı biz,
Zəif qollarından tutub ikimiz:
– “Aya, yorulmusan, gəl otur!” – dedik,
Ancaq o yenə də dayanmış dimdik
sanki bir taxta, –
İşləmiş qanına bu quduz şaxta.
Qalın dodaqları gömgöy kəsilir,
Canından istilik uçub əskilir.
Taqəti yoxdur ki, bir söz söyləsin,
Təbibsiz, davasız xəstə neyləsin?
Buludlar oynadı, gecə qaraldı,
Gecənin gizli bir həsrəti vardı...





Gəzdi qaranlığı barmaqlarımız,
Sadə biyanlardan döşürüb dərdik;
Qarların üstündə tonqal qalayıb,
Xəstəni tonqalın yanına sərdik.
Canına keçdikcə odun istisi
Qolları tərpənir, qımıldanırdı,
Bu sadə tonqalın yaşıl tüstüsü
Gecənin qoynunda dumanlanırdı...

Uzaqdan birisi – ruzgar qanadlı,
Gəlir baş götürüb işığa doğru.
Dedik, kim olmalı bu vaxtsız atlı?
O bəlkə quldurdu, bəlkə də oğru!
Hər halda ehtiyat gərəkdir – deyə,
Bəxtiyar tüfəngi doldurub qalxdı,
Zilləyib gözünü bir az da baxdı.
O, ilk gülləsini boşaltdı göyə,
Hər halda ehtiyat gərəkdir – deyə.
– Ay Allah bəndəsi, nə oldu sana!
Bir kim olduğumu xəbər alsana! –
Dağıldı atlının bu qışqırığı,
O can qorxusunun can hıçqırığı...
Bizsə çaxnaşaraq, dedik: – Bir dayan!
Bəlkə bizimkidir o gələn insan...
Qoy bais olmayaq onun qanına.
Bəxtiyar tüfəngi saldı yanına.
Atlı çaparaq,
Yoldan saparaq,
Gün batan tərəfə çapdı atını,
Üfüqlər gizlətdi o qaraltını...

## ATIŞMA

Açıldı bir zaman sabahın gözü,
Göründü dağlarda günəşin üzü.
Qışın səhərində bu qarlar düzü

Günəşdən qızınıb xumarlanırdı,
Quşlar qanadından tumarlanırdı...
Bir qədər özünə gəldi xəstəmiz,
Düzəldi mənzilə yenə dəstəmiz.
Ətəkləyib yolu, vardıq bir başa,
Şər qarışan zaman gəldik Dikdaşa.
Bir dağ ki, daşları dəmirdir, tuncdur,
Dəlik-deşikləri xeyli qorxuncdur.
Baxanda insanın bağrı yarılır,
Yanından hər yana yollar ayrılır;
Bir dağ ki, hər zaman haqsızı haqlar –
Qaçağı, qulduru gizləyib saxlar.

Top-tüfəng səsinin kəsilməz ardı,
Olub "Qançanağı" bu dağın adı;
Ellərin yağısı olmuş əzəldən,
Alıb qarğışını min bir gözəldən,
Daşları sapsarı, çiçək bitirməz,
O qədər arsız ki, bir şey itirməz...
Dağın ətəyindən ayrılır bir qol
Peykanlı kəndinə aparır bu yol.
Enişdən, yoxuşdan keçib düzəldik,
Haman söylədiyim bu yola gəldik;
Demək ki, az qalır kəndə çatmağa,
Uşaqlar can atır bir az yatmağa.
Bəxtiyar:
        – Tez olun!
                        Cəlal:
                                – Nə var ki?
– Dağların qucağı o qədər dar ki,
İtər bu yerlərdə bir ordu belə.
– Eh, elə
Sən dinib, danışıb qara tökürsən...
– Cəlal, bu qeyrətlə, bu hünərlə sən.
Keçərsən bir zaman lap Napalyonu
Deyib məsxərəyə qoyarkən onu,
Göründü qarşıda bir top qaraltı,

Bir çoxu piyada, bir çoxu atlı...
– Kimsiniz?
  – Yolçuyuq!
    – Tərpənməyiniz!
Yaraqdan, yasaqdan varsa nəyiniz
Atın yol üstünə!
    – Bacarmazsınız!
Çünki milyonlardan yüz qat azsınız! –
Deyərək Bəxtiyar bir nişan aldı,
Gülləsi dağlara gurultu saldı.
O düşmən dəstənin başçısı Gəray
Tüfəngi üzünə tutduğu zaman
Cəlal qaranlığa sıxdı naqanı,
Töküldü yəhərə Gərayın qanı.
Yataraq birtəhər atın yalına,
Səyirdib dolandı dağın dalına.
O gündən bir qolu topal yaşadı,
Topal Gəray – deyə çağrıldı adı.
Sonra atışmanın uzandı ardı,
Qabaqda üç nəfər nişançı vardı.
Niyaz bəy tələsik qalxıb atına,
Soxulmaq istərkən yolun altına,
Qabağı kəsmişdi yoldaş Şahsuvar,
Qışqırdı: – Qaçmağın nə mənası var?!
Al, yağı, bir güllə!
  Olmadı fəqət...
– Al, bu ikincisi!
  Tutmadı... Dəhşət...
– Al, bu üçüncüsü!
  Yıxıldı Niyaz...
  Keçmədən bir az
  Bir də qalxaraq,
  İki, üç daraq
Şahsuvar tərəfə patron boşaltdı,
Qüvvədən düşərək gözləri batdı...

O yanda Bəxtiyar, yanında Cəlal:
– Olsun inqilaba qanımız halal, –

Deyib vermişdilər elə baş-başa,
Onları meydanda qoyub Mirpaşa
Qaçıb soxulmuşdu qaranlıqlara...
Bəxtiyar tüfənglə vermədən ara:
– Ya mən ölməliyəm, ya siz! – deyirdi.
Cəlal quvarlanıb* nəşə yeyirdi.
Beləcə, cəbhələr atışdı xeyli,
Ölüm səngərində yaşamaq meyli
Onların qəlbini hey dindirirdi,
Bəzən Bəxtiyarı diksindirirdi...

Mətləbi qurtaraq, gəldi bir zaman,
Gecənin ahəngi dəyişdi haman,
Uzaqdan göründü bir bölük atlı,
Atları quşlardan itiqanadlı,
Havada parladı qızıl bir nişan...
Gərayın dəstəsi olub pərişan:
– Arxadan gələn var, – deyə qaçdılar,
Atlılar gəlincə dağdan aşdılar.

## O, BİZDƏN AYRILARKƏN

Şahsuvar gecənin qoynunda sakin,
Qəlbində intiqam, gözlərində kin,
Son dəfə toplayıb yazıq özünü,
Astaca söylədi bu son sözünü:
– Gözləri yoldadır anamın, şəksiz,
Vaxtsız ölməyimi xəbər verin siz!
Deyin ki, arxamca ağlamasınlar,
Yas tutub, qaralar bağlamasınlar.
Bir də ki, Gülcamal... Ah, onu, bilsən,
Bütün varlığımla sevmədəyəm mən.
Nə olur son dəfə görsəydim onu,
Yaxşı gətirmədi ömrümün sonu.

* Ürəklənib, fərəhlənib

Mən hələ cəbhələr, toplar almamış,
Onların yurduna tufan salmamış
Ölürəm... Dünyada nə qaydadır bu?..
Qabaqda düşmənin sağdır ordusu.
Sizsə tüfəngləri doldurub gedin,
Cəbhədən çəkilib dönməyin geri!
Haydı, dayanmayın, tez durub gedin,
Düşmənlər almasın öldüyüm yeri!
Cəbhədən çəkilib dönməyin geri!... –
Deyib vidalaşdı o ömrü yarı,
Bir daha baxmadı Günəşə sarı...

## SAHİLDƏ

Kürün qumsal sahilində
qaşlarını çataraq,
Qamçısını döyür suya
hiddətindən Gəray bəy...
Üç aydır ki, ormanların
arasında yataraq
Əl üzmüşdür vətənindən,
millətindən Gəray bəy.
Qamçısını döyür suya
hiddətindən Gəray bəy!
– Nədən mənim qabağımdan
artanları yeyənlər,
Köhnə-köşkül paltarımı
öz əyninə geyənlər
İndi mənə ağ olsunlar?..
Xanimanım dağılır,
Qızı yelin inəklərim
yad əllərdə sağılır...
Kürün sahilində var əski bir köy*,
Üstündə hər zaman çılpaq olur göy.
Salahlı kəndidir bu kəndin adı,

---
* Kənd

Hər yerdə sahilə söykənir ardı.
Dalğalar qudurub daşdığı zaman
Sahilə ən yaxın evləri haman
Kökündən qoparıb alır qoynuna,
Odur ki, ən köhnə zamandan ona
Deyirlər: "Qadalı-qanlı Kür çayı",
Keçidlər qarışır hər aprel ayı.
Bir axşam günəşin batdığı zaman
Sizin bildiyiniz o topal Gəray
Qalın bir ormanın arasında tək,
Ağacdan-ağaca göz gəzdirərək,
Kürün sahilində gəlib dayandı,
Gözləri hirsindən alışıb yandı.
Onun xatirindən keçdi doyunca
Haman bu ormanda, sahil boyunca
Bir zaman kükrəyib at oynatdığı,
Turaca, kəkliyə tüfəng atdığı...

## İLK TƏSLİM

Azacıq keçmədən sular qaraldı,
Sahildə bir dərin səssizlik vardı.
O taydan bu taya işıqlar gəlir.
Tüstülər burulub göyə yüksəlir
Gəray bəy gözünü zilləyib ona,
Varlığı daş kimi qalmışdır dona...
Üçüncü gündür ki, qolunda yara
Karıxıb, vurnuxur dörd bir diyara.
Gurultu qopduqca ac mədəsindən,
Diksinir, suların oynaq səsindən.
Nələr keçdiyini o duya-duya,
Özünü tullamaq istərkən suya,
Qalıb pəncəsində namusla arın,
At kimi sıçrayan ağ dalğaların
Qoynuna gözləri dikilib qalır,
Qəlbində həsrəti, kini çoxalır...
Sonra gözlərinə görünür birdən





Sahilə göz çəkən gəmiçi Bəhmən.
– Sənmisən, ay Bəhmən?
– Kimdir soruşan?
– Mənəm, bir bəri gəl, söyləyir Gəray.
– Bu ki, tanış səsdir, – deyərkən Bəhmən
Fırlanıb geriyə, yönəlir həmən:
– Vay, səni xoş gördük, haradan belə?
Bu namərd vətənə... Bu namərd elə
Yenəmi üz qoyub, salam verirsən?
– Haqlısan, ay Bəhmən, sözlərində sən,
Fəqət nə etmək ki, belədir insan,
Əziz dostlarına küsər bir zaman,
Sonradan qövr eylər əski yaralar...
– Yoxsa, bu gəlməkdə bir fikrinmi var?
– Onsuz olurmu heç... Vardır, şübhəsiz...
Bu el, bu güzəran, bu mən, bu da siz,
Gəlin köməkləşək görək nə olur?
Axtaran dünyada hər haqqı bulur –
Demişlər babalar,
– Bu doğru, lakin
Bir az hövsələniz olmasa sakin
Yenə də günahsız qanlar axacaq,
Burax bur tərsliyi, gəl Allaha bax! –
Gözaltı süzərək qoca Bəhməni:
– Sonra danışarıq... Hələlik məni,
Duz-çörək eşqinə keçir sahilə! –
Deyib, gəmiçini tutaraq dilə...
– Keçərsən!.. – deyərək qışqırdı birdən
Dünəndən Gərayın izilə gələn.
Komsomol Bəxtiyar, yanında Cəlal,
– Olsun inqilaba qanımız halal –
Deyib vermişdilər yenə baş-başa...
Gəray öz yerində dönmüşdü daşa.
İstədi əlini atsın naqana,
Gördü ki, naqanı batmışdır qana.
Hirsindən bozarıb gözləri doldu,
Ömründə ilk dəfə o təslim oldu.

## HUMAY

Humay düşündürür, Humay ağladır...
O nə Tatyanadır, nə Ofelyadır.
Həyata gəldiyi o gündən bəri
O küskün baxışlı qara gözləri
Nələr düşündürür...
                    Onun həyatı,
Sevgisi, taleyi, müqəddəratı
Hər zaman andırır vərəmli bir qış,
Bütün diləkləri gözündə qalmış.
İcazə versəniz danışaram mən
O, qız xəyalının incəliyindən:
Daldığı musiqi – sazların səsi,
Ya da ki, quşların vəhşi nəğməsi...
Dağların döşündə gəzinən çoban
Dərdlənib neyini çaldığı zaman,
Yaşarır Humayın qara gözləri,
Həyata gəldiyi o gündən bəri.
Bilirəm dərdini, bilirəm nədir,
Humay, tək ayaqlı bir qərinədir...
Əlinə ömründə kitab almamış,
Böyük şəhərlərdə qonaq qalmamış,
Nə bir dəmir yolu, nə də bir qatar
Görməmiş... Gecələr o qatar-qatar
Uzanan durnalar nələr andırar?
Humayın qəlbini niyə yandırar?

Bəzən qonşuluqda ağlaşma səsi,
Kəndli qadınların ediləşməsi*,
Dil deyib ağlayan yaslı gəlinlər,
Qanadlı nalələr, ahlar, əninlər,
Qızın xəyalını qaldırıb yenə
Uçurur göylərin dərinliyinə...
Bəzən də göylərdə qızartı varsa,

* Dil deyib ağlaması

Üfüqdə bir qızıl şimşək çaxarsa,
Qorxub təbiətin hikmətlərindən
Humay ahu kimi ürkərək həmən
Soxulur çadırın küncünə sarı,
Gözaltı seyr edir ta uzaqları.

Dünyanın sirrini nə bilir Humay;
Bəzən də göyləri gəzən solğun ay
Yarıb buludları hücuma çıxar,
Onun səngəridir sıx-sıx buludlar.
Humay bu lövhədən maraqlanır pək*,
Ayın arxasınca fikirləşərək,
Nəhayət yorulur, kütləşir başı,
Donub kölgələnir məyus baxışı.
Bilirəm dərdini, bilirəm nədir,
Humay təkayaqlı bir qərinədir...

O hər gün oyanır quşlardan qabaq,
Yaxın bir təpənin üstdən aşaraq,
Tərpənir sahilə – bulaq başına,
Qoyub səhəngini sahil daşına,
Seyr edir səslənən ormanlıqları,
Pozur saçlarını səhər ruzgarı...

Bir az da Humayın axşamlarından:
Qaranlıq döşünü gərdiyi zaman
Onun da ruhuna qaranlıq çökür.
Çırmayıb qolunu, itə yal tökür;
Qapının ağzında paltar-palazdan,
Nə varsa içəri götürür asta,
Cehiz sandığına bir qıfıl vurur;
Humayın gündəlik işləri budur.
Əl-ayaq yığışır, hamı əyləşir,
Ağlına gələni danışır bir-bir.
Kişilər dəm vurur pəhləvanlıqdan,

* Çox

Güləşdən, gülllədən, ölümdən, qandan.
Qocalar qızışır, danışır hərdən
Zal oğlu Rüstəmdə olan hünərdən.
Sonra Koroğludan, bir də Qıratdan...
İnsan yorulmadı bu xatiratdan...
Molla Nəsrəddinin məzhəkələri
Ellərin ağzına düşəndən bəri,
Uşaqlar da onu sevərək oxşar,
Dünyanın qəribə macərası var...

Sonra qadınlar da növbəylə bir–bir
Qohumdan, qonşudan qeybət eləyir :
– Ay qız, Gülcamalın tutarı yoxdur,
Bu qoca vaxtında heç arı yoxdur.
Yenə sırğalanır, sığallanır, bax;
Deyən, ər axtarır bu qoca sarsaq:
Rəng alıb, rəng verir, gözlərin aydın.
Bu saxta sözləri deyən bir qadın.
Oynadır qaşını, süzür gözünü,
Gülünc bir şəkilə salır özünü.
Altmış ildir ki, sənəti budur,
Səhər dediyini axşam unudur...
Humay xoşlamayır bu söhbətləri
Əyrini, doğrunu seçəndən bəri.
Sonra süfrə gəlir, oturub yerdən,
Qatıqdan, qaymaqdan, yağdan, pendirdən
Nə varsa yeyilir, üstündən də çay...
Hamıdan az yeyir, az içir Humay.
İştahı olsa da, hey çəkinərək:
"Qız olan bəndələr az yesin gərək".
Humay düşündürür, Humay ağladır...
O nə Tatyanadır, nə Ofelyadır.
Həyata gəldiyi o gündən bəri
O küskün baxışlı qara gözləri
Nələr düşündürür...
                    Onun həyatı,
Sevgisi, taleyi, müqəddəratı

Hər zaman andırır vərəmli bir qış,
Bütün diləkləri gözündə qalmış...
Bilirəm dərdini, bilirəm nədir,
Humay təkayaqlı bir qərinədir.

* * *

Şairim! Yaxanı bir qurtar da sən
İnsana dərd verən hadisələrdən.
Bizə yaşamaq da, ölmək da tanış,
Bir az da başqa bir aləmdən danış!

Ömür dedikləri dalğalı bir su...
Acdır insanların fikri, duyğusu.
Həyatı güldürən dastanlar yarat,
Varsın da qədrini bilməsin həyat!
Ağardı saçların, ömrün də yarı;
Kasadlıq keçirir şeirin bazarı.
Gərək sinirlərin heç dincəlməsin,
Gecələr gözünə yuxu gəlməsin!
Hanı əsrimizin böyük Bayronu!
Qüdrətin varsa da, sən yarat onu!
Hanı Füzulinin ağlar qəzəli,
Vaqifin gözaltı gülən gözəli.
Söndümü duyğular, öldümü sənət,
Küsdümü şairə, şeirə təbiət?..

İndi gül dəmidir, fəsli-bahardır,
Hər gülün, çiçəyin bir sirri vardır.
Əsrimiz nə qədər böyük olsa da,
Çoxları möhtacdır bir təmiz ada.
Qüdrətin varsa da, bunlardan danış,
Bizə yaşamaq da, ölmək də tanış...

Mən bu xəyal ilə xeyli zamandır
Söykənib dururam yazı masama.
Könül viran qalan bir xanimandır,

Gözümdən kağıza yaş dama-dama
Söykənib dururam yazı masama.

Nədən şeirlərim ağıza düşüb,
Dağların çobanı məni anmasın?
Nədən karvanıyla quşlar ötüşüb,
Başımın üstündə havalanmasın?
Dağların çobanı məni anmasın?

Nədən bu torpağın şirin ləhcəsi
Şairəm deyənə biganə qalsın?
Niyə gurladıqca suların səsi
Ondakı qüvvəti ruzqarlar alsın?
Şairəm deyənə biganə qalsın?..

Nədən söyləməsin ana dililə
Öz odlu nitqini yoldaş komissar?
Türkcə danışmasın sevgilisilə...
Bu mənhus adətdə böyüklükmü var?
Məndən inciməsin yoldaş komissar!

Nədən şeirimizin baş qəhrəmanı
Gah Turandan gəlir, gah da İrandan?
Bəs mənim ölkəmin varlığı hanı?
Böyük bir şairin yazdığı dastan
Gah Turandan gəlir, gah da İrandan!..
Budur mən açdığım yarış meydanı! –
Gəlsin Verxarnı yamsılayanlar!..
Çoxdan danışmayan sevgilim hanı?
Gəlsin Verxarini yamsılayanlar!..
Kimindir sabahdan axşama qədər
Yağışda, yağmurda çalışan əllər?
Kimindir gecələr yuxusuz qalan,
Səhvlər buraxan, töhmətlər alan,
Fəqət hər ağrıya köksünü gərən,
İşıqlı bir günə yollar göstərən,
Günəşin altında, suyun içində,





Əkində, tarlada, suda, biçində
Dərisi çatlayan, gönü qaralan,
Torpağın bağrını təpiklə yaran,
Tərlan səhərlərin laçın övladı?
Şeirə yaraşmazmı onların adı?
Kimindir bu oba, bu söhbət, bu saz?
Kimindir bəzəkli gəlin kimi yaz?
Baxın cərgələnib keçən əsgərə,
Səsinə səs verir hər dağ, hər dərə.
Baxın o növbədə duran süngüyə,
Baxın bu torpağa, baxın bu göyə.
Kainat qurğusu, canlı bir əsər...
Bəşər yaşadıqca yaşamaq istər!
Qanadlan ilhamım, havalı könlüm!
Daşlı, tikanlıdır uğurlu yolum.
Böyük bir ölkənin vətəndaşısan,
Çiynində torpaq da, daş da daşısan,
Ağ günlər sərinə çox görmə bunu...
Həyata, insana ödə borcunu!..

## MARAQLI BİR HADİSƏ

Heyrət içindədir komsomolçular,
Deyirlər maraqlı bir hadisə var:
Mirpaşa məscidə bağlamış köpək.
Kəndlilər qızışıb qeyzlənərək –
Qarılar, qocalar qiyamət edir,
Kəndin arasında danışıq gedir.
Vicdan götürməyir bu haqsızlığı,
İştə Mirpaşanın əxlaqsızlığı
Dillərdə söylənir cinayət kimi,
Söylənir Allaha xəyanət kimi.
Toylarda, yaslarda, ağlaşmalarda,
Hər kimin qüvvəti qalırsa darda,
Hər kimin taxılı susuz yanırsa,
Kimin qonşusuna həsədi varsa,

Deyir: “Bu kafirlər üzə gələli
Bizdən uzaqlaşdı Allahın əli”.
Bu qara fürsəti fövtə verməyən,
Ömründə doğruluq, düzlük görməyən
Axund Şirəlinin uzanmış dili...
Cibindən çıxarır islaq məndili*,
“Ağlayır” məscidin minarəsində;
Onun qulaqları “oxşar” səsində
İnsanlar yaralı bir ahəng duyur,
Könül duyduğuna bilmədən uyur...
Budur, bir varlının ehsan yerində
Axund pişik kimi atılıb yenə
Ayələr gətirir “böyük” Qurandan,
Söyləyir: – İyrənin ölümdən, qandan.
Tanrı unudulur, din gedir əldən –
Dedikcə ağlaşma səsləri hərdən
Onun səsindəki qüvvəti alır.
Çəkir nəfəsini o ağır-ağır...

## QAPALI İCLAS

Aparır iclası yoldaş Bəxtiyar –
Mənim dastanımın baş qəhrəmanı.
Onun gözlərində bir iztirab var,
İştə, düşündürür hər bir insanı
Mənim dastanımın baş qəhrəmanı.

Birinci səs

– Mirpaşa doğrudan bir yaramazdır,
Elə bir alçağa ölüm də azdır!
Nə qədər komsomol olsaq da, yenə
Gərək sataşmayaq Allah evinə! –
Dedikcə alışıb yanır gözləri,
Qabardıb döşünü verir irəli.

* Dəsmalı





İkinci səs

– Eh... canım, buraxın! Bizə nə var, eh!
Hər kəs tutduğuna özü cavabdeh...
Doğrusu, bunlara qarışmıram mən.
Bir zaman gələr ki, o, qıl körpüdən
Günahkar keçərkən yıxılıb qalar,
Məhşər ayağında bir toxmaq alar...

Üçüncü səs

– Yoldaşlar, məscidə köpək bağlamaq
Bəlkə zarafatdır, oyundur, ancaq.

Dördüncü səs

– Məncə, zarafatdan ayrıdır bu iş...
Mirpaşa doğrudan bir səhv eyləmiş,
Bu qədər üstünə düşmək də olmaz,
Bunun da qeydinə qalalım bir az.
Azacıq danlayıb, tapşırsaq əgər,
Gördüyü işlərdən artıq əl çəkər.

Mirpaşa

– Çox haqq eyləmişəm!.. Hə!.. Sözünüz nə?
Yoxdur etiqadım molla deyənə,
Oğru ki deyiləm. Tutduğum bu iş
Lap bu əllərimin içindən gəlmiş!
– Afərin başına!
                    – Mən ölüm əl çək!
– Əlindən gələni iki qaba çək!
Ay canım, biz hara, minarə hara?
Yenəmi inanaq bu alçaqlara?..
Hələ bir dayanın, dələduzam mən
Mollanı yıxmasam o minarədən! –
Deyib, xoruzlanır yenə Mirpaşa,
İclas az qalır ki, coşub çaxnaşa.
– Bir buna bax, buna!

Bir az sakit ol!
– Allahsız!
– Afərin!
– Qoçaq komsomol!

Bəxtiyar

– Əsrlər boyunca o əzan səsi,
İnsanın insanla mübarizəsi
Sizə əfsanələr kimi gəlməsin,
Göydən tökülməmiş nə Tanrı, nə din.
Bəşər bu yolları keçəydi gərək,
Böyük addımlarla gəlir gələcək...
O məscid, o əzan, ordakı insan,
Onların ən gizli sirrinə dalsan,
Hər biri vaxtında yeni bir xəbər,
Hər biri vaxtında canlı bir əsər...
Bəşər vicdanını bağlamış ona,
İnanmışdır onun haqq olduğuna.
İştə, o zamandan, o gündən bəri
Gəlib dolandıqca ömrün illəri.
Hər könül olmuşdur ibadətxana,
İşləmiş iliyə, qarışmış qana.
Yalan deyirlər ki: "uçmuşdur İsa",
Bu fikri uydurur, məncə, kəlisa.
Yalan deyirlər ki, "Məhəmməd göydən
Yerə nazil olmuş" – düşündükcə mən
Bunlara gülməyim gəlir, doğrusu,
Tarixdə bir qara şayiədir bu!
Onlar da adi bir insan imişlər,
Onlar da vaxtında fikir demişlər.
Onların da canı sümükdür, ətdir,
Bütün şayiələr bir siyasətdir.
Onlar da yaşamış, ölmüş sonradan,
Belədir hər canlı, belədir insan...
Bunların hamısı bütün hiylədir,
Sadə həyat üçün bir vəsilədir.





Bəşər bu yolları keçəydi gərək,
Böyük addımlarla gəlir gələcək...

Fəqət dəyişdikcə həyatın səsi,
İnsanın insanla mübarizəsi
Bunların hamısı kölgədə qalır...
Onun sözlərinə iclas əl çalır.
Salonu doldurur alqış və hörmət.
Fəqət bir çoxunun baxışları sərt,
Süzür Bəxtiyarı. Bəxtiyar yenə
Cumur xəyalının dərinliyinə:
– Məncə, bu üsyanda bəşər haqlıdır,
Bu haqda yeni bir dünya saqlıdır!..
Lakin mübarizə, inqilab, üsyan
A yoldaş Mirpaşa, deyildir asan!
Yaxından anlasan həyatı əgər,
Daşlar atılanda meyvə kal düşər.
İnsanın qəlbində əsrlər boyu
Özünə yer tutub, yurd salan duyğu
Əmrlə insanın çıxmaz canından
Bir də, komsomolçu deyil xuliqan
Ki, onun ağlına nə gəlsə tutsun.
Ar olsun, doğrudan, sana ar olsun!

Mirpaşa çatmışdı iki qaşını,
Sallamışdı yerə yekə başını...
Deyəsən, qaçmışdı rəngindəki qan,
Peşiman kimiydi tutduqlarından...

## İMƏCİLİK

Yerliyi üç metrə dərin qazılmış
Bir daxma, görməmiş nə bahar, nə qış...
Nəmli divarları məzar kimi dar,
Duyan ürəkləri sıxıb ağladar.
Kərəni, pərdisi hörümçək toru,

Deyirlər kasıbın bilinməz goru.
Hisli buxarısı kömürdən qara,
Qaranlıq qapısı küsüb dağlara...
Burda ömr eləyir Qızyetər qarı,
Əvvəlki qüvvədən düşüb qolları.
Çoxdandır kiriyib əyri cəhrəsi,
Atılıb bir yana odun dəhrəsi,
Nə od var, nə ocaq, nə urvalıq un.
Bürüşüb bir küncdə yamaqlı xurcun.
Həsrətli gözlərlə boylanır qarı
Külləri soyumuş ocağa sarı.
Onun gözlərində qalıb son arzu
Qatığa tamarzı, südə tamarzı.
Qadın dünyasında altmış ildir
Kəndi qapı-qapı dolanır gəzir.
Sənəti yağ tutub, nəhrə çalxamaq,
Zərli xanımlara uşaq saxlamaq,
Taleyinin suyu bulanıb başdan...
Qohumdan, qonşudan, yaxın yoldaşdan
Etibar görməyib bu yazıq qarı,
Nökərin canıdır ağanın varı.

* * *

Qızyetərin qəlbini dönə-dönə dağlayan,
İşığını söndürüb qapısını bağlayan
Uğursuz bir xəbərdən, bir qara faciədən
Əziz oxucularım, söhbət, açım sizə mən:
Bütün həyatı boyu onun əkib-biçdiyi,
Yerişinə fəxr edib, boyuna and içdiyi
Həsrət adlı oğlunu apardılar "dabravol"
O gedəndə dalınca tozlandı getdiyi yol...
Aylar, illər dolandı, keçdi o gündən bəri;
Hələ də yollardadır yorğun ana gözləri –
Bir xəbər yoxdur ondan... Görən nə oldu sonu,
Gəzdiyi qarlı dağlar görmədi bir də onu.
"Qızıl gül olmayaydı,
Saralıb solmayaydı,

Bir ayrılıq, bir ölüm,
Heç biri olmayaydı".
Bu bayatı düşməyir anasının dilindən,
Damcı-damcı göz yaşı tökülür məndilindən.
Gözüylə odlar görən bizim sonsuz Qızyetər
"Arsız-arsız dünyada yenə yaşamaq istər".
O kimsəsiz, o yurdsuz, o paltarsız, o acdır,
Fəqət həyat yenə də ölməz bir ehtiyacdır.

* * *

Səhərdir... Darayır saçlarını gün,
Tərləyir Qafqazın qarlı dağları.
Qapının ağzında Qızyetər qarı
Əlləri qoynunda oturub bu gün.
Xəyalı dağınıq, fikri qarışıq,
Zəif gözlərinə düşdükcə işıq
Qamaşır... Kim bilir qəlbində nə var?
Uzaq göyə doğru boylanır naçar.
Uçur nəzərləri boşluğa sarı,
Gəzir buludlarda pərvərdigarı...
Bu dərdi qəlbinə o yaza-yaza
Dəstəmaz alaraq durur namaza,
Bükülmüş belilə əyilib-qalxır,
Bir göyə boylanır, bir yerə baxır.
Lakin o boşluqda yoxdur bir xəbər,
Hava dalğalanıb, küləklər əsər...

Pozur bu ahəngi uzaqdan gələn,
Buluda yüksələn, günə yüksələn
Azad bir dünyanın azad nəğməsi –
Sağlam insanların mübariz səsi:

"Günəşdə bərkimiş əzələlərdən
Bir yeni qüvvətlə sıçradıqca sən
Dağlar da səslənir, daşlar da bəzən.
Hücuma tanklarla keçir komsomol,
Təbiət, təslim ol! Düşmən, təslim ol!

Dalğalan bayrağım, qayna, dalğalan!
İgidlər qanıdır rəngindəki qan!..
Sabahın qoynunda borular çalan
Hücuma tanklarla keçir komsomol,
Təbiət, təslim ol! Düşmən, təslim ol!..

Atın fişəngləri, dağılsın göyə,
Azğın ürəklərə budur "hədiyyə"
Sulardan qan izi kəsilsin deyə
Hücuma tanklarla keçir komsomol,
Təbiət, təslim ol! Düşmən, təslim ol!..

Bu dəstənin başçısı komsomolçu Bəxtiyar
Deyir: – Bu xırça boylu daxmacığa hücum var!
Gərək sovrulsun göyə onun da torpaqları,
Bu köməksiz Qızyetər, günlər görmüş bu qarı
Ağ suvaqlı bir evdə ayağını uzatsın!
Beş-on günlük ömrü var, şirin bir yuxu yatsın,
O da bilsin dünyanın ləzzətini, dadını,
Ona təzə ad qoyaq: Şərqin azad qadını!

O hisli daxmacıq söküldü o gün,
Zəif qüvvətilə əyildi bütün,
Ağacı bir yana, daşı bir yana –
Arxası üstündə baxır insana.
Uçur təpiklərdə qara buxarı,
Ağzını açmayır bir də yuxarı,
Qaralır daxmanın kalafa yeri,
Dəstə şərqisilə çəkilir geri.
Onları seyr edir kənardan Cəlal,
Birinci dəfədir ömründə bu hal
Ki, yoldaşlarından geriyə qalmış,
İçini göynədir boranlı bir qış...
Rəngi bozarmışdır, baxışları sərt,
Soyutmuşdur onu işdən məhəbbət.
Gecəni uyqusuz keçirmiş bütün,
Cəlalın duyğusu ağlından üstün, –

Onun nəzərində kainat boşluq...
Keçir xatirindən hətta sərxoşluq.
Lakin ümidini kəsməyir Cəlal,
Bəlkə güləcəkdir ona istiqbal,
Bəlkə babasından keçəcək Humay,
O sevimli Humay, o göyçək Humay.
O vaxt açılacaq Cəlalın üzü,
Doğacaq ruhuna bahar gündüzü,
Yenə bərkiyəcək varlığı işdə,
Hücumda, cəbhədə, yolda, yürüşdə
Coşub qaynayacaq qəlbinin qanı,
Qaçacaq qorxudan dağın dumanı...
Yazıq... Bu arzular dönsə tərsinə,
O öz hisslərinə qarışıb yenə
Həyatdan, nəşədən kənar qalacaq,
Sadədil olmağın nəsibinə bax!
Düşündükcə, bu dərin,
Bu sarsaq fikirlərin
Cəlal bir əsiridir,
O qəlbini əridir
Şamdandakı mum kimi,
Həyat bir zəqqum kimi
Zəhərləmiş qanını;
Eşqin ərməğanını
Dost əlindən almamış,
Yara qonaq qalmamış...

* * *

Anladıqca səni pozulur halım,
Komsomol Cəlalım, şair Cəlalım...
Söylə, bir nə üçün döyüşlərdə sən
Qızğın dəmir kimi soyudun birdən?...
Gözəldir sevişib murada çatmaq.
Sevgi bu yerlərdə deyildir yasaq;
Fəqət qüvvətinlə cahana bildir:
Yaşamaq sadə bir sevgi deyildir!





İndi də sən dinlə, mənim oxucum!
Cəlalın üstünə açdığım hücum
Bəlkə də gəncliyə bir hörmətimdir,
Duyan ürəklərə məhəbbətimdir.
Nə qədər sevsəm də Cəlalı, əfsus,
O bir qurbanıdır vaxtına məxsus
Adi duyğuların, düşüncələrin...
Hər kiçik zərrədə dərindən dərin
Mənalar gizlənir, Cəlal boş deyil,
Ayıq olmasa da, bir sərxoş deyil;
O, canlı insandır, o insanı mən
Keçirmək istərəm hadisələrdən,
O zaman aydınca görərsən onu,
Bilərsən nə olur Cəlalın sonu.

Bir ayın ərzində tamamlanmış iş,
Daxmanın yerində ağ ev tikilmiş –
Düzülmüş yan-yana pəncərələri,
Qızyetər bu evə köçəndən bəri
Öpür saçlarını günün işığı,
Dəyişib büsbütün yar-yaraşığı;
Elə bil dünyaya yenidən gəlmiş,
Yoxsulluq keçirən heç bu deyilmiş.
Bəylərin dövləti-malı talandı,
Onların yurdunda ocaq qalandı,
Aldı öz payını Qızyetər qarı,
Onunla birlikdə kənd yoxsulları.
İndi gümüldənib*, sızlayıb hərdən,
Şikayət etməyir öz taleyindən
Bir parça çörəyə çatmışdır əli.
Komsomol Bəxtiyar kəndə gələli
Toplayıb başına yoldaşlarını,
Daşıyır çiynində yol daşlarını;
Gündə hər əlsizə bir yuva qurur.
Odur bax, özüdür, o gələn odur.

* Dərdlənib, inildənib

Araba boynunda ot daşıyır, bax...
Səhraya çıxmışdır günəşdən qabaq,
O, mədən yavrusu sizdənəm, deyə
Qaynayıb-qarışıb yoxsul kəndliyə,
Gah kərənti çəkir, gah odun qırır,
Gah da ki, dağlara çıxıb hayqırır
Qaçaqlar dalınca əldə tüfəngi,
Hirsindən bozarıb qızarır rəngi.
Nə qədər qüvvə var, nə qədər maraq,
Bu insan oğlunda hünərə bir bax!
Əlində top kimi oynayır həyat,
Onun dövlətidir bir tüfəng, bir at,
Bir də əynindəki yamaqlı şinel,
Doğma vətənidir hər oba, hər el.
Bəxtiyar arzular öylə bir dünya –
Ağalıq, köləlik olmasın orda.
Güldürür ömrünü bu şanlı əməl,
Sadə bir insandır hər şeydən əvvəl...

* * *

Gecədir... Kənd yuxulu,
Nə işıq var, nə tüstü,
Ətraf bir az qorxulu,
Sakit durur yol üstü;
Nə işıq var, nə tüstü.

Ala-seyrək, arabir,
Gəlir köpək səsləri.
Yaxından eşidilir,
Kür çayının ləngəri,
Bir də köpək səsləri.

Hərdən yağış səpələr –
Gözəldir bu tamaşa,
Yastı-yastı təpələr
Yatışırlar baş-başa,

Gözəldir bu tamaşa.
Bulud qara, göy qara
Bu qaranlıq gecədən
Gözə gəlir göy qara;
Çox keçdim ömrümdə mən
Bu qaranlıq gecədən...
Səhər, obaşdan durub,
Yerində bardaş qurub,
Təsbeh çəkir Qızyetər,
Alnındakı soyuq tər
Bəlkə cana faydadır,
Qocaldıqda qaydadır...
Çıxdığı ağ günlərin
Anlaya bilmir dərin
Mənasını bu qarı;
Baxıb altdan yuxarı
Bu rahat yatmağını,
Ağ günə çatmağını,
Yenə Allahdan görür,
Çəkdiyi ahdan görür...

## QAROVUL

Dumanlar dağların üstündə bir yük,
Dağların bu dərdi özündən böyük.
Havalar qat tutub, gecə darısqal,
Belə bir səhnəni xatirinə sal.
Bu sıx qaranlıqda keşikçilər var,
Körpünün altını kəsib Bəxtiyar.
Qarşısında nəhr, arxasında yol,
Yanında on nəfər igid komsomol,
Qaçaqlar bu kəndə dolmasın deyə,
Bir də qılınc-qırğın olmasın deyə.
Ayaq üstündədir axşamdan bəri,
Süzülür yuxulu, yorğun gözləri.
Çalpapaq Kərəm də gəlib arabir





Onların üstünə özü baş çəkir.
Bu qoca kommunist, bu kənd rəhbəri
Bəxtiyarla tanış olandan bəri
Artır məhəbbəti ona günbəgün,
Onunla başqadır rəftarı bütün.
Bəxtiyar tüfəngə söykənib durur,
Gözlərində həyat, alnında qürur.
Azca xışıldasa ağacda yarpaq
Yerindən quş kimi cəld sıçrayaraq,
Hazırdır... Yanında uzanıb daşa,
Yatıb fısıldayır yenə Mirpaşa.
O yeyib, içib,
                Dünyadan keçib...
İnan ki, növbədə dayanıb naçar...
Bu daş parçasına gülür Bəxtiyar.
Və sonra Mirpaşa səksənsin deyə,
Havayı bir güllə buraxır göyə.
Azca qımıldanır onun bədəni.
Bəxtiyar deyinir: – Öləsən səni!

## KƏNDDƏ TEATR

Bir aydı Gərayın evi alınmış,
Orada başqa bir həyat salınmış.
Leninin əksidir divarda duran,
Tarixdə ən böyük, ən canlı insan.
Könüldən-könülə gəzir əməli,
Onun tribunadan yüksələn əli
Çağırır üsyana əzilənləri,
Günlər baş götürüb axır irəli.

Axşamdan bəridir o əksə sarı
Dayanıb diqqətlə baxır bir qarı.
Hələ gözlərinin var işıqları,
Darısqal alnının qırışıqları
Tarixdə ən qara günlər andırır,

İnsanın fikrini dalğalandırır...
Əynində paltosu, başında şalı,
Onun ruhunda da dəyişmiş halı.
O, artıq keçirir özgə bir həyat:
Bəylərin malından üç inək, bir at
“Yoxsul komitəsi” vermişdir ona.
Ömrünün sonunda Qızyetər qarı
Gülüb şadlığından qol-qanad açır,
Zığlı gözlərindən yorğunluq qaçır...
O, əksə baxdıqca dayanıb durur,
Deyir ki:”dünyada peyğəmbər budur!”
Yoxsa bu bəylərin, qansoranların
Taxtı tarac olsun, görüm, onların...”

Üfüqlər qaraldı, el rahat oldu,
Bizim kənd klubu yenə də doldu.
Taxtadan qurulmuş adi səhnədə
Bu axşam tamaşa vardır yenə də.
Burada bir çoxu düşəcək dərdə...
Zırınq... Zəng vuruldu, açıldı pərdə:
Nökər paltarına girmişdir Cəlal,
Bəyin rolundadır bu gün Bəxtiyar.
Onun qollarında nə ki qüvvə var,
Hey döyür Cəlalı, o isə bihal
Yıxılıb torpağa zarıyır əlan,
Belədir acizlik, belədir insan...
– Sən oğurlamısan!
                    – Vallah yalandır...
Bağışla Tanrıya, öldüm, amandır!..
– Gör necə yalvarır, itin balası!
Elə bil itkidən xəbəri yoxdur!
– Vur, köpək oğlunu,– günahı çoxdur! –
Deyib qızışdırır bəyi kirvəsi,
Muzdurun getdikcə kəsilir səsi...
            Şaraqhaşaraq,
            Yumruq, şapalaq
            Boyamış qana

Ağız, burnunu,
Görənlər bunu
Qorxudan çəkilib uzaqda durur,
Kirvə qızışdırır, bəy yenə vurur,
Vurduqca qamçısı qırılır birdən,
Daha da hirslənib durduğu yerdən
Bir daş parçasını əyilib alır,
O “məhkum insanın” başına salır.

İkinci pərdədə bir özgə hal var:
– Siz xoş gəlmişsiniz, əziz qonaqlar!
Deyərək, Gəray bəy açır məclisi,
Ona cavab verir başqa birisi:
– Gəray bəy!
Deyərək gözlər süzülür
Əllərdə titrəyən qədəhlər gülür.
– Yaşasın parlaman!
– Yaşasın millət!
Açılır ortada bir rəsmi söhbət,
Ayağa qalxaraq ministr Elxan:
– Siz bilirsiniz ki, dəyişir zaman,
Dəyişir hər şeyin əvvəlki halı.
Belə bir zamanda ayıq olmalı!
Hərçəndi məhv oldu iyirmialtılar,
Yenə də Bakıda o izdiham var.
Bu bir axındır ki, baş alıb gedir,
İndi kəndlərə də sirayət edir.
Deyirlər kəndliyə verilsin torpaq,
– Arpa yeyənlərin iştahına bax!
Gəray bəy hirslənib yerindən durur.
Əlini stolun üstünə vurur:
– A kişi, bir dayan! Mən ölüm, bir dur!
Torpağı neyləyir öküzsüz muzdur?
– Öküz də istəyir, qoyun da, at da.
– Yox, bir arvad da!
– Yox, bir məni də...
– Bəli, səni də!..

Hətta deyirlər ki, parlaman gərək
Əlini hər şeydən tamam üzərək,
Versin hökuməti bolşeviklərə,
Yəni mülkədarlıq ölsün bir kərrə...
– Hay-hay!
Qəribədir dünyanın işi!
– Evet, efendiler! Çarxın gerdişi
Qocaman türklüyə gülmüyor çoxdan,
Ümid kesmeyelim atılan oxdan...
Vatan lalezardır, millet pürvüqar,
Onun göyler kadar amelleri var,
Ayrılıq öldürür milleti her an,
Saatlar vurduqca yetişiyor zaman.
Ayrılan quvvalar birleşmelidir!
Vatan bir torpağa yerleşmelidir! –
Deyib Səbri paşa qılınca baxır,
Başından tüstülər, dumanlar qalxır.
Çoxalır həsrəti, çoxalır yası,
Axır xəyalından nöyüt dəryası.
Nöyüt kəmərləri düzəlib yola,
Axıb tökülürlər düz İstanbula...

Sonra, davam edir sözünə Elxan:
Ölçülər götürür indi parlaman,
Ən əvvəl Bakıda bütün qoçular,
Şəhərdə izdiham salanlar ki var,
Onları axtarıb taparaq həmən,
Ayırır başını dərhal bədəndən...
İşçilər mədəndən hey qovulurlar,
Axırda susmağa məcbur olurlar,
Aralıq bir qədər keçmədə sərin...
İndi də türklərin, ermənilərin
Ortasında gərək ziddiyyət salaq!
Kəndin yoxsulları hər kəsdən qabaq
Qoyun silahlanıb girsin meydana!
Əlləri çatmasın özgə bir yana...
Qarışsın cəbhədə onların başı,

Təki böyüklərə, bəylərə qarşı
Bir də baş qaldırıb deyinməsinlər!..
Onlar da qırmızı geyinməsinlər!..
Malades!
Yaşasın belə parlaman! –
Gəray bəy bu sözü dediyi zaman
Əlindən hədəfi düşüb tökülür.
"Niçevo" deyərək balaca gülür.

## Üçüncü pərdə

– Ayağa qalxınız, şeyximiz gəldi!
Deyə Gəray bəyin səsi yüksəldi.
Qalxdılar, baş vurub oturan zaman
"Allahın elçisi" əlində Quran
Gəldi, o məsləki kömürdən qara,
Bir göyə boylandı, bir insanlara:
– Hər kimin qüvvəsi varsa qolunda
Bu gün din yolunda, millət yolunda
Keçsin öz canından, öz var-yoxundan,
Tanıyaq onları, bilək yaxından...
Görək Tanrısına düz çıxan hanı?
Vətənin uğrunda tökülən qanı,
Mələklər öz yaşıl qanadlarında
Qaldıracaq göyə, Tanrı yanına –
Deyib o məsləki kömürdən qara
Bir göyə boylandı, bir insanlara.
Ağarmış saçları dağda qar kimi,
Ürəkdə həsrəti, dərdi var kimi
Sallayıb başını dayanmış İmran,
Bükülmüş qaməti sanki bir kaman.
Qorxub çəkinməyir o cəbhələrdən,
Fəqət gözlərinə görünür hərdən
Evində ac qalan çılpaq yavrusu,
Başından sel kimi daşır qayğusu.
Üşüyür varlığı, az qalır dona

Gedib şeyxə tərəf yalvarır ona:
– Hərçəndi Allahın hökmü səndədir,
Bir bölük külfətin gözü məndədir.
Təkəm, köməksizəm, uşaqlar körpə...
Onların gözündən yaş sərpə-sərpə
Uzaq bir səfərə getmək olarmı?
Qanun deyiləndə mərhəmət varmı?
Gəray bəy qaşını çəkib yuxarı,
Yerindən oynayır İmrana sarı:
– Şübhəsiz, haqlısan tələbində sən,
Söylə, nə etmək ki, dağılır vətən...
Bilirəm, gənclikdən sən qəhrəmansan,
Bir az da millətin halına yansan
Allaha xoş gedər, qaldı, uşaqlar...
Onların mən kimi kəndxudası var,
Əlimdən gələni əsirgəmərəm...
Bu halı seyr edən Çalpapaq Kərəm
Çatıb qaşlarını hirsindən yenə
Gülür bığ altından Gəray deyənə...
Qaranlıq, boğucu bir yaz gecəsi.
Ayın da rəngində sarılıq vardı.
Ətrafı tutmuşdu topların səsi;
Matəmə dönmüşdü gecənin ardı,
Ayın da rəngində sarılıq vardı.

Başqadır bu gecə Gərayın halı –
O öz kefindədir, dəmlidir əlan:
– Demək ki, millətin var istiqbalı, –
Deyib gülümsərkən ministr Elxan,
Yenə də səslənir gümüş bakallar,
Yenə də sərxoşca qəhqəhələr var...
– Gəray bəy, doğrudan əhrimənsiniz
Gələr bir zaman ki, bu hünərlə siz,
Siz də keçərsiniz düz parlamana,
Bu şöhrət yaraşır bir qəhrəmana.
– Sağ olun, möhtərəm və böyük Elxan!
Bəlli ki, hökmünü verəcək zaman,

Əlimdən gələni əsirgəmərəm...
– Nə oldu kommunist Çalpapaq Kərəm?
– O, ələ keçmədi... deyirlər yenə
Kənddən uzaqlaşıb gedib mədənə.
– Cəbhələr necədir?
                    – Eşidirsiniz...
O top səslərinin altında bu gün
Əli tüfəng tutan nə varsa bütün
Ölür də, öldürür, lap qiyamətdir!
Anlayan yoxdur ki, bu, siyasətdir!..
– Afərin, Gəray bəy! İnan ki, sənin
Ruhunda ruhu var doğma vətənin!
Halaldır bu hava, bu su, bu torpaq...
– Elxan, bu sözləri, mən ölüm, burax!
Mənim ki, borcumdur çalışmaq sizə.
– Əvət, sadiqsiniz vəzifənizə.
– Qorxub çəkinməmək ölümdən, qandan
Gözlənir adətən hər qəhrəmandan!

**Dördüncü pərdə**

Haman bu anda,
Eyni zamanda,
Bir qara lampanın işığında tək
Gözündən od kimi yaşlar tökərək:
– Ay Allah, neyləyim? – deyə Gülpəri
Boylanır qapıya... Dönür içəri.
Köhnə mitilləri dağıdıb sökür,
Yorğanın, döşəyin yununu tökür.
Yığıb bir palaza, satacaq onu,
Budur yoxsulluğun, aclığın sonu.

Gözlərində duman, baxışları qan,
Əlində bir qamçı, belində naqan
Gəray bəy ortaya atılır birdən,
Gülpəri diksinir durduğu yerdən,
Səyriyib dodağı, qaçır bənizi.

Alnında min acı, fəlakət izi...
– Ay qız, nə var, nə yox?
                    – Nə olacaq ki!..
Hər şey o qaydada, hər şey qabaqkı,
– Uşaqlar necədir?
                    – İndi yatırlar...
– Sən niyə oyaqsan, gözləmənmi var?
Gülpəri qızarıb başını salır.
Gəray bəy qızışıb birdən əl çalır:
– Hay-hay, gözəllənib, rəngin açılıb,
Elə bil alnına güllər saçılıb.
Özgə nə var, nə yox?
                    – Nə deyim, gündür...
– Ah, o baxışlar ki, öylə süzgündür
Səhər ulduzunu andırır, bilsən!
Şahlara layiqsən bu hüsn ilə sən!
Gülpəri mat qalıb, yerində durur,
Gəray bəy kənarda bığını burur.
– Demək ki, işlərin yaxşı gedir, hay?
Dillənib cavab ver! – İmrənir* Gəray...
Özünü toplayıb, dinir Gülpəri:
– İmran atışmaya gedəndən bəri
Uşaqlar ac qalır...
          – Qoy görək!
                    – Vallah!
– Bir meşok götürüb bizə gəl sabah,
Arpadan, buğdadan nə varsa al gəl!
Aclıq gözəlliyə olmasın əngəl, –
Deyib addımını irəli atır...
Gülpəri utanıb qan-tərə batır.
Sonra sol cibinə salır əlini
Gözaltı bir daha süzüb gəlini:
– Al bu pulları da, xərclik edərsən.
– İmran acıqlanar...
                    – Uşaqsan ki, sən...

* Meyl edir.

Kimdir açıb deyən İmrana bunu.
Gülpəri:
– Gəray bəy, ac qalsam illər uzunu
Mən onu aldadıb, yalan satmaram,
Mən öz namusumu yerə atmaram.
– O, sağ gəlməyəcək...
          – Necə?
                    – Öləcək!
Vaxt ikən gəl unut, sən ondan əl çək!
– Gəray bəy, gecədir... zəhmət çəkin siz...
Allaha bəd gedər, naməhrəmsiniz...
–At görək, mən ölüm, bu oyunları,
Neyləyirsən açıb, töküb bunları,
Bəri gəl, ay zalım, bir qucaqlaşaq,
Unut bu tərsliyi, gəl Allaha bax!
Bu dünya beş gündür, beşi də qara,
Pərişan zülfünü sübhdən dara;
Çıx sinəm üstünə günəşdən əzəl,
Havada quşları dindirən gözəl! –
Deyib, Gülpəridən yapışır bərk-bərk,
Onun gözlərindən zorla öpərək:
– Necəsən? –
                    Deyərək çəkilib durur,
Eşib bığlarını yenidən burur.
Gülpəri daş kimi yerində donur,
Ala gözlərindən üsyan oxunur:
– Binamus...
          – Nə dedin?
                    – Gözümdən itil!
Nələr gördüyünü bir düşün də, bil!
Yoxsa...
          – Nə olacaq?
                    – Canına azar!
Hankı təriqətdə bu vəhşilik var?
– Sus köpəyin qızı, doğraram səni!
– Öz arvadına söy, qorxutma məni!
Gəray bəy bozarıb, bir də soxulur,

  

Ortada gizli bir əhvalat olur...
Gülpəri ah çəkir, yalvarır, söyür,
Qonşular yığılıb qapını döyür.
– İçəri gəlməyin –
çığırır Gəray.
Gülpəri qışqırır: – Öldüm, ay haray!..
Göy Vəli dayana bilməyib birdən,
Dağ kimi tərpənir durduğu yerdən,
Dabandan qapını oynadıb qırır.
Gəray bəy yenidən bir də hayqırır:
– Gəlməyin deyirəm!
Göy Vəli gəlir,
Siyirib xəncəri birdən yönəlir;
– Binamus oğlunun tutduğuna bax!
Gəray bəy, od kimi yerdən qalxaraq:
– Nə var? Sən nəçisən? İtil buradan!
Əlini naqana atdığı zaman,
Göy Vəli mıx kimi yerində qalır,
Titrəyib, xəncəri əlindən salır.
Gəray bəy aradan çıxdığı zaman
Gülpəri cəhrəni götürüb daldan
Çırpır, yapışdırır lap təpəsindən,
İgid bir qadının aslan səsindən
O xain başını tutub, çaparaq
Qaçır mənzilinə taraqhataraq...
Qaraldı get-gedə gecənin üzü;
Buludlar sıxlanıb bir ordu kimi.
Sakit bir yuxuda çöllərin düzü...
Çırpınıb döyünür gecənin qəlbi,
Buludlar sıxlanıb bir ordu kimi.

Arabir göylərin dərinliyindən
Gecikmiş durnanın səsi gəlirdi.
O yaz gecəsinin sərinliyindən
İnsanın xəyalı hey yüksəlirdi,
Gecikmiş durnanın səsi gəlirdi.

Yalnız o durmuşdu gözlərində yaş
Uçuq bir daxmanın astanasında,
Yaralı gövdənin üstündəki baş
Ağlayıb, sızlayır hicran yasında,
Uçuq bir daxmanın astanasında.

– Doğrudur, mən ona təslim olmadım,
Fəqət ləkələndi yenə də adım.
Ah, o gələcəkmi?... İmran, ay İmran!
Mən sənin eşqinlə yaşardım, inan!
Gəl də öz yarını bu halda tanı,
Sənin fəxr etdiyin o adım hanı?
Dedikcə qəlbinə qaranlıq çökür,
Gözündən od kimi o yaşlar tökür.

## GÖZƏLLİK VƏ MƏHƏBBƏT

Uzaq buludlarda gəzinirdi Ay,
Doqqazın ağzında Cəlal və Humay –
Birisi söz atır, digəri gülür,
Könüllər döyünür, gözlər süzülür.

– Humay, bu dünyada ən çox sevdiyim,
Bəlkə də ən böyük Tanrı bildiyim
Bir qüvvə varsa da, o sənsən, inan!
Xəyalın gözümdən ayrılsa bir an,
Mənliyim, şərəfim məhv olub gedər,
Amansız ayrılıq məni qəhr edər.
Doğrudur, döyüşdə atanla bəzən
Qoç kimi üz-üzə çarpışmışam mən.
Gəl üzə vurma heç o zamanları;
Tarix yaradırkən qəhrəmanları,
Cəbhələr ayrılır, bil ki, əvvəldən,
Xatalar baş verir hər vuran əldən...

– Nə deyim, bəlkə də haqlısan, Cəlal,
Əlindən gəlirsə, elçi göndər, al...

– Yox, bu olmayacaq, tezlikdə baban
Bu işdən bir xəbər tutarsa, inan,
Başqa bir insana verəcək səni.
Çox zaman almayır sevən sevəni...
– Bəs onda neyləmək?
– Qoşulub qaçmaq!
Başqa bir iqlimə doğru yol açmaq!
– Yox, Cəlal, olmadı. Şahiddir hamı,
Görürkən yuxuda qaçaq babamı
Hönkürüb ağlaram əlimdə yaylıq...
Nəinki ömürlük, hətta bir aylıq,
Bəlkə də bir günlük səfərə getmək,
Eşq üçün babamı atıb, tərk etmək
Ölümdən yamandır el-gün içində...
Sən onu axtar,
Hər nə sözün var
Özüylə danış,
Nə yad, nə tanış
Gülməsin ona...
– Qurbanı olduğum, yaşılbaş sona,
Sənin hər əmrinə boyun əyməmək
Əlimdən gələrsə, ey nazlı mələk,
Qoy günə axmayım, baxtım qaralsın,
Bütün səadətim heçliyə varsın!
Qaralar geyinsin eşqimin sonu,
Arayıb, axtarıb taparam onu.
Ölümdən qorxmağın nə mənası var?
Ya məni öldürər, ya da yaşadar.
– Yox, babam çox sevir, bil, xatirimi,
Bilmərrə andırsan ona sevgimi
O səni əfv edər, bağışlar, bilsən,
Babamı bir belə qatil bilmə sən...
Dedikcə Humayın gözləri gülür,
Cəlalın ayağı yerdən üzülür
Toyda nağıl deyən bir aşıq kimi;
Sonra sevgililər sarmaşıq kimi
Birdən qucaqlaşır...
Ay uzaqlaşır.

Qaranlıq onlara xoşdur işıqdan...
Mən bu gözəllikdən, bu yaraşıqdan
Bir zaman vardı ki, ilham alardım,
Havada quş kimi qanad çalardım.
Fəqət, sevgilimin düşüncəsi dar.
Qəlbimi top kimi atıb oynadar,
Sonra divardakı daşa vurardı,
Ömrümün nə yazıq günləri vardı...

## DOSTLAR

Cəlal vidalaşıb yola düzəldi,
Xəyalı dağınıq mənzilə gəldi.
Gecədən keçmişdi, üfüqlər qara,
Sanasan kainat çəkilir dara.
Çıxardıb şineli divardan asır.
Humayın əksini bağrına basır.
Sonra çarpayının üstə yıxılır,
Ağır düşüncədən qəlbi sıxılır.
Yenə də qalxaraq yatdığı yerdən
Gəzinir...
Döyülür qapısı birdən.
O kimdir?
– Bəxtiyar.
– Gəl görək, əşi!
Sənsiz taleyimin gülməz günəşi.
– Qoy görək, ay Cəlal, dolama bizi,
Bu vaxtsız gecədə gəlməyimizi...
Deyib gülüşdülər o əski dostlar.
Sonra Bəxtiyar
Cəlalda rəng verən halı duyaraq:
– Aşna, bəri bax!
Nə var? Qaşqabağın tökülmüş yenə,
Aç söylə dərdini, nə olmuş sənə?
– Qoy qalsın hələlik, sonra bilərsən.
– Yox aşna, nə qədər gizlətsən də sən

Özüm xəbərdaram...
Cəlal qızardı.
Onun gözlərində iztirab vardı.
– Kim çağırdı səni bu əyri yola,
Məhəbbət yararmı bir komsomola?
Mən də sənin kimi bir gəncəm həmən,
Ömrümü cəbhədə keçirməklə mən
Nə sevda bilirəm, nə də ki, hicran;
Nələr tutduğunu bir düşün də, qan!
– Nə var ki, mən daşam, yoxsa torpağam?
Yaşamaq istərəm nə qədər sağam;
Odur ki, sevgi də, hicran da xoşdur!
Məncə məhəbbətsiz bir həyat boşdur...
– Yox, Cəlal, bu qədər hissə qapılmaq
Gəncliyin keçici hissidir, ancaq.
Bir də ki, sən düşün, sevdiyin kimdir?..
– Ruhumda inləyən bir sarı simdir...
– Lap şeirə bənzədi bu son sözlərin,
İşləyir şüurun, görür gözlərin,
Yenə də sən qızı yaxından tanı...
Bu günün eşqində etibar hanı?
– O mənə and içdi.
– İnanma, Cəlal!
O son vuruşmanı xatirinə sal.
Səndin Gəray bəyi pusquda vuran,
Əsrlər dolaşıb, keçsə də zaman
O səndən intiqam almamış durmaz!
Ağlını gəl topla başına bir az!
Ayrıdır məsləki, ayrıdır dini,
Verməz Allaha da öz bildiyini...
Bu sözdən Cəlalın rəngi bozardı,
Xəyalı bir dərin heçliyə vardı.
O indi daş kimi yerində donmuş,
İçində çırpınır yaralı bir quş.
Şübhələr üşüdür onun canını,
Gizləmək istərkən həyəcanını,
Yenə də Bəxtiyar tez duyub onu,





Dəyişir söhbətin bir az tonunu:
– Cəlal, düşünmə, yetər!
Bil ki, qayğıdan betər
Azar yoxdur dünyada;
Gəncliyini sal yada.
Tutduqlarından ərin*,
Sənin şanlı günlərin,
Zamanların gələcək,
Bizimkidir gələcək...
Sev, məftun olma, qardaş,
Məhəbbət dediyin daş
Nəyə düşsə sındırar,
Onun ağırlığı var...
Bir də ki, sən – komsomol,
Anla ki, tutduğun yol
Şərəflidir cahanda,
Bu qarışıq zamanda
Humay düşmən qızıdır,
Altun əxlaqsızıdır.
O sənin dar günündə,
Gözlərinin önündə
Qızlığını satacaq...
Unut onu, sözə bax!
Cəlal bu sözlərdən ayılan kimi,
Yerində qıvrıldı bir ilan kimi...
– Yox, Bəxtiyar, sən,
Çox səhv edirsən!
                O təzə çiçək
                Nə olsa gərək
Mənim olmalı!
O, ata malı
                Nə şöhrət duymaz;
                Olsa da bir az
Qəlbində kini
Qəlbindəkini

* Əl çək, utan!

Mənim qüvvətim
Və məhəbbətim
Tezcə parçalar,
Nə mənası var...
Bəxtiyar əlini atıb divara
O axşam qızışıb dəm verdi tara.
Simləri gəzdikcə ağ barmaqları,
Humay qonşuluqda aşıb hasarı
Dinlədikcə tarın həzin səsini,
Çalırdı qəlbinin kəmənçəsini...
Uzandı dostların şadyanalığı,
Bürüdü söhbətlə saz ortalığı.
Cəlal pəncərədən baxıb arabir
Bayatı qaldırıb, şikəstə deyir.
Onun gözlərində mənası qat-qat
Kitablar kimidir ölüm və həyat.
O, sevmək, sevilmək, yaşamaq deyə
Gah yerdə sürünür, gah uçur göyə...
Dolaşır fikrində keçidli dağlar,
Cəlalın qəlbində döyüntülər var:
“Ah, o doğrudanmı sevəcək məni?...
Yox canım, oynatmaz sevən sevəni,
Nə qədər olsa da qadındır...
Aman!
Humayda əyrilik duyduğum zaman
Bu ucsuz-bucaqsız tükənməz çöllər,
Gəzib görmədiyim ən uzaq ellər,
Məskənim olacaq,
sonra da quşlar
Başımda toplaşıb yuva salacaq.
Əzəldən sevginin taleyinə bax!”

Yoldaş oxucular, xəyal ediniz,
Cəlal düşündükcə bu qədər aciz,
İçini bir qüvvət dağıdıb sökür,
Renginə bir narın sarılıq çökür,
O indi dustaqdır hissin əlində,

Asılmış sevginin bu cəngəlində...
“Xayır!” Məcnunların dövrü yaşandı,
Bugünkü sevginin başqadır andı” –
Deyərək, özünü toxtadır Cəlal,
Uçur gözlərindən qanadlı bir hal:
“Qoy cəhənnəm olsun!..
                    Yox, yaxşı qızdır!
Qızların gözəli etibarsızdır.
Eh, bu fəlsəfələr bir yanda dursun,
Gör nələr deyirəm...
                    Dilim qurusun!
Mənim ki, sevgilim
                    Humaydır, Humay!
Qəlbinin saflığı – on dörd günlük ay.
O mənsiz keçinib, mənsiz yaşarmı?
Heç onun adına bu yaraşarmı?”
Dedikcə Cəlalın gözləri yanır.
Fəqət, qarşısında gəlib dayanır
Qaçaq Gəray bəyin qorxunc xəyalı.
Yenə də Cəlalın dəyişir halı:
– Ah, bu quduz köpək ölüb getmədi,
Top-tüfəng səsləri yenə bitmədi...
Bu qanlı qovğalar, bu vuruşmalar,
Hücumlar, üsyanlar, sərt toqquşmalar
Ayırır insanı öz ürəyindən...
Ayağa qalxaraq, durduğu yerdən:
– Cəlal, mən gedirəm! – deyir Bəxtiyar.
Əl verib ayrılır o əziz dostlar.

## HUMAY YENƏ DÜŞÜNÜR

Humay buxarının qabağında tək,
Dikilmiş gözləri ocağa sarı.
Dağların ayazlı, quru ruzgarı
Vaxtsız qonaq kimi birdən əsərək.
Döyürdü qapını.
                    Humay qəmlidir.





Yorğun nəzərləri azca nəmlidir...
“Nahaq qız yarandım mən bu dünyada,
Dikib gözlərimi bu təmiz ada...
Nə məclis görürəm, nə toy, nə də yas,
Ayaqlar altına düşən bir palaz...”
“Nə deyim, haqlısan bəlkə də, Cəlal,
Əlindən gəlirsə, elçi göndər al” –
Sözləri
                Humayın yadına düşür,
Sınıb qol-qanadı yanına düşür...
“Gör nələr demişəm, gözlərdən iraq!
Bir mənim ağlımın kəmliyinə bax!
Nə qədər olsa da, o, yad oğludur,
Nədən bilirəm ki, fikri doğrudur?
Bəlkə də aldadır Cəlal könlümü?
Mənim də dünyadan nəsibim bumu?
Ah, onu gördükcə at belində mən
Ağacda yarpaq tək əsirəm bəzən
Sözünü qaytarsam zorla aparar,
Yalan çıxmağımın qorxusu da var...
Babam da bir yandan belimi qırır,
Çəkilib dağlara, coşub hayqırır.
Onun çörəyilə boy-başa çatmaq,
Sonra yad oğluna qoşulub qaçmaq
İlana döndərər yenə babamı,
Onun xəsyətinə şahiddir hamı.
Fəqət neyləyim ki, sevdim Cəlalı,
Nə şöhrət, nə mənsəb, nə dünya malı
Görünməz gözümə...”
                Humay dərindən
Bir nəfəs alaraq, fikirlərindən
Başını qurtarmaq istəyir bir az...
Şairim, indi də təbiəti yaz!
Bayaq pəncərədə səslənən külək
Xəstə uşaq kimi hey öskürərək,
Nəfəsdən kəsildi, lal oldu artıq,
Ulduzlar sayrışır, buludlar açıq,

Göylərin aynası ləkəsiz durur,
Xilqətin ən dərin mənası budur.
Humay pəncərədən baxır dışarı,
Ağarır süd kimi dağların qarı...

**İLK GÖRÜŞ**

Bəxtiyar, məni də komsomola yaz! –
Deyib sükut edir alagöz Gülzar.
Qızı dinlədikcə bizim Bəxtiyar
Titrəyir qəlbində sədəfli bir saz...

Başını köksünə dayamış Gülzar,
Mənalı gözləri göl kimi laldır.
O məsum baxışlar bəlkə xəyaldır...
Gözlə görünməyən bir aləmi var.

Qəhrəman Bəxtiyar nədənsə donmuş,
Eşqin şərbətini dadmışdı o da.
Tutulmuş varlığı yanar bir oda,
Qəlbinin başında çırpınır bir quş...

Məhəbbət böyükdür əzəldən bəri,
Həyat aşiqidir eşqi bilənlər.
Anar həsrət ilə keçən günləri
Sevib yaşayanlar, sevib ölənlər.

Məhəbbət dediyin təbiətdədir,
Təbiət özü də məhəbbətdədir.

Ey könül beşiyi – böyük məhəbbət!
Sənin də qədrini bilməyənlər var.
Varlığa daş kimi, kəsək kimi sərt.
Bir insan eşqilə gülməyənlər var.

Nə çoxdur gördüyüm qoca dünyada
Söz verib, söz alıb, söz unudanlar;

Görəsən vicdanı salırmı yada
Eşqin mənasını ucuz tutanlar?!

Varmı sevməyənin bir istiqbalı,
Həyat da sərsəmin üstünə gülər.
Gün keçər, ağarar saçı-saqqalı,
Çöldə qurd-quş kimi yuvasız ölər.

Böyük yaranmışdır əzəldən insan,
Məhəbbət adlanır şirin neməti.
Eşqin meyvəsidir hər yeni dastan,
Duyanlar yaradır şeri, sənəti.

Canan sığal vurub çıxır otaqdan,
Nə gözəl yaraşır bu gediş ona.
Könül arxasınca uçur budaqdan,
Yollar da fəxr edir yarandığına.

Gəl, gəl kəklik kimi qıqqıldaşaraq,
Dəysin bir-birinə qaymaq dodaqlar.
Getmə gözdən uzaq, könüldən iraq,
Sənin də qəribə qəmzələrin var...

Yaxşı, özün söylə, bunda nə varmış,
Ömürlük bir eşqin yolçusuyuq biz.
Müqəddəs qoynunda çiçək açır qış...
Ayrılmaz birləşən dost əllərimiz,
Ömürlük bir eşqin yolçusuyuq biz...

* * *

Bir yaz sabahıdır, gəl çıxaq yola
Ceyran sürüsüylə düzə qaçanda.
Nə xoşdur tutuşub gəzsək qol-qola
Reyhanlar ətrini yola saçanda.
Unutma, sevgilim, indi bahardır,
Baharla gəncliyin bir qəlbi vardır.





Odur, kölgəsi var iydəliklərin,
Ərinmə, sevgilim, dur gedək vaxtdır.
Açaq sinəmizi biz sərin-sərin,
Yarpaqlar dil açıb danışacaqdır.

Ah, mən aşiqiyəm gözəl baharın,
Baharda çağırır çiçək çiçəyi.
Çəmən döşəyidir sevdalı yarın,
Ona layla deyir səhər küləyi.

Bahardır beşiyi şerin, sənətin,
Gözüm hər bulaqdan su içməmişdir.
Sənət söylədiyi ilk məhəbbətin
Üstündən hələ də qış keçməmişdir.

Eşqsiz yaşayan donuq bir insan
İçini qurd yemiş boş bir ağacdır.
Əsrlər dolanır, dəyişir zaman,
Məhəbbət əbədi bir ehtiyacdır.

Qafil! Dolanma gəl eşqdən kənar,
Ən böyük musiqi canan səsidir.
Eşqin şirin-şirin şərbətləri var.
Ömür məhəbbətin ilk meyvəsidir.

Eşqin rüşeymi var canlı varlıqda,
Ondan mayalanır çocuğun qanı.
Məhəbbət olmayan bir məzarlıqda
Qurd kimi parçalar insan insanı.

Misalmı göstərim, Hitleri düşün,
Onda nə məhəbbət, nə vicdan vardır.
Gözəl duyğulardan uzaq o düşkün
İnsan paltarında bir canavardır.

O, sevə bilsəydi öz övladını,
Körpə balaları yetim qoymazdı.
Bilsəydi həyatın şirin dadını,
Həyat deyənləri diri soymazdı.

Qulaq as, sevgilim, qulaq as, bu dəm
Açıldı fikrimdə bir yeni aləm:
Asılmış Leninin əksi divardan,
Baxır gözlərimə böyük bir insan.
Günəş də qızınır bu ilk baharda,
Gör nələr duyuram o baxışlarda:
Onun gözlərində gülür min bahar,
Murada çatmışdır bütün arzular,
Onun dühasilə yaşayır Vətən.
Min illik gələcək bir məsafədən
Böyük bir aləmə çağırır bizi...
Leninə bənzədək iradəmizi!
Gör bizim dünyamız nə bəxtiyardır!
Leninə bənzəsin hər duyan ürək.
Onun gözlərində bir çeşmə vardır,
İnsanlıq eşqini biz ondan içək.

Dünən bir duyğusuz soruşdu məndən:
“ – Nə çox məhəbbətdən dəm vurursan sən?
Hər şey ki, dünyada dəyişir, dönür,
Məhəbbət, sədaqət gülünc görünür...”
Dedim ki, vəz etmə fəlsəfələrdən,
Alim paltarında gülməlisən sən!
Yaxşı bilirəm ki, təbiət dönür,
Varlıq hər baxışda yeni görünür.
Lakin təbiətin öz qanunu var,
Meyvəni vaxtında tökür ağaclar.
Aldada bilməmiş dünyanın varı
Bir məslək eşqilə yaşayanları.
Gətir xatirinə Babəki bir dəm,
Yarandı dağların dərdinə həmdəm,
O, ellər eşqilə gündə boy atdı,
Ellər zümzüməylə onu oyatdı.
Qılınclar, nizələr keçdi döşündən,
Cəllada can verən dilində Vətən.
Lakin unutmadı Babəki dağlar,
Tarix sevənləri gözündə saxlar.





Getsə bir qapıdan eşqin ayağı,
Saralar bağçası, tökülər bağı,
Qafil! Bu sualın kimə gərəkdir? –
Get ürəkdən soruş, sevən ürəkdir.

Gətir xatirinə "Leyli-Məcnunu",
O dastan qalacaq tarix uzunu.
Ağladı Leylinin gözündə göllər,
Açdı qucağını Məcnuna çöllər.
Bəllidir Şirinin çal-çarpaz dağı,
Fərhad məhəbbətlə uçurdu dağı.
Məhəbbət hər zaman ötən bir quşdur,
Demə bu dastanlar uydurulmuşdur.
Nə olursa olsun... Bunlarda qan var.
Yaşayan, çırpınan, sevən insan var.
Getsə bir qapıdan eşqin ayağı
Saralar bağçası, tökülər barı.
Budur bax, az qalmış yenə səhərə,
Düzürəm sözləri mən sətirlərə.
Qızarır dan yeri ürəyim kimi,
Qəlbimlə bir vurur səhərin qəlbi.
Yanır yaqut kimi sakit üfüqlər,
Açır qucağını sevdalı səhər.
Mənə ilham verən bu saf təbiət
Deyir: bu dünyada qalacaq sənət,
Utansın, söyləyir sevdalı səhər,
Şeir dünyasında işsiz gəzənlər!..
Sökülür dan yeri, göy xumar-xumar,
Sənətin eşqilə gülsə sənətkar
Tükənməz ilhamı, tükənməz sözü,
Məhəbbət yaranmış sənətin gözü.
Getsə bir qapıdan eşqin ayağı,
Saralar bağçası, tökülər bağı.
Qulaq as, başlanır bir yeni dastan,
Mənimlə yanaşı bizim otaqdan
Gəlir qulağıma qızımın səsi,
Başlanır səhərin uşaq nəğməsi.





Günəşin eşqilə oyanmış pəri
Baxır, xumar-xumar körpə gözləri.
Məsum uşaqlığın öz aləmi var:
Oynayır xırdaca əllər, ayaqlar.
Zərif dodaqları güldən qırmızı,
Bu azad aləmin qayğısız qızı.
Baxır pəncərədən günəşə sarı,
Nəsə pıçıldayır gül dodaqları...
Onun xəyalında dünya bir rəngdir,
Elə bil hər şeydən süd əməcəkdir.
Odur bax, gözləri birdən süzülür,
Gizli bir aləmlə oynayır, gülür.
Kəşf edə bilməmiş alimlər bunu,
İnsan varlığının ilk duyğusunu.
Lakin gözləri var mədəniyyətin,
Şüur açarıdır bütün xilqətin;
Açacaq dünyanı o, varaq-varaq.
İnsan yeni-yeni ilham alacaq.
O vaxt bilinəcək ulduzun sayı,
Seyrə gələcəyik günəşi, ayı,
Qardaş olacaqdır min bahar, min qış,
Gələcək aləmə indidən alqış!
Bəlkə də o mənim qızım olacaq,
Eləysə şairin taleyinə bax!
Bu qız, vicdanımın doğma səsidir,
Bu mənim eşqimin ilk meyvəsidir.
Getsə bir qapıdan eşqin ayağı,
Saralar bağçası, tökülər bağı.

Məhəbbət böyükdür əzəldən bəri,
Həyat aşiqidir eşqi bilənlər,
Anar həsrət ilə keçən günləri
Sevib yaşayanlar, sevib ölənlər.

Vaqif! Yenə də sən yadıma düşdün,
Titrədi qəlbimin incə telləri.
Sənin salamını çatdırır hər gün
Bəxtiyar yurdumun səhər yelləri.

Böyük bir eşq ilə yaşadın sən də,
Şerin sığal vurdu al yanaqlara;
Gəlinlər kişilik duyduqca səndə,
Bir istilik keçdi gül dodaqlara.

Ümid bağlamadın göydə mələyə...
Dedin ki, yer qızı ondan gözəldir.
Dedin ki, hurilər çatmaz köməyə,
Meyvəsiz xəyallar ömrü gödəldir.

Bilirəm, doğrudan ər oğlu ərsən,
Ömür keçirmədin nisyə dalınca...
Əlindən şikarı buraxmadın sən
Ölüm kölgəsini yerə salınca;

Elin kəlağaylı gözəl gəlini
Sındırıb süzəndə əlində dəsmal,
Uzatdın ona sən şair əlini,
Dedin: – loğmanı da bir yadına sal!

Dalınca söyləndi bir şair dünən:
“Vaqif zövq alırmış qız buxağından”.
Sən də öz vaxtında bu şairlərdən
Bir bölük qovmusan öz otağından.

Yaşamaz eşqsiz, ruhsuz sənətkar,
Onun varlığı da quru sümükdür;
Onun nə kölgəsi, nə meyvəsi var,
Həyatın boynunda bir artıq yükdür...

– Bəxtiyar, məni də komsomola yaz! –
Deyib sükut edir alagöz Gülzar.
Qızı dinlədikcə bizim Bəxtiyar
Titrəyir qəlbində sədəfli bir saz.

Yoxdur gözəllikdə Gülzara əvəz,
Almış ilk baxışla o, Bəxtiyarı.

Sevgisiz, ilhamsız yaşaya bilməz
Sevən bir şairin qəhrəmanları.
Getsə bir qapıdan eşqin ayağı
Saralar bağçası, tökülər bağı.

## NOVRUZ BAYRAMINDA

Şaxta qılıncını qoymuşdur qına,
Yazın qüdrətinə təslim olur qış.
Yer tumar versə də öz sağrısına
Ağaclar dirçəlib çiçək açmamış.
Qara yel gah əsir, gah da dayanır,
Hələ də evlərdə buxarı yanır.

Yağışlar çoxalır, göllənir sular,
Qamış da göyərir canı var kimi.
Dağların döşündə qar zolaq-zolaq
Ağarır gecələr çadırlar kimi.

Göydə ağ buludlar, qara buludlar
Cıdırda qızışan köhlənlər kimi
Gah qaralar keçir, gah da ağ atlar.
Bəzən də döş-döşə gəldikcə onlar
Kişnəşib aləmə qışqırıq salır,
Elə bil döyüşdür... düşmən atlılar
Üz-üzə gəldikcə göy təbil çalır.

Hələ toxtamamış beyni qan bahar
Kamala dolmamış bir cavan kimi:
O tez acıqlanır, tez də yumşalır,
Ürəyi tutmayır bir yerdə qərar,
Hələ toxtamamış beyni qan bahar...

Gah qara geyinir əyninə göylər
Oğluna yas tutan bir ana kimi;
Gözünü yummayır, onun dərdi var,
Ağlayır lap günəş doğana kimi.

Gah yalquzaq kimi ulayır külək,
Gah da quzu kimi yatır, dincəlir;
Göydən nə səs gəlir, nə səmir gəlir,
Birdən buludlarda oynaşan şimşək –
Şaqqıyan ildırım göyə səs salır,
Elə bil davadır, göy təbil çalır...

Gah da parçalanır buludlar lay-lay,
Ulduzlar göz qırpır gülümsəyərək,
Baxır göy üzündən yer üzünə ay,
Yayır şəfəqini bəxt ulduzu tək.

Gah günəş qızarır tonqal sayağı,
Qayalar tərləyir, buğlanır torpaq;
Gah da uşaqların əli, ayağı
Soyuqdan qızarır əsdikcə sazaq.

Axır çərşənbədir... İl tamam olur...
Bu il, – kənd içində danışır hamı, –
At üstə gəlmişdir Novruz bayramı –
Qulunlu at üstə...
Bu bir muraddır...

Qocalar deyir ki, bolluq keçəcək,
Torpaq su yerinə şərbət içəcək.
Odur ki, hamının ürəyi şaddır,
Hamının arzusu, ümidi gülür,
Üzündən, gözündən nurlar tökülür.

Baxın, hər qapıda bir tonqal yanır,
Uşaqlar hoppanır od-alov üstdən;
Göyə şölə düşür, yer işıqlanır,
Od da yandırmayır heç kəsi qəsdən.

Od da mehribandır bu gün insana,
Elə bil odun da ürəyi vardır.
Elə bil onun da qəlbində yanan
Müqəddəs əməllər, xoş arzulardır.

Bu gün nə şaxsey var, nə də ki, vaxsey –
Nə zəncir vuran var, nə də baş yaran;
Ötür hər ürəkdə sevdalı bir ney,
Baharın eşqilə xoşbəxtdir insan...

Kosanın başında bir keçə papaq,
Zınqırov da asıb lap kəlləsindən.
Onun çıxardığı oyunlara bax,
Nə üzdən tanınır, nə də səsindən.
Gah olur mələyir qoyun sayağı,
Gah da bir at olub kişnəyir kosa.
Yüz qapıya dəyir onun ayağı,
Yüz evdən pay alır o heç olmasa.

O, xəsis görəndə "əzrail olur",
Bacadan sallanıb "qılınc" da çəkir,
Elə ki, torbası şirnilə dolur,
Kosa əllərini bığına çəkir...

O göyçək qızların qolundan bəzən
Ağrılı-ağrısız çimdik də alır.
Heç kəs tanımayır, seçməyir onu,
Hər kimin qolundan çimdikləyirsə,
Yalnız o qız bilir kim olduğunu.

O vaxt evdəkilər gülüşür bir az,
Kosanın kefinə toxunmaq olmaz!..
Qızsa üzəvari qaşqabaq tökür,
Hələ ağlayır da o hönkür-hönkür.
Ancaq ürəyində deyir ki, kosa
Bircə də gəlsəydi ev basa-basa...

Bəzənib-düzənib gəlinlər, qızlar
Xına da qoyurlar öz əllərinə.
Gecələr göz qırpır göydə ulduzlar
Bizim kənd yerinin gözəllərinə.

Təzə paltar geyən körpələr şaddır,
Baxıb ləzzət alır ata-analar.
De, bu gün hamımı qəmdən azaddır?
Yox, bu əziz gündə dərdlilər də var.

Axşamdan keçmişdir... Humay evdə tək,
İki sancaq salıb bir nimçə suya...
Qızın sinəsində gah gülür ürək,
Gah bütün varlığı düşür qorxuya.
Pambıqlı sancaqlar elə bil quşdur,
Qovur bir-birini suyun üzündə.
Bu bayram axşamı, bu əziz gündə
Humay ürəyində nəyi tutmuşdur?

Sancaqlar üz-üzə gəldiyi zaman
Elə bil qovuşur Günəş ilə Ay.
Bu vaxt qanad açıb xoşbaxtlığından
Yerlərə, göylərə sığmayır Humay...

Rəngi gülə dönür, taleyi gülür,
Şəfəqi sayrışan bir səhər kimi;
Üzündən, gözündən məna tökülür
Bizim yazdığımız sətirlər kimi.

Yazıq ki, murada çatmazdan əvvəl
Sancağın birisi qərq olur suya.
Elə bil bu anda uğursuz bir əl
Humay götürüb atır quyuya...

Ürəyi döyünür, gözü qaralır,
Get-gedə təngiyir qızın nəfəsi;
Başının üstündə duman qaralır,
Qışqırmaq istəyir, boğulur səsi.

Cəlalın başında xəta var, deyə
Sinəsi tövşümüş qapıya çıxır.
Əlini qaldırıb yalvarır göyə,
Qəlbini yerlər də, göylər də sıxır.

Xəyalat başını bir an tərk edir,
Xeyirxah bir xəbər eşitmək üçün,
Qonşu qapısını pusmağa gedir,
(Qayda belədir ki, birinci kərə
Xeyir söz eşitsə şad olacaqdır;
Yaman söz eşitsə yenə qəmlərə
Qərq olub, içində qovrulacaqdır.)

Dinləyir... Bu evdən bir səs gəlməyir,
Elə bil bağlayıb qapını tay-tay.
Heç kəs danışmayır, deyib gülməyir...
Başqa bir qapıya yüyürür Humay.

Yenə də dinləyir... Qızın ürəyi
Qorxudan titrəyir bir yarpaq kimi.
Titrədir Humayı bir qış küləyi
Yerindən götürüb atacaq kimi.

Birdən yaman xəbər?
                    Birdən şad xəbər?
Rəngi gah bulanır, gah da durulur.
Humayın başında bu düşüncələr,
Qəlbində gah matəm, gah toy qurulur.

De, qız nə eşitsə yaxşıdır birdən?
Kimsə öz oğluna: "Toyunu görək!"
Humay bir quş kimi durdu yerindən;
Sıçrayıb göylərə qanad gərərək,

Bir anda seyr edir asimanları,
Ay kimi gecəyə qız şəfəq yayır;
Öpür, alqışlayır, hey salamlayır
Dağları, daşları sıx ormanları...

Gözündə sayrışır bir çəmən kimi
Baxarlı dağların quzey qarı da.
Basır öz bağrına yasəmən kimi
Hələ gül açmamış budaqları da...

Elə bil dünyaya gələndən bəri
O, nə dərd görmüşdür, nə də ki, bir qəm,
Elə bil günəşdir o gözəl pəri –
Onun gülüşündən yaranmış aləm...

## QANLI ÇADIR

Qalın meşələrin arasında şən,
Üstündə şahinlər dolaşıb gəzən
Bir dağın üstündə çadır qurulmuş,
Üstündə daima qanad çalır quş...
Onun bıçaq kimi iti daşları
Bir qaya şəklində göylərə sarı
Qaldırıb başını səcdəyə dalmış,
Orda boranlıdır ağ geyimli qış...
O dağın dumanlı, çiskinli başı
Açmamış gözünü günəşə qarşı...
Onun yarandığı bir qara gündə
Buludlar gözünü sıxmış üstündə...
Odur, döşündəki qaynar bulaqlar
O keçən günlərə xatirə saxlar.
Nə təyyarə gücü, nə tiren səsi,
Nə də ki, insanın mübarizəsi
Keçməmiş o dağın yanından belə,
İnsan ayağını basmamış hələ,
Qarlı zirvəsinin vüqar yerinə,
O çovğun yerinə, o qar yerinə...
Adam boyundakı yaşıl otları,
Seyrək dumanları, boz buludları
İnsanın fikrini götürüb yerdən
Göyün boşluğuna qaldırır birdən.
Dağın bir dumanlı keçmişi vardır,
Babalar yurdundan bir yadigardır.
Mən onu sevsəm də, sevməsəm də, bil,
Tarix o dövranı qaytaran deyil...

Deyirlər bu dağın ətəklərindən
Kərəm dəstəsilə yeriyib hərdən
Bulaqlar başında qurban kəsərmiş,
Bəylər, mülkədarlar tir-tir əsərmiş
Elin böyütdüyü o qəhrəmandan –

Bu bir xatirədir, keçən zamandan.
Mən onu sevsəm də, sevməsəm də, bil,
Tarix o dövranı qaytaran deyil...
"Qaçaqlar dağı"dır bu dağın adı,
Özündən ayrılır qolu, qanadı.
Bu dağ düşündürür arabir məni,
İndi Gəray bəyin olmuş məskəni.
Toplayıb başına öz dəstəsini,
Dinləyir suların hirsli səsini.
O səsdən ürəyi qüvvətə gəlir;
Hər gün dəstəsini yoxlayır bir-bir.
Hər kimdə əyrilik, yalan taparsa,
Hər kimə azca bir şübhəsi varsa,
Bir güllə çaxaraq onun başına,
Göstərir gücünü yar-yoldaşına...

Budur, Gəray bəyi axtarıb bulan,
Qəlbinin, nəfsinin dustağı olan,
Sevdalar düşkünü, komsomol Cəlal –
Dünyanın qeydindən küsən bir xəyal
"Mərhəmət!" – deyərək yenə inləyir,
Cəlal danışdıqca Gəray dinləyir.
– Gəray bəy, yazığam, zavallıyam mən...
Sizin yanınıza məni gətirən
Böyük bir qüvvətdir, adı – məhəbbət;
Yaradıb, yaşadan insandır, əlbət!
Bu işdə vicdanı əsirgəmə sən,
Atalıq haqqını əsirgəməsən,
Humay xoşbəxt olar.
                        Nə zamandı biz
Sevişdik and içib, birdir qəlbimiz.

– O halda mən kiməm?..
– Atasınız siz!
Humay tapşırdı ki, sizdən izinsiz
Yaxşı söyləməzlər onun adına...

Gəray bəy qızını salır yadına,
Gözündə rəqs edir onun heykəli.
Yanında samavar, çay tökür əli,
Keçir xatırından cahü-cəlalı:
Sürüsü, ilxısı, naxırı, malı...
Getdi süfrəsinin başında duran,
Yoxsulun varını yeyib quduran,
"İgidlər məclisi", o toy, o mağar...
İndi Gəray bəyin özgə halı var.
O dövran, o büsat çıxmış əlindən,
"Taleyin, qismətin gəlhagəlindən"
O indi uzaq...
Hər şeydən qabaq
Onu yandıran
Budur ki, bu dəm
Çalpapaq Kərəm
Minib Gəray bəyin Ərəb atına,
Sürəndə səs salır yerin altına...
Oxucu, bəlkə sən
Özün bilirsən
Ki, bizim yerlərdə bir papaq, bir at,
Bir də hər kişinin aldığı arvad
Namusdan sayılır...
O qansız ürək
Gizli bir eyhamla gülümsəyərək:
– Cəlal! İki qılınc bir qına sığmaz,
Bütün vəziyyəti ölçüb biç bir az...
– Doğrudur, döyüşdə səninlə bəzən
Qoç kimi üz-üzə vuruşmuşam mən,
Gəl, üzə vurma heç o zamanları,
Tarix yaradırkən qəhrəmanları
Cəbhələr ayrılır,bil ki, əvvəldən,
Xatalar baş verir hər vuran əldən...

Cəlal dəyişmişdir, Cəlal tutqundur,
Xəyalı dağınıq, fikri uçqundur.
Ac insanlar kimi qəlbi qırılır,
Gözündə çarpaşıq yollar ayrılır.
Nədir düşündürən bu qədər onu?
Həyatın, sevginin, taleyin sonu!
Cəlalın ağzında dolaşır sözü,
Çünki, düşməninə əyilir özü.
Əyilir yel qırmış ağaclar kimi,
Əriyib tökülür dağda qar kimi.
Düşünür:
"Şübhəsiz bir zaman gələr,
Tarixdən silinər mübarizələr.
Bu qanlı cəbhələr, qanlı silahlar,
Boğuq hıçqırıqlar, dumanlı ahlar
Bütün varlığıyla bir heçə dönər,
Dünya başdan-başa təzə görünər,
Uçar buludlarda insan duyğusu...
Bəlkə də bir şirin əfsanədir bu?!"
O, artıq itirib düşüncəsini,
Dinləyir suların sakit səsini.
Ah! Onun nə dərdli nəzərləri var,
Dərdinə xilqətdə təsəlli arar!..

Gəray bəy şirnikib bu düşkün hala,
Yağlı dillər tökür vurğun Cəlala:
– Oğul, mən bilirəm, sevdaya düşən
İnsanlar ömrünü çürüdür bəzən;
O dərdlə bir zaman mən də inlədim,
Mən də aşıqlara baxıb dinlədim
"Əsli və Kərəm"i, "Fərhad-Şirin"i,
Böyük nağılların gündə birini...
İnsanın ömrünü gödəldir onlar,
Eşqdə acizlik və dəlilik var!
– Gəray bəy, bunları söyləmək boşdur,
Məncə həyat kimi sevgi də xoşdur...
Yoxsa, unudulmuş faciələrdən
Ehtiyatla deyib danışmaqda sən,

Məqsədin bəllidir...
Mən artıq cansız
Bir daş parçasıyam, duyğusuz qansız...
Keçdi o günlər ki, silahımla mən
Atılıb qanlardan və cəbhələrdən
Əyərdim qarşımda yüz min düşmanı,
İndi dayanmışdır qəlbimin qanı.
İndi döyüşlərdən doyub yoruldum,
Özgə bir cəbhənin sakini oldum...
Bu dərdlə vicdanım, ruhum didilir,
İçimdə bir yazıq səs eşidilir.
Duyan ürəkləri ağladacaq bu,
Mən nəyəm?... Sonsuzluq, boşluq yolçusu!..

Cəlal sözlərini bitirib qalxır,
Dərin bir ah çəkib göylərə baxır.
Açılır fikrində sonsuz üfüqlər,
Orda ki, zərrəcə görülməz əsər
Həyatdan, nəşədən, mübarizədən.
Yalnız cilvələnib gülümsər bəzən
Nazənin pərilər... varlığı şübhə,
Gülümsər pərilər: uç, yüksəl deyə...
O, artıq bir şüursuz,
Onu boğur uğursuz
Xəyalatın pəncəsi
Təngimişdir nəfəsi.
Anır "Şeyx Sənanı",
Gəzir gözü dörd yanı,
Odur, odur, bircə bax!
Onlar uçub qalxaraq,
Göyə doğru getdilər,
Yerə nifrət etdilər...
– Cəlal, Cəlal!
Səni xəyal
Udur ki!..
Bu səsdəki bir qorxu
Diksindirdi Cəlalı
Bir az dəyişdi halı...

Gecə yapıncısını geyib dayandı həmən,
Buludların döşündən əmzik tutub süd əmən
Bütün dağlar islanır, ormanlara səs düşür,
Qayalıqlar dil açıb qumru kimi ötüşür.
Göydə nə ay, nə ulduz... Üfüq qara, göy qara,
İldırımlar şığıyır tərpənməyən dağlara.
İşıq düşür arabir uzaqdakı yol üstə,
Çadırlara toplaşır qaçaqlar dəstə-dəstə.
Gecə sakit, gecə lal,
Gecənin alnında xal.
Çadırlardan aralı bir qayanın dalında
Keşik çəkir birisi, yorğunluq var halında.
Gözlərindən tökülür üç axşamlıq yuxusu,
Onun da qəlbində var mübarizə qorxusu.
Onun da fikri pozğun, ürəyi səksəkəli,
Ömründə dincəlməmiş bu yollara gələli.
Otuz ildir bu yolda saçlarını ağartmış,
Bu tükənməz dərd ilə nə yaz bilir, nə də qış,
O gənc ikən axıdıb bir igidin qanını,
Düşmənindən tez aldı atasının qanını...
Anası da sevinib, "südüm halaldır", – deyə
Aynalı saxlancını ona verdi hədiyyə.
O gündən şücaəti ağıza, dilə düşdü,
O zamandan bəridir, onunku belə düşdü...
Arabir kəndə dönüb, qarışır insanlara,
Nə yazıq ki, iş hara, qanun hara, o hara?..
Ürəyinin başında çırpınır vəhşi bir quş,
Qayalardan atılmaq ona bir adət olmuş.
Yəhərləyib atını yenə qalxır yuxarı,
Yoxuşlarda bərkimiş qüvvətinin vüqarı...
Bəzən də qart fikirlər salınca gücdən onu,
Özü də anlayır ki, bu yolun yoxdur sonu...
Odur ki, şiş dağlara indi baxıb, "ah!" deyir,
Fikri dolaşdığı vaxt "ya böyük Allah" deyir.
O, indi bir keşikçi, sabah nişan alacaq
Bəlkə də düşməninin gülləsi ondan qabaq
Partlayıb bomba kimi dağılacaq başında.

O neyləsin ömrünün bu ixtiyar yaşında?
Bu dolaşıq fikirlər, bu qayğılar, sitəmlər
İçində od tutur o, açılmayır ki, səhər!..
Ürəyində bu gecə soyuq bir iztirab var,
Gözündə hər qaraltı gen qazılmış bir məzar...
Gecə sakit, gecə lal,
Gecənin alnında xal...
Göydə nə ay, nə ulduz... Bütün dünya qapqara,
İldırımlar şığıyır tərpənməyən dağlara.
Çadırlar uyğudadır, yatanlar orda sayaq,
Gəray bəyin yanında yalnız Cəlaldır oyaq;
Dolaşıq qayğıların, fikirlərin dustağı,
Azad qəlbə çətindir ömrün əsarət çağı.
O yatmayır, quş kimi ayağından asılmış,
Elə bil ki, üstünə tökülür qarlı bir qış.
Yapışıb əllərilə başının saçlarından
Didişdirir yun kimi, beyninə sıçrayır qan.
İnsan ki ət parçası, insan ki bir bədəndir,
Bu fəlakət, bu ağrı, bu göz yaşı nədəndir?!
Onda nə sirr var ki, sonsuzdur duyğuları,
Uzun müddət sönməyir ürəyinin ilqarı...

Səhərdir, günəşin rəngi qırmızı.
Xilqətin o gözəl, o dilbər qızı
Açıb camalını dağlara sarı.
Otların üstündə şeh damarları
Ağ almazlar kimi parlayıb durur.
Tərlan yuvasından qopub qıy vurur.
Dumanlar dağılır ətrafa qat-qat,
Arabir kişnəyir hörükdəki at
Gəray bəy yuxudan oyanıb vaxtsız,
Çadırdan aralı gəzinir yalqız.
Tökülmüş yenə də qaşı, qabağı,
Söylənir: "Sinəmə çəkilən dağı
Dağlara yükləsəm, altında qalar..."
Bu son şikayəti dinləyən dağlar
Döndərir dalını Gəraya tərəf.

Onun gözlərində qayalar səf-səf
Düzülmüş ordudan daha canlıdır,
Orada hər bir şey əliqanlıdır...
Dünəndən sifariş alan bir aşıq.
Gözləri yuxusuz, fikri qarışıq,
Dolama yollardan keçərək həmən,
Çadırın yanına yetişdi birdən.
Qaçaqlar toplaşıb onun başına,
Bir ona baxdılar, bir yoldaşına.
Aşığın yoldaşı sazdır əzəldən;
O saz ki söz alır min bir gözəldən.
Onda nə əyrilik, nə də ki, qan var,
Hər zaman yaşayan bir həyəcan var.
Ocaqlar çatıldı, kabablar bişdi,
Məclisin ahəngi yenə dəyişdi.
Oturdu diz-dizə qaçaqlar bütün,
Çadırı doldurdu şərabla tütün...
Gözlər qızardıqca qızdı məclis də,
Cəlal sıxılırdı o yad məclisdə.
Aldı sinəsinə sazını Vəli
Simlərin üstündə gəzdikcə əli,
Görək nə dedi:

Ay ağalar, ay paşalar,
Dərd başımdan aşdı yenə,
Açıldı Tanrının gözü,
Sellər, sular daşdı yenə...

Dəyişdi şahların adı,
Dünya rahat oturmadı,
İnsan oğlu dinc durmadı,
Düz yolunu çaşdı yenə...

Sinəmə töksələr, barı,
Quzeydə saxlanan qarı;
Talan oldu elin varı,
Aralıq çaxnaşdı yenə.

Heç gülmədi aşıq Vəli
Haqqa müsafir gələli,
İmamların kömək əli
Bizdən uzaqlaşdı yenə...

Gəray bəy dərdlənir Qarğı dağ kimi,
Yayılır canına sarı yağ kimi
Aşığın ağzından tökülən sözlər,
Dərin bir boşluğa açılır gözlər...

– Bu dünya beş gündür, beşi də qara,
Dünya qalmamışdır ulu xanlara.
Düşmənə baş əyən arvaddır, arvad!
İgidə lazımdır bir tüfəng, bir at.
Fürsəti bərk tutun, o qanadlı quş
Gündə bir qapıya müsafir olmuş.
Kef çəkin, dünyadan ləzzət aparın!
Səmti dəyişmişdir əsən ruzgarın.
İçin oğlanlarım!.. Dəmlənin hər vaxt!
Ömür dedikləri – qızıldan bir taxt
Olsa da, axırı puçdur, inanın!
Dünya meydanıdır ölümün, qanın...
Dedikcə Gərayın sərt baxışları
Açılır bir sonsuz boşluğa sarı...
Qaranlıq başını əymiş dağlara,
Ay da buludları düz yara-yara
Göyün bir səmtinə girib soxulmuş,
Bu gecə başqa bir həsrətlə dolmuş...
Qaçaqlar çadıra toplaşıb həmən,
Uzanıb hərəsi yatır bir yerdən.
Cəlal Gəray bəyin yanında yatmış,
Soyuq dəydiyindən qan-tərə batmış.
Gəray bəy fikirdə, oyaqdır hənuz,
Nəysə plan tökür yenə duyğusuz:
– Nahaq söz vermişəm Cəlala dünən:
Bəlkə bu alverdə uduzuram mən?
Qız hara, mən hara, komsomol hara?

İnanmaq olarmı bu kafırlara?
Zəhmətim olmasın qızıma halal,
Yoxsa, yalan deyir mənə bu Cəlal?
O, bəlkə öyrənib hər sirrimizi,
Sonradan güdaza verəcək bizi?
Bəlkə də davanın şirin yerində
Xəlvətcə arxama dolanıb yenə
O öz gülləsini mənə çaxacaq?
Xeyr! Bu dünyada hər şeydən qabaq
İgidə ehtiyat və inad gərək!..
Gəray bu fikirlə qeyzə gələrək,
Yanından götürür öz naqanını...
Qatilin o dəmki həyəcanını
Mən necə göstərim?
                    Cəlal yuxuda...
Humay yol gözləyir qan uda-uda...
Azacıq keçmədən açılır naqan,
Bir də ayılmayır Cəlal yuxudan...

Kefini pozma heç, əziz oxucum,
Alma nəfəsini sən udum-udum,
Həyatda su kimi bulandıqca qan
Qılınclar, süngülər qızdığı zaman
Sadədil olmağın nəsibi budur,
Vaxtsız ölənləri tarix unudur...
Haman bu anda,
Eyni zamanda,
Humayı basmışdır yuxuda qara,
Yazıq boğazından çəkilir dara.
Yuxu ölüm kimi... Qız ağır yatmış,
Vücudu istidən qan-tərə batmış.
Ondan xəbərsizdir bu qoca dünya,
Boğur qızcığazı gördüyü röya:
Pəncəli, caynaqlı anaş qaraquş
Götürüb Humayı göylərə uçmuş.
Sonra da qonmuşdur qaya başına,
Ovunu salmışdır o, dağ daşına.

Qoyub pəncəsini sinəsinə, bax.
Qızın döşlərini parçalayaraq,
İstər dənliyini doldursun o quş...

Humay yuxusundan gözləri dolmuş
Bir halda səksənir, əsir bədəni;
"Yəqin ki, bir xata gözləyir məni,
Bəlkə də Cəlalın başında iş var?.."
Onun sualına dinməyir dağlar...

## İNTİZAR

Keçdi hadisədən düz on altı gün,
Bir xəbər gəlmədi aran yerinə
Humay intizarda, xəyalı düşgün,
Tozlanan yollara boylanır yenə...
Nə bir yerdə durur, nə də dincəlir,
Sınmış o əvvəlki şahin vüqarı.
Nə də ki, gecələr yuxusu gəlir,
Əlləri qoynunda, qüruba sarı
Boylana-boylana qalmışdır, əvət
Ölür insan qəlbi, ölür məhəbbət.

Bu axşam bəzənmiş qızlar, gəlinlər,
Yığılmış qonşuda toy mağarına;
Fəqət kənardaca bir könül inlər,
Qaranlıq çökmüşdür baxışlarına...

Dəf vurub, qızışıb zurnaçı həmən,
Əl-ələ tutuşub, yallı gedilir.
Məclisə baş çəkir, hər gəlib-gedən;
Səslər qarışıqdır, az eşidilir.
Mağara gəlməmiş "xəstəyəm" deyə
Gülüb sevinməyə biganə Humay.
Qapının ağzında yalvarır göyə,
Buludlar yığışır başına lay-lay...

Yollar səbirlidir, tilsimlidir, ah!..
Bir müjdə gəlməyir o zavallıya.
Gecə açılmayır, doğmayır sabah.
O şair könüllü, xoş xəyallıya.

“Baharın fəslidir, a qarlı dağlar,
Oldu göz yaşlarım ümman, ağlaram;
Nə sözüm, söhbətim, nə həmdəmim var,
Dərdin ürəyimdə pünhan, ağlaram.

Sirrimi vermədim dosta, yoldaşa,
İnsafsız ürəyim dönmüşdür daşa;
Baxmadı gözümdən tökülən yaşa
Havada quş, yerdə insan, ağlaram.

Dəyişdi, günbəgün pozuldu halım,
Bitib tükənmədi bu qeylü-qalım,
Getdi, qayıtmadı körpə Cəlalım,
Bürüdü yolları duman, ağlaram”.
Dedikcə qəlbinə qaranlıq çökür,
Gözündən od kimi o, yaşlar tökür...

Dolandı həftələr, dolandı aylar,
Cəlal qayıtmadı o gündən bəri.
Fəqət təbiətin bir qanunu var –
Bir yerdə durmadan axır iləri...

Dünya dedikləri yarış meydanı –
Qaçanlar baxmayır yıxılanlara.
Göyün şöhrətidir yerin insanı,
Sözünü çeynəməz çəkilsə dara!

Yenə baş götürüb oynayır həyat,
Axır şırıl-şırıl şır-şır bulaqlar.
Könül bir kitab ki, mənası qat-qat,
Təsliməm deməyən bir qüvvəti var.





Yenə günəş də var, ay da var, göy də,
Bunların altında gediş-gəliş də.
Quyruqlu ulduzlar uçuşur göydə,
Həyat yolundadır, insanlar işdə.

Yenə də canlılar həyat yolunda
Qatlanır ağrıya, hər fəlakətə.
Bu qoca dünyanın sirri var bunda,
Aparır insanı ilk səadətə.

Yenə çiçəkləndi, quşların dəmi
Duyan ürəklərin ilham ocağı
Hər arzu, hər dilək ömrün həmdəmi
Gəncliyin bəzəkli və dolğun çağı
Bizə ümid verir, bizə can verir,
Soyuq ürəklərə həyəcan verir.

Humay ümidini kəsməmiş hələ.
Həyata bağlıdır onun varlığı.
Bəlkə bir quş kimi keçəcək ələ
Alınmış taleyi, bəxtiyarlığı.

Bəlkə qayıdacaq onun Cəlalı,
Cehizlər qurulub, toy başlanacaq?
Bəzən bu niyyətlə gülür xəyalı,
Ümid təsəllidir xəyala, ancaq.

Bu gün nəşəlidir söylədiyim qız,
Bir qızartı çöküb yanaqlarına.
Sevinclə sahilə yüyürür yalnız,
Daş-kəsək dolaşır ayaqlarına.

O, yenə boylanıb sulara sarı,
Ördək sürüsünü seyrə dalacaq.
Dindikcə ormanın ağaclıqları,
Quşların səsindən ilham alacaq.

Baxıb gəmilərə gözilə bəzən,
Keçən yolçuları ötürəcəkdir.
Bəlkə, təsadüfən, bir gəlib-gedən
Cəlaldan bir xəbər gətirəcəkdir.

Suyu balıq kimi atla yararaq,
Qızın qarşısına çıxır Bəxtiyar.
Onun rəngindəki boğuqluğa bax!
Yoxsa başında bir fəlakətmi var?!

Humay həyatında birinci dəfə,
Həyadan, ismətdən, namusdan kənar,
Yüyürür Bəxtiyar gələn tərəfə
Və sorur: – Cəlaldan bir xəbərmi var?

## ACI XƏBƏR

Bəxtiyar saxlayır atın başını,
Zilləyir gözünü Humaya doğru.
Hirsindən bozarır, çatır qaşını:
– Sözümə baxmadı o zalım oğlu,
Ona dəfələrlə söylədim ki, sən,
Qurdu quzu bilib etibar etsən,
Bir gün ara yerdə itəcək qanın
Gözləri tutulur bəzən insanın...
İnandı babana, inandı sana,
Necəsin babandan xəbər alsana!..

İtil gözlərimdən qoçunun qızı
Tovlayıb azdırdın sən o baxtsızı.
Başımı bir vulkan dumanlandırır,
Cəlalın ölümü məni yandırır...

Ölüm!
                Bir ildırım sürətilə bax,
Humayın başında şaraq-haşaraq
Bir gurultu qopur... Dizləri əsir,





Canını bir qara üşütmə kəsir.
Dolanır başına ağaclar, otlar,
Yürüyür üstünə qara buludlar.
– Bəxtiyar! Babamın qanı halaldır...
Mənim ağladığım yalnız Cəlaldır, –
Deyərək titrəyir, ürəyi gedir,
Ömrü bir an üçün yazıq tərk edir.
Bəxtiyar heyrətdə...
Sıçrayır atdan.
Sevgidən, nəşədən, sadə həyatdan
Ayrılan talesiz bu dağlar qızı,
Sakit səhərlərin bu dan ulduzu
Onun gözlərində böyüyür birdən...
Utanır Bəxtiyar dediklərindən.
Darayıb alnından saçını bir-bir,
Qızın sinəsinə soyuq su səpir.
Gözündən süzülür damla-damla yaş,
Sanasan acıyır bacıya qardaş.
Bunu təsadüfən görən Mirpaşa
Əlində papağı qaçır birbaşa,
Qaçır birnəfəsə kəndə çatmağa,
Qaçır Bəxtiyara böhtan atmağa.
Humay bir ah çəkir, gəlir özünə,
Bir məzar görünür dünya gözünə.
– Humay, özünə gəl! Bağışla məni,
Artıq-əskik deyib incitdim səni.
Bilmədim Cəlala vurulduğunu
Sevdalı bir könül əfv edər bunu.

– Bilirəm, Bəxtiyar, səni incidən
Onun, o yazığın fəlakətidir.
Cəlladlıq babamın bir adətidir.
Bəlkə taqsırkaram doğrudan da mən...

– Utanma, gəl bacım, gəl, gedək sizə,
Gəl ötürüm səni öz evinizə.
“Gecə uzun, ay batmaz,
Dərdlilər dərddən yatmaz”.

O vaxtdan bəridir Humayım mənim
Təpədən dırnağa geyinmiş qara.
Heyranam qızdakı bu duyğulara!..
Gecələr anası yuxuya getcək
Yazıq qorxa-qorxa çıxır dışarı.

Yurdsuz və yuvasız yolçu kimi tək
Dolaşır avara qaranlıqları.
Yoxsa gecələrə sorğusumu var
Bu sakit, bu geniş çöllər qızının?

Neçin sualına dinməyir dağlar
Ellər gözəlinin, ellər qızının?
Şairim, qəlbini burax kənara,
Böyük bir dünyadır, sən ondan danış.

Yaxşı bax o sönən zəif fanara,
Əsnəyir üstündə boranlı bir qış.
Gecədir... Doqqazın yanında Humay
Dayamış alnını soyuq şalbana.
Soxulmuş buluda, görünməyir ay,
Küləklər atını çapır dörd yana,

Bu şaxta, bu külək, bu soyuq ona,
İnanın, zərrəcə əsər etməyir.
İndi peşimandır doğulduğuna,
Qızın gözlərinə yuxu getməyir.

Nədir istədiyi dilsiz gecədən?
Baxın gözlərindən süzülən yaşa!
Burda saatlarca dayanır nədən?
Gecənin ürəyi döndümü daşa?

Xayır! Təmənnası yoxdur həyatdan,
Xilqətin küləyi, boranı, qarı
Yağsa da duyğusuz bir kainatdan,
Əyilməz Humayın şahin vüqarı...

Yazıq! Sındırmışdır qol-qanadını
Vaxtsız bir ölümün acı xəbəri.
O çaşır, unudur bəzən adını
Ayrılıq hökmünü verəndən bəri.
Burda ilk görüşün xəyalilə qız,
Kim bilir, könlündən keçirir nələr?
Bu tənha gecənin qoynunda, yalnız
Sürüdən ayrılmış bir ahu mələr...
“Sənin sözlərinə boyun əyməmək
Əlimdən gələrsə, ey nazlı mələk,
Qoy günə kor baxım, baxtım qaralsın,
Bütün səadətim heçliyə varsın!
Qaralar geyinsin eşqimin sonu,
Arayıb, axtarıb, taparam onu;
Ya məni öldürər, ya da yaşadar,
Ölümdən qorxmağın nə mənası var?” –
Sözlərilə Cəlal sanki yenidən
Canlanır Humayın qarşısında tək,
Qolunu boynuna aşırıb həmən
Baxır gözlərinə gülümsəyərək...
Ah, ölən məhəbbət, ah, ölən istək!
Nədir həyatdakı bu çarpaşıqlar?
Yaşasın gələcək böyük gələcək!
Onda nə göz yaşı, nə ayrılıq var!

Humay xəyaldadır... Çəkilir Cəlal,
Gedir yavaş-yavaş qaranlıqlara...
Aparır ardınca Humayı xəyal,
Çiçəyi sayrışan bir çəmənzara...

## HUMAYIN ÖLÜMÜ

Səhərdir... Azacıq kənddən aralı
Bir dağ ətəyində qar düzəngahı.
Bu qar dənizində açmış sabahı
Sürəkdən ayrılmış dağlar maralı...





Uzanmış tir kimi, donmuş bədəni,
Ağarmış bənizi dümağ süd kimi.
Budaqsız, yarpaqsız bir söyüd kimi
Yıxılmış torpağa, ağladır məni.

Almış dövrəsini halqalanaraq,
Çöllərin sultanı, şahı çobanlar.
Ortalıqda sükut və həyəcan var,
Ürəkdən birisi qıza yanaraq:
Birinci çoban:
– Budur, bu dünyanın son etibarı,
Axırı puç olur dövlətin, varın,
Tez olun, kəndə bir xəbər aparın,
Qızın anasını çağırın barı!..

İkinci çoban:

– Gəray bəy bu günü görsəydi inan,
Yanan gözlərindən odlar yağardı.
Bir eli, bir günü diri boğardı,
Daşı-daş üstündə qoymazdı bir an.

Üçüncü çoban:

– Gəray bəy çoxunu diri soyubdur,
Qoy onun oduna balası yansın.
Pis günü daldadır, hələ dayansın!
O çox anaları ağlar qoyubdur...

Dördüncü çoban:

– Sən də səfehləmə, bu, günahsızdır,
Arvad xaylağıdır, özü də qızdır...

İxtiyar çoban:

– Alın yapıncımı, bürüyün onu,
Canı var... Tez olun, tonqal qalayın!
Aləmə car çəkib, bir xəbər yayın!
Zəhərdir bu şirin dünyanın sonu...





Gəray bəy ölməmiş, sağdır dünyada,
Atadan, babadan böyüyümüzdür;
İndi pis günüdür, hər dərdi yüzdür,
Bizimdir namusu hər kim olsa da...

Mehriban çobanlar durub yanaşı,
Humayı çiyninə götürüb gedir...
Qızı ağlayaraq ziyarət edir
İxtiyar ananın bəlalı başı.

Ocaqlar çatılır, ev qızır haman,
Humay bürünmüşdür isti yorğana.
Başının üstündə ağlayır ana,
Oturmuş dizinin üstündə Quran.

Qapı qulluqçusu qoca bir qarı
Çevirir ocağın isti közünü.
Humay qızışdıqca açır gözünü,
Baxır pəncərədən bayıra sarı.

Dolanır həftələr, dolanır aylar...
Kəndin arasında bir danışıq var.
Humayın ardınca deyirlər "dəli",
Deyirlər: "Başına hava gələli
Gecələr sıyrılıb yatacağından
Asılır quş kimi öz ayağından,
Nə çovğun anlayır, nə boran, nə qar".
(Olanı artırır, bəzən insanlar...)
"Gəzir ayaqyalın, gəzir başaçıq,
Həyası qalmamış qızın azacıq".
Deyirlər: "Ulduzun, ayın, buludun",
Deyirlər: "Günəşin, alovun, odun
Arxasınca düşür, gəzir sərsəri
Başının ağrısı tutandan bəri".

Ah, ölən məhəbbət, ah, ölən istək!
Nədir həyatdakı bu çarpaşıqlar?
Yaşasın gələcək, böyük gələcək!
Onda nə göz yaşı, nə ayrılıq var!

Son bahar... Nə yaman gəldi son bahar!
At çapan dalğalar sır-sır bağlamış.
Bağlı qapıları açdıqca ruzgar,
Gülür qəhqəhəylə bizə qara qış,
At çapan dalğalar sır-sır bağlamış.
Nə çadır görünür, nə yaşıl bir düz,
Deyib danışmayır xınalı kəklik;
Ömrünü tapşırır, gödəlir gündüz,
Bülbül ağlasın ki, solur çiçəklik,
Deyib danışmayır xınalı kəklik.

Gecədir, ulduzlar donur havada,
Səyirdir atını qara bir bulud.
Quşlar da boynunu burur yuvada,
Gəzir qapıları ölü bir sükut;
Səyirdir atını qara bir bulud.

Düşünür sakitcə torpaqlı damlar,
Boğur kainatı gecənin əli.
Mənim də ruhumda bir iztirab var –
Ölür sənətimin o ilk gözəli,
Boğur kainatı gecənin əli.

O, yeddi həftədir yorğan-döşəkdə,
Təbibsiz, davasız can üstündədir;
Humaydan iyrənir yorğan-döşək də.
O ellər gözəli gör nə gündədir!
Təbibsiz, davasız can üstündədir...

Ölür sənətimin vəfasız yarı,
Gəlsin Füzulinin ağlar qəzəli!
Gəlib sevgilimlə görüşsün barı,
Yolunu gözləyir ellər gözəli,
Gəlsin Füzulinin ağlar qəzəli!

Ey Günəş! Ey bulud! Şahid olun siz,
Göylərin altında bir həyat sönür –





Sönür sevgilisiz, sönür sevgisiz,
Asiman dolanır, asiman dönür,
Göylərin altında bir həyat sönür...

Qaydadır, dünyadan yaxşı gedəndə
Dost dəsmal götürər, düşmən açılar...
Bəzən taleyimi düşünüb mən də,
Deyirəm mənim də başımda bu var:
Dost dəsmal götürər, düşmən açılar...

O artıq cahanda bir quru addır,
Susuram ruzgarın suallarına.
Bu axşam, şairim, şerin azaddır,
Təftiş komisyonu qalsın yarına,
Susuram ruzgarın suallarına.

Başının üstündə titrək əliylə
Ağlayır ixtiyar, ağbirçək ana;
Danışır ömrünün bu son gülüylə;
"Mən ölüm... can bala... qıymaram sana.."
Ağlayır ixtiyar, ağbirçək ana.

Humay anasının son beşiyidir,
Sonbeşik üstündə əsir analar;
Onun var-yoxudur, ev-eşiyidir.
Ananın yuxusuz gecələri var,
Sonbeşik üstündə əsir analar.

O görür qızının yazıq halını,
Qəfəsdə quş kimi özünü yeyir.
Bütün dövlətini, bütün malını
Humayın başına sadağa deyir.
Qəfəsdə quş kimi özünü yeyir.

Yolur birçəyini, ağlayır asta,
Humay matəmini bilməsin deyə.
"Dünyanı xəlq edən, ey böyük usta!"

Deyərək yalvarır, yaxarır göyə,
Humay matəmini bilməsin deyə.

Yazıq! Üfüqlər də, buludlar da lal,
Külək qamçılayır qaranlıqları;
Aparır xəstəni qara bir xəyal.
Aparır gizli bir diyara sarı,
Külək qamçılayır qaranlıqları.

Aha! Xilas üçün yüyürür Cəlal,
Fəqət, faciədir xəyalın sonu
Gəray bəy arxadan, əlində xançal
Soxulub Cəlala, öldürür onu...
Fəqət, faciədir xəyalın sonu.

Sonra da yaxlaşır əlləri qanlı,
Humayın heyrətdən böyüyür gözü.
O qızmış mis kimi, başı dumanlı...
Burda tükənmişdir şairin sözü –
Humayın heyrətdən böyüyür gözü.

Xəstə son gücünü toplayaraqdan
Qışqırır, yayılır bu səs otağa;
Gəray bəy doymamış qandan, yaraqdan,
Atına qalxaraq dırmanır dağa,
Həzin bir vəlvələ düşür otağa...

Səhərdir... Üfüqün geydiyi sarı,
Solur şəfəqlərdə xəstə üzlü ay;
Ağarır süd kimi dağların qarı,
Fəqət gözlərini yummuşdur Humay,
Solur şəfəqlərdə xəstə üzlü ay...

Üstünə çəkilən kəlağay qara,
Donmuş yanağında iki damla yaş.
Bənzəyir tutulan ağ buludlara,
O artıq olmuşdur heçliyə yoldaş;
Donmuş yanağında iki damla yaş.

Səhərin qoynunda ağlaşma səsi
İnsanı yandırır odsuz-ocaqsız.
Nədir kainatın bu mənzərəsi,
Yaşayanmı haqsız, ölənmi haqsız?
İnsanı yandırır odsuz-ocaqsız...

Ulduzlar havanın bağrını dəlir,
Qayalı dağlardan duman yüksəlir,
Xəyalım gecəni salama gəlir,
Çapdırır atını birbaşa dünya,

Yerlərə baxıram – bağçalı, bağlı,
Göylərə baxıram – qapısı bağlı,
Kainat ixtiyar, sirli, soraqlı,
Əzəldən yaranıb tamaşa dünya.

Əzəldən belədir çünki kainat,
Cahan daimidir, ömür amanat
Əldən ələ keçir vəfasız həyat;
Biz gəldi-gedərik, sən yaşa, dünya!

Bir də düşünməyə varmı vaxtımız
Sirri məchul olan bu mənaları?
Şairim, belədir, bizim baxtımız
Bəşər tapmamışdır əzəldən bəri
Sirri məchul olan bu mənaları.

Heçliklə çarpışan bu canlı varlıq
Məncə düşünməyə, duymağa dəyməz.
Sadə həyatdadır hər bəxtiyarlıq;
Ömür dedikləri ötərgi bir səs.
Məncə düşünməyə, duymağa dəyməz!
Fəqət, mən istərəm qıymasın həyat,
Şeirin ağladığı bir gözəlliyə.
Hər zaman dəyişən, dönən kainat
Qıymasın, şairlər yazıqdır deyə,
Şeirin ağladığı bir gözəlliyə...

Buludlar dağılır uzaqda lay-lay,
Yenə öz yerində yuvarlanır ay;
Fəqət nə Cəlal var, nə də ki, Humay,
Nə ömrə acıyır, nə yaşa dünya.

## SARI ŞƏMİSTAN

Qaş qaralan zaman atlı bir ordu
Gəlib bir təpənin yanında durdu.
“Burada dincəlin!” – dedi komandan,
Özü də bir daşa söykənib haman,
Hərləyib durbini gözünə taxdı,
Dağların qoynuna diqqətlə baxdı.
Sonra xəritəni qoynundan alıb,
Rəngli cizgilərə heyrətlə dalıb
“Körpüyə çox qalır” – deyə komandan
Dolama yollara baxdığı zaman
Yorğun gözlərinə bir yuxu gəldi,
Azca mürgüləyib o da dincəldi...
Komandan yuxuda quş kimi sayıq,
Bir saat keçmədən yenə qalxaraq:
– Atlanın!
            İrəli!
                        Əmrini verdi.
Ordu hazırlaşıb bir də yeridi.
Komandan qabaqda gedir çaparaq,
Az qalır ki, düşə başından papaq.
Onun baxışları qılıncdan kəskin,
Onun gözlərində oynayan bir kin
Yaxır varlığını alovlar kimi,
Qəlbində həsrəti, dərdi var kimi,
Yollar uzaq gəlir indi gözünə.
Bəzən də hirslənib sorur özünə:
“Qanlı döyüşlərin” yoxmudur sonu?
Yüz qanun uydurur hər gəlib-gedən...
Anlayan varmıdır tarixdə bunu –





Bəşər bir-birinə zülm edir nədən?
Yüz qanun uydurur hər gəlib-gedən...

Bəlkə də insanın əslindədir bu –
Qaranlıq gecələr... aydın gündüzlər...
Sərxoş qəhqəhələr... gülməyən gözlər...
Duyub düşündükcə illər uzunu
Qaldım iki suyun arasında mən,
Yüz qanun uydurur hər gəlib-gedən..."

Sonra gözlərinə göründü yenə:
Enib xəyalının dərinliyinə
Əlləri qoynunda qüruba sarı,
Dumanlı dağlardan əsən ruzgarı
Öpüb salamlayan həsrətli bir göz;

Sanki komandana deyir Yasəmən:
"Yollara baxmaqdan üzülmüşəm mən,
Ellərin ağzında dolaşır bir söz.
Uğursuz bir xəbər ki, məni yaxır,
Başımın üstündə şimşəklər çaxır.
Söylə, doğrudanmı yaralısan sən?
Bu yaxın günlərdə bacara bilsən
Gizlənib, ordudan canını qurtar!
Sənin bilmədiyin bir xəbər də var:
Şəhər qarışmışdı, bir sabah erkən
Nə qədər yalvarıb-yaxardımsa mən
Sözümə baxmadı ixtiyar baban,
Divardan tüfəngi götürüb haman:
"Nökərdən şah olmaz!" – deyərək getdi,
Qarışıb tünlüyə gözümdən itdi...
O gün insanların qızğın səsindən
Analar saç yolub üz cırmaladı.
Aynalar töküldü güllə səsindən,
Düşdü ağızlara babanın adı,
Analar saç yolub, üz cırmaladı.
Sonra faciənin qurtardı sonu,

O gündən bir daha görmədim onu.
Dedilər ixtiyar son nəfəsində
Donuq bir xırıltı titrək səsində:
“Nə qədər aldanıb aldadılmışam,
Yağlı vədlərə mən satılmışam...”
Deyərək, canına qəsd eləmişdir,
Dilim tutmayır ki... o neyləmişdir?
İndi mən ömrümün ixtiyar çağı
Kimin qapısında dolanım sənsiz?
Özünü tez yetir gözümün sağı,
Qərib quşlar kimi yurdsuz, vətənsiz...
Kimin qapısında dolanım sənsiz?
Namərdlik eyləməz halal süd əmən,
Gözləyirəm səni.
Anan: Yasəmən”.

Düşündükcə elə dərin,
O qarışıq fikirlərin,
Pəncəsində komandan,
Beyninə sıçradı qan.
Yetim bir uşaq kimi
O qısqanır özündən,
Dağlar bir ordu kimi
Gəlib keçir gözündən...
Qayalıqlar, dərələr,
Ən qorxunc mənzərələr
Bulandırır könlünü.
Şaşırmışdır yolunu...
Çapırdır öz atını
Bir dağın arxasından,
Ordu da arxasından
Yelləyib qanadını
Uçur ulğuna sarı
Gecə olmuşdur yarı.
Ortalıq
Zil qaranlıq
Göz-gözü görməyir, bax!





Birdən taraqqataraq
İki güllə partladı,
Göyün qəlbi çatladı.
Yuvarlanıb atından
Yerə dəydi komandan,
Gödəldikcə nəfəsi
İnildəyirdi səsi.
Sonra tutuldu dili,
Öz canının qatili...
At yanında duraraq,
Yalmanını buraraq,
Ona tərəf baxırdı,
Gözündən yaş axırdı.

Bu haldan ordu da heyrətə gəldi,
Ortadan birisi keçib yönəldi,
Baxdı ki, qalmamış komandanda can.
Bulayıb başını Sarı Şəmistan:
– Gözləmək olmazdı sizdən bu halı,
Bu çətin günlərin var istiqbalı!..
Ömür dedikləri dalğalı bir su,
Vardır əziyyəti, vardır qayğısı.
O bəzən insanı büküb əyildir,
Çarpışıb yaşamaq asan deyildir.
Hər kimin qüvvəsi varsa qolunda,
Həyatda tutduğu məslək yolunda
Bəzən gözlərinə qaranlıq çökür,
Ölür və öldürür, qızıl qan tökür.
Gözləmək olmazdı sizdən bu halı,
Bu çətin günləri var istiqbalı!..
Hələ kəsilməmiş insan nərəsi,
Hələ qulaqlarda topların səsi,
Dayanıb üz-üzə bütün ölkələr,
İndi baş qaldırır müstəmləkələr;
Artıq, "böyüklərin" yıxılır tacı,
Yaşamaq onlara ağıdan acı...
Açıb gözlərini ətrafına bax,

Belə bir zamanda cəbhədən qaçmaq
Düşmənə qurtuluş, hörmət deməkdir,
Varlığı heçlikdə boğub yeməkdir.
Gözləmək olmazdı sizdən bu halı,
Bu çətin günlərin var istiqbalı!.

Sonra üz çevirir orduya tərəf
"Komandam altında!
Düzəlin səf-səf!" –
Deyərək qabağa düşdü Şəmistan,
Ordu da arxadan sallanıb haman
Hərlənib, dolanıb, çıxdılar düzə,
Təslim olmadaydı gecə gündüzə...

## SON MÜHASİRƏ

O vaxtdan həftələr, aylar dolandı,
Sular gah duruldu, gah da bulandı;
Dağları titrətdi atışma səsi,
Torpağı yandırdı göyün nəfəsi.
El gücü – sel gücü, dəstəbədəstə
İgidlər yeridi qaçaqlar üstə.
Kərəm dəstəsini çəkdi irəli,
Bağlayıb yolları, dar keçidləri,
Aldı Gəray bəyi mühasirəyə:
– Axırın çatmışdır! Təslim ol! – deyə
Koroğlu nərəsi çəkir dağlara,
Yayılır nəfəsi lap uzaqlara.
Bəxtiyar Kərəmlə hər yerdə qoşa
Gah qoltuğa yatır, gah çıxır qaşa.
Bədəni istidən od tutub yanır,
Nə durub dincəlir, nə bir dayanır;
Hirsindən dişləri dilini kəsir,
Arabir əlində tüfəng də əsir.
Gözünə görünür komsomol Cəlal,
Dil açır: "Qanımı Gəray bəydən al!

  

Kəndimiz necədir? Humay necədir?”
Atışma dayanıb, yarı gecədir.
Kimsə tərpənməyir...
Açılsın səhər!
Baxarıq kimdədir, kimindir hünər?

Bəxtiyar düşünür gözlərində yaş...
Tənqidçi deməsin niyə ağlayır?
Ürək nə poladdır, nə tuncdur, nə daş
Bəxtiyar dostuna yas da saxlayır...

Üç aydır toy olub gəlin gələli,
Hələ dəyməmişdir Gülzara əli
Hələ açılmamış qızın duvağı
Öpüş görməmişdir onun dodağı.

Bəxtiyar gecələr vaxtsız oyanır,
Ah çəkir, naləsi ərşə dayanır.
Gəzinir gah evdə, gah da eşikdə,
Başına dolanır ev də, eşik də,

Gülzara bəllidir onun bu dərdi
Axı, o, Cəlalla xeyirdə, şərdə
Bu yaşıl dağlarda, göy meşələrdə
Doğma qardaş kimi qoşa gəzirdi.

Axı Cəlalın da muradı vardı,
O da bir gözəli sevib oxşardı.
Hayıf ki, diləyi dilində qaldı,
Yel əsdi, gül soldu, yarpaq saraldı.
Budur Bəxtiyarı yandıran, budur.
Zamanın dərdini zaman unudur.
Vəfalı bir dost ki, ayrıla dostdan
Cana ləşkər çəkər qəm qəmin üstdən
– De, kimsən ey pəri, bu sularda sən?
Canıma od düşdü gülüşlərindən.
Qəmli gözündəki o məna nədir?

O dağlardan ağır istehza nədir?
Mənim bu günümə gülənlər azmı?
Barı sən gülməsən yaxşı olmazmı?
Bir dillən, insansan, yoxsa mələksən?
Ah, nə mehribansan, ah nə qəşəngsən!..
Bəlkə də ilk arzum, son əməlimsən,
Mənim dar günümdə kömək əlimsən.
Dağıldı başımdan yaxın həmdəmlər,
Qəlbimi qurd kimi dağıdır qəmlər.
Sənin saçın kimi qaradır baxtım,
Keçdi o dövranım, keçdi o vaxtım.
Keçdi o günlər ki, Gəray bəy vardı,
Mahaldan-mahala at oynadardı...
Elə zənn etmə ki, yenə mən sağam,
At sürüb ellərə səs salacağam.
Mən daha ölmüşəm, quru səsim var,
Nə cəsəddə canım, nə nəfəsim var.
Mənim bu günümə gülənlər azmı?
Barı, sən gülməsən yaxşı olmazmı?
Qız çatır sularda sıx qaşlarını,
Sel kimi axıdır göz yaşlarını...
Niyə dinməyir o? Bəlkə də laldır?
Bu bir həqiqətdir, yoxsa xəyaldır?
Ah, o dinməsə də danışır sular,
Danışır şam kimi sönən arzular.
Danışır başından gəlib keçəni:
"Yox, yox, gülməyirəm, demə ki, yadam,
Mən sənə özgə yox, doğma övladam.
Bir zaman sən özün yaratdın məni,
Sonra da... sonra da..."
– Bəsdir, amandır!..
Başımdan od çıxır, danışdıqca sən,
Bir az yaxına gəl, öpüm üzündən!
Hardasan, can bala, xeyli zamandır?
"Hardayam? Yer altda... Soyuq məzarda..."
Bir həsrət nəğməsi çalır ləpələr,
Gəray bəy sudadır qurşağa qədər.

Ay kimi gəzişir qız dalğalarda,
Yanır, alovlanır qəlbi şam kimi,
Qaralır gözləri bir axşam kimi.
O suda getdikcə qız uzaqlaşır,
Arabir dalğalar başından aşır.
Gəray bəy yalvarır: – Can bala, bir dur!
Görünür taleyim, qismətim budur.
Yaxın gəl, bir az da danışaq barı,
Ovut sinəmdəki bu ağrıları...
Yox, yox! Heç ovutma, yansın ciyərim,
Biləkdən düşəydi kaş ki, əllərim.
Cəlal yaşasaydı, yaşardın sən də,
Gül kimi gülərdin çöldə, çəməndə.
Öz atan olsam da, qatilin çıxdım,
Mən səni yıxmadım, özümü yıxdım.
Deyirdim, mənə sən oğul olarsan,
Məndən bu dünyaya nişan qalarsan.
Yıxdım öz evimi, öz əllərimlə.
Azğın, ehtiraslı əməllərimlə
Səni qurban verdim dünya varına...
Gəray bəy baxtını söydükcə söyür,
Sonra ikiəlli başına döyür.
Qızın səsi gəlir qulaqlarına:
“Qatilim olsan da, atamsan mənim.”
– Mehriban danışma! Yanır bədənim,
Lənətə layiqəm, qızım, lənətə!
Artıq nə Allaha, nə təbiətə
Sığınan deyiləm... Bil ki bu gündən
Kimsəsiz, arxasız, tək qalsam da mən
Yenə bir qoşuna cavab verərdim..
Ancaq yaşasam da yurdsuz, vətənsiz,
Yaşaya bilmərəm aləmdə sənsiz!
Sənin faciəndir ən böyük dərdim...

Səslənir Gəraya dumanlı dağlar:
– Təslim ol! – deyir;
Nizə tək ucalan sərt qayalıqlar:
– Təslim ol! – deyir;

Bulanıq su da,
Bir son arzu da:
                    – Təslim ol! – deyir;
Başına fırlanan göy də, torpaq da,
Səslənən meşə də, şax da, yarpaq da:
                    – Təslim ol! – deyir;
Əsən külək də,
Çaxan şimşək də:
                    – Təslim ol! – deyir;
Taqətsiz qolu da, əsən dizi də:
                    – Təslim ol! – deyir;
Xəyal dünyasında doğma qızı da:
                    – Təslim ol! – deyir.
Yarır qaranlığı bir böyük dəstə,
Gəlir bulud kimi Gərayın üstə.
Gəlir addım-addım, lap yaxın gəlir.
Çalpapaq Kərəmin səsi yüksəlir:
– Gəray bəy! Gəray bəy! Tüfəngini at!
Üstünü kəsmişdir böyük bir elat.
İnad yeri deyil, biz çoxuq, sən tək.
Yersiz qan axmasın, tərslikdən əl çək!
– Sizə yox! Sizə yox!.. Mən öz canımı
Ona tapşırıram... ona... qızıma...
O sönüb-saralan dan ulduzuma!
İstəsə, o töksün mənim qanımı! –
Deyib qanlı Kürü o yara-yara
Getdikcə qərq olur sərt dalğalara...
Ancaq nə xəyal var, nə də ki Humay
Qaranlıq sulara işıq salır Ay...

*1931*

## MACƏRA

Yaxşı yadımdadır on beş il əzəl,
Özgə qundağına layla çaldığın.
Uzun saçlarını yolduqca hər əl,
Qul kimi qolları bağlı qaldığın.

Yaxşı yadımdadır hər səhər erkən,
Nehrə çalxadığın, qaymaq tutduğun...
Nələr çəkməmisən bu dünyada sən!
Bəlkə də onlardan var unutduğun.

Bəzən də xanımın süzüb gözünü,
Danlayardı səni, söyərdi səni.
Dönüb qaytarsaydın onun sözünü,
Ağan çəkməsilə döyərdi səni.

Özün deyirsən ki, baxıb halına,
Körpə yaşlarımda çox ağlamışam.
Bir şey yazmamışam istiqbalına,
Çünki az duymuşam, az anlamışam.

Gəlir xatirimə ellər köçəndə,
Aranda qaldığın, yoxsulluq dərdi...
Qotazlı karvanlar gəlib keçəndə,
Hər gələn ömründən bir çiçək dərdi.

Bir axşam varlığa yumub gözünü,
Bir qırıq çatıdan asdın özünü.
Lakin sən ölmədin, ölüm uzaqdı,
Gələcək bir günə inananlardan.
Parlaq baxışların qəndillər yaxdı,
Yarandın haqqa üçün axan qanlardan.

Söylə, yadındamı on üç yaşında,
Sən gülüb oynarkən sular başında,
Yanından yel olub, bir atlı keçdi,

Atlının gözləri tək səni seçdi.
O səni top kimi alıb tərkinə,
Üstəlik apardı evindəkinə?..

İkinci axşam da əlində Quran,
Kəsdi nikahını bir uzun qazı.
Çəkdiyin ahları duyduğu zaman,
İnlədi dağlarda aşığın sazı.
Papaqla vurdular, sən yıxılmadın,
Deməli, mümkündür... Yazıldı adın.

Sonra incilərin və almazların,
Rənginə uyduqca yumşaldın həmən.
Əlvan ipəklərin, ağ atlazların,
Qoynunda bir zaman xumarlanıb sən,
Saxta bəzəklərə şirnikib qaldın,
Sən də gəlin olub, sən də ad aldın.

Yazıq! Çox sürmədi bu "səadətin",
Ağardı saçları tezcə ərinin;
Ürpəşdi tüklərin, çimçəşdi ətin,
Söküldü varağı can dəftərinin.
Keçən bulud kimi, gündüzün qara,
Bildin aldanmısan sən bu kaftara.

O köhnə hərif də anladı ki, sən,
Doğrudan da ona tay deyilmişsən.
İnsafı tərk edib, haqqı unutdu,
O səni yumruğa, qapaza tutdu.
Ömrün lampa kimi sönüb qaraldı,
Ölüb qalmağına şübhə də vardı...

Bir axşam bəxtinə özün yol açdın,
Bir cavan çobana qoşulub qaçdın.
Dərələr keçərək, dağlar aşaraq,
O kinli gözlərdən uzaqlaşaraq,
Getdikcə getdiniz... yenə getdiniz...
Uzaqda bir kəndi məskən etdiniz.

Həftələr dolandı, aylar dolandı,
Sənin taleyində bir günəş yandı;
Körpənin adını Qərib qoydunuz,
Yediyi arpalı, yavanlığı duz...

Bir sabah günəşin canlı rənginə,
Şəhla gözlərini dikmişdin yenə.
Uşaq da qoynunda bir balıq kimi,
Atılıb oynardı günəşə sarı.
Sənin də qəlbinin şahin vüqarı
O sadə varlıqdan ilham alardı,
Ömrünün belə bir səhnəsi vardı...

Günlərin birində bir acı ruzgar
Ötdü... Hər vüsalda ayrılıq da var.
Çobanı vurdular dağlar başında,
O səndən ayrıldı ən gənc yaşında.
O gündən gəlmədi çobanın səsi,
Bir yadigar qaldı onun körpəsi.

Ömür dedikləri sorsalar nədir? –
Xətləri qarışıq bir xəritədir,
İnsanın gözünü şaşırdır bəzən...
Sürünüb körpənlə qapılarda sən
Alnının təriylə böyütdün onu,
Çəkdin ağrısını illər uzunu.

Uşaq zəkalıydı, alnı ay kimi,
Sevgidən gəlmişdi onun tərkibi.
Hər şeyi dinləyər, danışmaq istər,
Yanında bir söhbət açılsa əgər,
O da böyükləri andıran halla
Qarışar söhbətə min bir sualla.
Sən də o səhnədən ilham alardın,
Qəlbini saz kimi tutub çalardın.

Sən oldun şahidi axan qanların,
Azadlıq uğrunda qəhrəmanların

Ordusu dağlara yol açan zaman
Sənin böyütdüyün o Qərib oğlan
Qarışıb onlara bolşevik oldu,
Sən dözə bilmədin, gözlərin doldu:
– Oğlum, getmə! – dedin, sözə baxmadı,
Düşdü tarixlərə Qəribin adı.

Buludlar açılıb, sular duruldu,
Tarixdə başqa bir dövran quruldu:
Bəylərin, xanların – qan soranların

Taxtı tarac oldu tamam onların.
Bir sabah, çaxnaşan bir böyük kütlə,
Eyni həyəcanla və hərəkətlə
Xalqın ciyərindən dalğalanaraq,
Əllərdə titrədi bir qızıl bayraq!
O böyük dəstədə Qərib də vardı,
O bizim ölkədə ilk komissardı.
Onun hünərindən, onun adından
Açıldın gül kimi və şadlığından
Göylərə uçmağa qanad aradın...
Dəyişdi şöhrətin, dəyişdi adın,
Dəyişdi ömrünün əski səhnəsi,
Dəyişdi dünyanın əvvəlki səsi...

İndi at üstündə gəzib bəndləri
Kolxozun yerinə su paylayırsan,
Çağırıb yarışa qonşu kəndləri
Dalda qalanları haraylayırsan.
Artıq ağlamırsan, ana, yaslarda.
Hərdən özəklərdə və iclaslarda
Sədrdən söz alıb danışdıqca sən
Xəyalım nə qədər yüksəlir bilsən!..

Şahid oldun, keçən yaz
Keçdi soyuq və ayaz.
Bahar gəldi gülərək,

Güldü hər gül, hər çiçək,
Sular daşıb səsləndi,
Dağların da kəməndi
Qollarını gərərək,
Xoş sifət göstərərək,
İnsana “gəl” deyirdi,
O canlı bir şeirdi.
Səkkizi mart günündə
Gözlərinin önündə
Dəyişmişdi təbiət,
İnsan, həyat və sənət –
Hər şey səni qarşılar!
Alnındakı o vüqar
İlham verdi xəyala,
Heyran oldum o hala.
Sən dəstəni çəkirdin,
Onlara baş çəkirdin.
Sevinirdi bu həyat!
O təntənə, o büsat
Tarixlərdə qalacaq,
Aşıqlar da çalacaq.
Öz sazında adını:
Şərqin azad qadını!
Qabaqda ney, balaban
Coşub dindiyi zaman
Oğlan qıza qarışdı,
Duyğular da yarışdı,
Sən də baxıb onlara –
Qızlara, oğlanlara
Bu günü alqışladın,
Birdən nitqə başladın:

“Bu gün mart ayının səkkizindəyiz,
Qışın boranları gedib, gəlməsin!
Bir yeni dünyanın yolçusuyuq biz,
Qarşıya çıxmasın nə tanrı, nə din!
Qışın boranları gedib, gəlməsin!”

Uşaqlıq dövrünü artıq tərk edən,
Gələcək bir günə yol alıb gedən
Qəlbimi quş kimi yemlədikcə mən
Bilsəniz nə qədər ilham alıram!
Aşıqlardan qabaq özüm çalıram
Şeirim telində o nəğmələri,
Məqsədim yüksəliş, yolum irəli!..

*1932*

## ACI XATİRƏLƏR

Ey əziz oxucum, ey əziz insan!
Uşaqlıq nə qədər gülünc olsa da,
Könül ayrılmayır duyğularından,
Onları arabir gətirir yada
Uşaqlıq nə qədər gülünc olsa da.

Yaxşı yadımdadır, doqquz yaşımda
Ağacdan qotazlı bir at mindiyim,
Aranda, yaylaqda, sular başında
Ağır danışdığım, ağır dindiyim,
Ağacdan qotazlı bir at mindiyim.

Bu dünya sonsuzdur, insanlar da çox,
Hər elin, hər günün öz adəti var.
Bunları yazmağa canda qüdrət yox,
Səsimə səs versin məni duyanlar!
Hər elin, hər günün öz adəti var.

Bir dəstə uşaqdıq qonşuluqda biz,
Bir gəzib, bir durub, bir oturardıq.
Bizə toxunmazdı böyüklərimiz;
Gündə bir qapıda məclis qurardıq,
Bir gəzib, bir durub, bir oturardıq.

Dəmir qarmaqlara soxulcan taxıb,
Kürün sahilində balıq tutardıq.
Bəzən də yuxudan yarımçıq qalxıb,
Aylı gecələrdə sümük atardıq!

Gələndə hər bahar Novruz bayramı,
Hərənin başında bir keçə papaq,
Düşüb qapılara gəzərdi hamı,
Hər çıxan tüstüdən bir pay umaraq.

Yığıb çantamıza yerdən-yemişdən,
Yolda gah yüyürüb, gah ötüşərdik.

Sonra yuvamıza dönüncə birdən
Çul kimi döşənib, yorğun düşərdik...

Bəzən təbiəti biz sevə-sevə
Yemlik döşürərdik qara torpaqdan;
Camışlar belində dönərdik evə
Axşam qaranlığı düşdüyü zaman.

Sizə xoş gəlirmi bu əyləncələr? –
Könül duyduğunu xəyal seyr edər.
Gəlir xatirimə qərib bir axşam
Durnalar başımın üstdən keçəndə.
Yanıb əriyirdi evimizdə şam;
Onlara quş kimi qoşulub mən də
Ən uzaq ellərə uçmaq istərdim,
Evdən baş götürüb qaçmaq istərdim.

İnsan qanadsızdır... Çatıb qaşımı,
İlk dəfə arzusu gözündə qaldım...
Anamın dizinə qoyub başımı
Xəyallar içində yuxuya daldım...

Qurban bayramıydı, gülürdü dağlar,
Qonşumuz xınalı bir erkək kəsdi.
O bayram günündə anamı ağlar
Görəndə, üstümdən bir çovğun əsdi.

Atam oturmuşdu qapımızda tək,
Ömrünün ixtiyar və düşkün çağı,
Zoğal müştüyünü tüstülədərək;
Yenə tökülmüşdü qaşı-qabağı.

Nəydi düşündürən o yazıqları?
Evdə nə ocaq var, nə isti qazan...
Hamıya "gülməzdi" ömrün ruzgarı.
Deyin yanılmasın tarixi yazan!

Bir tərəfdə bayram, bir tərəfdə yas!..
Böylə keçinmişdir dilsiz əsrlər,
Şairim, könülün duyduğunu yaz!
Odur bu dünyada ən böyük əsər.

O gün qonşumuzun oğlu başına
Qoymuşdu bir qara, buxara papaq;
Qüruru sığmazdı uşaq yaşına.
Yanımdan keçirdi tərs-tərs baxaraq.

Mənsə sallamışdım yerə burnumu
Baxıb köynəyimin yamaqlığını,
Deyirdim: "Dünyanın vəfası bumu?
Hamını almayır öz qılığına".

"Uşaq əziz gündə sınmasın", – deyə
Anam cehizliyi yorğan üzündən
Mənə üst köynəyi tikdi hədiyyə.
Mən də iki dəfə öpdüm üzündən.
Ah, mehriban ana! Ah, əziz ana!
O gündən bəridir həsrətəm sana!..

* * *

Günlər boy atdıqca, mən də boy atdım,
Gəlib yetişmişdim on üç yaşıma;
On üç qış keçirib, bahara çatdım.
Bir qara faciə gəldi başıma;
Bir dolaşam vardı, tükləri yumşaq,
Tumarlardım onun qanadlarını;
O körpə quşcuğaz qanad çalaraq,
Gəzərdi göylərin üst qatlarını.

Bəzən öz əlimlə uçurub onu,
Baxardım ardınca dərin göylərə,
Seyr edib havanın göy boşluğunu
Birdən şığıyardı uçduğu yerə.

Meylimi salmışdım o quşcuğaza,
O da ayrılmazdı mənim yanımdan,
Tutardım arabir söhbətə, saza,
Əziz saxlayardım onu canımdan.

Ağzımda çörəyi çeynəyib bəzən
Xırdaca-xırdaca yemlərdim onu.
O aciz heyvanı bəslədikcə mən,
Bilməzdim axrının heç olduğunu.

Bir sabah nə gördüm? Yazıq quşcuğaz
Yoxa çəkilmişdir damın üstündən.
Mahir və sınanmış bir ovçu kimi
Düşdüm sorağına onun o gündən.

Üç gecə yatmadım, üç gün ağladım,
Gəzib dəymədiyim qapı qalmadı.
Dolaşdım bir kəndi mən addım-addım;
Neyləyim? Mən deyən yenə olmadı.

Ümidim kəsildi, əlim üzüldü,
Məni tək buraxdı o əziz sirdaş,
Nə könlüm açıldı, nə üzüm güldü...
Bir axşam yenə də gözlərimdə yaş

Gəzirdim qapıda dodaq büzərək;
Bir paya başından uçdu quşcuğaz,
Hava dalğasında qanad süzərək,
Gəlib sol çiynimə düşdü quşcuğaz...

Gözlərim yaşardı sevindiyimdən,
Elə bil üstümdən dağ götürüldü.
Anam bir muştuluq istədi məndən,
Deyəsən atam da qımışıb güldü.

Bunun arxasınca keçmədi bir az
Gəldi qonşumuzun uşağı Niyaz;

Yanında üç nökər, bir qara tazı,
Qorxudan sığındı mənə quşcuğaz.

“Dulaşa bizimdir, qaytarın geri!”
Gözümdən od çıxdı, başımdan tüstü.
Yapışdım çomağa: “Çəkilin geri,
Yoxsa qan elərəm bu axşam üstü!”

Qızışdı, get-gedə qarışdı ara.
Artıq itirmişdi döyən-döyəni,
Burnumun üstündən aldığım yara
Çul kimi torpağa sərmişdi məni.

Birdən bir vığıltı eşitdim, ah, mən,
Gördüm çapalayır yazıq quşcuğaz...
Ara qarışanda yönəlib birdən
Quşcuğun başını qoparmış Niyaz.

Ah, insafsız adam, vicdanın hanı?
Günahı varmıdır dilsiz heyvanın?
Xəyalım dolandı bütün dünyanı...
Nəyə qıymamışdır əli insanın?

Quşun ayaqları eşir torpağı,
Başı bir tərəfdə... dimdiyində qan...
Quşun qanadları xəzan yarpağı,
Sərilmiş torpağa qırıldığından...

Uşaq xəyalımda bulanır sular,
Gözlərim qaralır həyəcanımdan:
Ah, sınan könüllər, sönən arzular!
Dumanlar, tüstülər çıxır canımdan...

Dolandı həftələr, dolandı aylar,
Kükrədi, sönmədi qəlbimin kini.
Uşaqda bir tərslik, bir inad da var,
Açıb söyləmədim qəlbimdəkini.

Keçdi fürsətimə günün birində
Mənim gözlədiyim o lovğa “düşman”;
Ceyranlar düzündə, oylaq yerində
Sürüşmək istərkən mənim yanımdan,
Belinə, başına çaldım çomaqla,
Dedim: qüdrətimi yadında saxla!

Sonra qalib gəlmiş ordular kimi,
Çomağım çiynimdə yola düzəldim;
Əsdim çovğun kimi, yağdım qar kimi,
Anamın yanına ağ üzlə gəldim.

Fəqət əskilməyir yenə inadım,
Qorxulu xəyallar keçir başımdan...
Elə bil sınmışdır qolum, qanadım,
Mən ayrı düşmüşəm öz sirdaşımdan.

Quşcuğaz məni tərk edəndən bəri
Könül həsrətilə çox ağlamışdır.
Quşcuğaz dünyadan gedəndən bəri
Qəlbim zənginlərə kin bağlamışdır.

Arabir yadıma salsam da onu,
Bambaşqa tarixlər keçir başımdan...
Dəyişdi dünyanın əvvəlki donu,
Ayrıldım get-gedə uşaq yaşımdan.

Ölkələr dolandım, şəhərlər gördüm,
Dənizdən dənizə çapdım gəmimi.
Mən ağlı-qaralı dövranlar sürdüm,
Sizə xəbər verim son həmdəmimi.

Vuruldum o gün ki, şerə, sənətə,
Unutdum sevdiyim əyləncələri.
Aşiqəm insana və təbiətə
Əlim qələm tutub yazandan bəri.

Bəzən xəyalımda gəzir buludlar,
Bir damcı böyüyüb bir dəniz olur...
Dünyanın ölməyən bir qanunu var:
Bir yandan boşalır, bir yandan dolur.

Mənsə bu varlığın içində qaynar
Bir vulkan kimiyəm, gözlərimə bax,
Könül tərlan kimi baş alıb oynar,
Buluddan buluda qanad çalaraq.

İnsanlar dost kimi oxuyur məni,
Sözüm ağızlarda əzbər çəkilir;
Əlimlə qurduğum sənət bağında
Ətirli lalələr, güllər əkilir.

Öylə səfərbərəm, öylə hazıram –
Qarşımda diz çöküb, göylər alçalır.
Bir yanda kağıza mən söz yazıram,
Bir yanda sevgilim piano çalır.

Ömrümün bu əziz günlərində mən
Düz otuz yaşıma girirəm bu yaz...
Fəqət, xəyalımın önünə bəzən
Gəlir yazıq anam, bir də quşcuğaz.

*1935*

## QIZ QAYASI

Düşündürür məni bu sirli diyar,
Burda həqiqətlər, əfsanələr var.
Ürəklərdə axın, qollarda qüvvət,
Burda öz-özünə gülür təbiət,
Burda çiçəklərin, quşların dəmi,
Burda könüllərin əski həmdəmi...
Dumanlar içində duran hər qaya
Göz vurur Günəşə, söz verir Aya.
Dağların döşündən gedən cığırlar
Qalmış babalardan bizə yadigar...
Başını göylərə vurur Şahdağı,
Alınır aləmdə onun sorağı.
Döşündə qaynayan soyuq bulaqlar
Dilsiz əsrlərə xatirə saxlar...
Şair, bu yerləri ayağınla gəz!
Göygölün üstündə haçadil Kəpəz
Deyilmi dünyanın bir ilk gözəli?!
Onu bəzəmişdir xilqətin əli.
Dağların döşündə durur Qarabağ,
Xəyalı gəzdirir hər dərə, hər dağ.
Züy tutur gecələr suların səsi,
Burda çobanların zil şikəstəsi
Hər keçən yolçunu saxlayır yoldan,
Çatır qaşlarını heyrətlə insan.
Ormanlar içində İsa bulağı,
Ondan əskilməyir insan ayağı.
Suyu almaz kimi, göz kimi parlaq,
Qoynunda bəsləmiş onu bu torpaq.
Mən də həyatımın gənclik yaşında,
Sizə söylədiyim bulaq başında
Süfrəmi açmışam, kabab yemişəm,
Baxıb gözəllərə şeir demişəm.
O vaxt əsərlərim ağlamış fəqət,
Könlümə sığmamış qoca təbiət.
Alıb sorağını ötüb-keçəndən,

Gizli bir ilhamın xəyalilə mən
Ahımı salmışam boş dərələrə,
Küsmüşəm o gözəl mənzərələrə,

Sən ey gəncliyimin o ilk çağları!
Sən ey karvanımı qüruba sarı
Aparmaq istəyən cilovsuz külək!
Ey dağılan xəyal, yıxılan ürək!
Unutdum əbədi sizi dünyada.
Bəzən o günləri gətirib yada,
Keçdiyim yollara baxıb gülürəm,
Nələr çəkdiyimi indi bilirəm...

Mən Cıdır düzünü gördüyüm zaman
Keçmişəm gecələr Çanaqqaladan;
Orda dinləmişəm bir qız səsini,
Bülbülün Qarabağ şikəstəsini.
Bir yanda tar səsi, bir yanda qaval...
Boynunu bükmüşdür dağlarda maral.
Çıxmışam dağların göy yaxasına,
Doyunca baxmışam Qız qayasına;
Orda saqqalına yaş dama-dama
Əfsanə söyləmiş bir qoca mana.

“Oğlum, bu dünyanın qocadır yaşı,
Görürsən, dağların ağarmış başı!
Uşaqsan, körpəsən doğrudan da sən,
Böyükdür dünyanın başından keçən...
Bu şəhər adlanır Şuşa qalası!
Torpağın qarğışı, göyün bəlası
Hər zaman bu yerin üstünə yağmış,
Qışında bahar var, baharında qış.
Mənim görmədiyim köhnə bir zaman
Burda sarayların ağası bir xan
Sarı yağ içində üzüb yaşarmış.
Onun əsirləri, qulları varmış.
Oylağı, məclisi hərəmxanalar,
Ardınca qarğarmış onun analar.

Günlərin birində xan çıxmış ova,
Bu ceyran düzündə ov qova-qova
Atını saxlamış bulaq başında.
Kim bilir, o zaman neçə yaşında
Növrəstə bir qızı bəyənmiş o xan,
Ayırmış tərlanı öz yuvasından!..
Saxlamış sarayda o qızı bir qış,
Qız yolub saçını təslim olmamış.
Qızın taleyinin sonuna bir bax:
Bir axşam gecədən oğurlanaraq,
Şəhər kənarına qaçır o pünhan.
Lakin arxasınca adam salır xan...
Həyata son dəfə yumub gözünü,
Qızcığaz qayadan atır özünü.
Lakin deyirlər ki, altdan yuxarı
Qabartmış donunu dağlar ruzgarı.
Qızcığaz ölməyib, sağ düşmüş yerə,
Yayılmış bu xəbər bütün ellərə...
Budur "Qız qayası" adlanmış qaya,
Sirrini verməmiş ulduza, Aya..."

İxtiyar sözünü bitirən zaman
Buludlar töküldü qaş-qabağından.
Ey ana torpağı! Ey əziz Vətən!
Bilirəm dünyada gözlərinlə sən
Nə odlar görmüsən! Bu bir həqiqət,
Lakin küsənməmiş sənə təbiət!

Burda qurulmuşdur böyük saraylar,
Onlara sirr açıb ulduzlar, aylar.
Burda qatar-qatar şose yolları
Atmış qollarını dağlara sarı.
Yolun kənarında çiçəklər, güllər,
Gecəli-gündüzlü ötən bülbüllər
Burda oxuduqca hər qəlbə vüsal
Min toy məslisinə baş çəkir xəyal...

*1935*

# ASLAN QAYASI*

## PROLOQ

Bizim Xəzər sahilində bir qocaman qaya var,
Sinəsində parçalanır ağ köpüklü dalğalar.
Ellər onu əzizləyir, deyir "Aslan qayası",
Məhəbbətdən qurulmuşdur torpağının mayası.
Səhər günəş, nazlı günəş saçlarını yayanda,
Qağayılar sahil boyu əl-üzünü yuyanda,
Ruha gülür bu qayanın mənzərəsi uzaqdan,
O dinləyir şərqisini min günahsız dodaqdan.
Balıqçılar kölgəsində süfrə açır yay günü,
O bəlkə də yaşamışdır min insanın ömrünü...
Yaşamışdır bizim qaya neçə bahar, neçə qış,
Ağızlardan ağızlara dastan olub dolaşmış.
Bu bir şirin əfsanədir babalardan yadigar,
Bunda əziz bir ölkənin vicdanı var, qəlbi var.
Bəşər bütün xəyalında öz ruhunu oxşamış,
Ruzgarlara baş əydikcə su yolunda hər qamış
Bir insanın xəyalilə dastan olur dillərə;
Alqış bizim dastanı bol, söhbəti bol ellərə!
Mən həyatın öz oğluyam – həyat üçün hazıram,
Bizim "Aslan qayası"nın dastanını yazıram:

* * *

Saray qızı Mahniyar
Tanınmış diyar-diyar,
Ağ kəlağay başında,
Qız gəlinlik yaşında
Nə çovğun görmüş, nə qar;
Onu öpüb salamlar
Günəşin ilk işığı;
"Bir elin yaraşığı" –
Söyləyirlərmiş ona.

---
* Poema əlyazması əsasında ilk variantda olduğu kimi verilmişdir.

Gündə ipək bir dona
Bəzənərmiş Mahniyar.
Yanında qulluqçular
Bağçaları, bağları,
Bu düzləri, dağları
At belində gəzərmiş;
Yəhərini bəzərmiş
Düzlərin laləsilə;
Eşqin piyaləsilə
Tanış deyilmiş o qız.
Bəzən də sadə, yalqız
Sığınıb bir bucağa,
Tüstülənən ocağa
Həzin-həzin baxarmış;
Onun mənası varmış...
Qarabağdan, Şirvandan,
Şahlar yurdu İrandan
Çox gələrmiş elçilər,
Nə sevgidən bir əsər,
Nə insaf varmış onda;
Canlar ölmüş yolunda...
Ağ kəlağay başında.
Qız gəlinlik yaşında
Hər gün çıxıb eyvana
Baxarmış dörd bir yana,
Süd kimi ağ bənizi.
Onu Xəzər dənizi
Böyütmüşdür qoynunda.
Gözmuncuğu boynunda,
Döşündə zərli Quran,
Qaydadır babalardan –
Gözələ göz dəyməsin;
Əsən yellər əyməsin
Boy atan bir çinarı...
Dağın soyuq ruzgarı
Soldurmasın o gülü,
Qara geyər bülbülü.

Xan qızıdır Mahniyar
Odur ki, şöhrəti var.
Daha dilbər, daha xoş,
Yemişlər kimi meyxoş
Qızlarımız da varmış
“Böyüklər” almayarmış.
“Gəlin gərək xan olsun,
Böyük ocaqdan olsun.
Quşu tutun yuvadan” –
Bir məsəlmiş o zaman.
Örkən, çatı toxuyan,
Üstü qərmə qoxuyan
Qışın ayazlarında,
Boranında, qarında,
Çiynində yük daşıyan,
Daxmalarda yaşayan,
Gün altında ot biçən,
Gölmələrdən su içən.
Qızlarımız da varmış –
Qocalıb qarıyarmış.
Xan sarayı... Qocalmış,
Xanda nə qüvvə qalmış,
Nə canında ixtiyar;
O, qızına “can” deyə
Başlamışdır hiyləyə:
– Qızım! Gülüm, Mahniyar!
Göz dikdiyim bircəsən,
Qocalmışam, görürsən;
Yoxdur əvvəlki halım –
Ağarmışdır saqqalım.
Nə qolumda qüvvə var,
Nə canımda ixtiyar.
Bax, bu cəlal, bu saray,
Yerdə büsat, göydə ay –
Nəyim varsa sənindir,
Bakı öz vətənindir.
Sənə vəsiyyətim var:
Yurdumuzda knyazlar

At oynatmaq... Aman... Ah!
Göstərməsin qoy Allah!
Suların zümzüməsi,
Quranın Tanrı səsi
Keçməsin yad əllərə.
Qızım! Bizim ellərə,
Dünya kəsilmiş yağı.
Cəlladların ayağı
Kəsilməmiş bu yerdən;
Oğul kimi döyüş sən,
Atıl incik gecəyə,
Vuruş pəncə-pəncəyə!
Ananın doğma yurdu,
Bax, bu saray, bu ordu,
Tüfəng tutan bu ərlər,
Bəslədiyim pələnglər –
Nəyim varsa sənindir,
Bakı öz vətənindir...
Sənə yenə sözüm var:
Şöhrətli, şanlı xanlar
Elçi göndərir sana,
Rəhmin gəlsin atana.
Seç onlardan birini,
Həm də cahangirini,
Qoy qüvvəmiz çoxalsın,
Adım tarixdə qalsın.
Deməsinlər "bizim xan
Düşmənin qabağından
Qaçdı qoyunlar kimi".

– Düz deyirsən, atacan,
Bilirəm ki, atadan
Böyük dünyada nə var? –
Deyə gözəl Mahniyar
Düşünərək arabir
Atasına söyləyir:
– Mən, dəniz qızıyam, adım Mahniyar,
Ellər arasında şan-şöhrətim var.

Bu torpaq, bu hava, bu zəngin Vətən –
Bunları duyduqca, düşündükcə mən
Həyata, varlığa məftun oluram,
Çöllər padşahı Məcnun oluram.
Bilirəm sənin də taxtın, tacın var,
Gözünü dikmişdir ona yağılar...
Fəqət şöhrət üçün, xaniman üçün,
Qanlarla yoğrulan bir zaman üçün
Qoparıb qəlbimi ata bilmərəm,
Çul kimi döşənib yata bilmərəm...
Çox da güvənməsin gücünə xanlar,
Mənim də qəlbim var, arzularım var:
Əlimlə tikdiyim bax bu ağ çuxa
Hansı bir igidin əyninə olsa,
Bir də ağ atımı kim minə bilsə,
O şah da deyilsə, xan da deyilsə,
Olsa da adi bir qapı nökəri
Onundur qəlbimin gizli telləri...

Ay dolanıb, il döndü,
Çox igidlər öyündü,
Güvəndi şöhrətinə,
Malına, dövlətinə,
Göz dikdi Mahniyara.
Yayıldı hər diyara
Bir gün yeni bir xəbər;
Dedilər ki, bir səhər
Başlanacaq imtahan,
Hansı igid bir oğlan
Ağ atın üstə minsə,
Ağ çuxanı geyinsə
Onunkudur Mahniyar.

Bu xəbəri alanlar
Şamaxıdan, Şəkidən,
Lənkərandan, Ləkidən,
Qarabağdan, Şirvandan,
Şahlar yurdu İrandan

Bığıburma cavanlar,
İgidlər, pəhləvanlar
Bakıya üz tutdular.
Hey atdılar, tutdular –
Tüfəng tutan, ox atan,
Atın qarnına yatan,
Başı üstə mil duran,
Quşu dimdikdən vuran
Suyu balıq kimi tən
Yarıb içindən keçən
Yığışıb dəstə-dəstə
Gəldi Bakının üstə.
Sədd çəkildi dörd yana,
Ağ at gəldi meydana.
Əvvəlcə lovğa bir xan
Ağ atın cilovundan
Tutub, bir şillə vurdu –
O, atı qorxudurdu.
Ətraf baxırdı mat-mat,
Cilovu dartaraq at
Qulağını şəklədi,
Əlilə təpiklədi
Xanın qarnını birdən,
Qışqırdılar dörd yerdən –
Yıxıldı torpağa xan,
O gəlmişdi İrandan.
Sonra bir dəliqanlı
Gözləri həyəcanlı,
Ürəyində fırtına,
Atın yastı sırtına
Sıçradı birdən-birə.
Ağ at yataraq yerə,
Ağnadı, basdı bunu,
Qan apardı burnunu...
Dağıstanlı pəhləvan
Yaxın gəldiyi zaman
Hamını heyrət aldı,

Mahniyar da saraldı.
Tutub atın boynunu,
Burmaq istərkən onu
Ağ at öz vərdişilə,
Kəmərindən dişilə
Yapışdı birdən-birə.
Onu da vurdu yerə.
Gəl, ey qaçaq Aslanım!
Gəl, ey qoçaq Aslanım!
Gəl ki, meydan sənindir,
Tülək tərlan sənindir!
Baş əymədin xanlara,
Sığındın ormanlara.
Yurdun oldu yaylaqlar,
Durna gözlü bulaqlar.
Adın düşdü dillərə,
Bayraq oldun ellərə.
Cütçülərin ağzında,
Aşıqların sazında
Dinlədik dastanını.
Ellər qəhrəmanını
Oxşar, sevər ürəkdən.
Sənə uğur deməkdən
Qüvvət aldı analar,
Elin böyük qəlbi var.
Aslan gəlir çaparaq,
Ağ at qulaq çırparaq,
Tanıyır qəhrəmanı.
Deyir o günlər hanı?
Aşıb dağdan, dərədən,
Uçardın üstümdə sən.
Bir gün tora saldılar
Məni səndən aldılar
Gəl, ey qaçaq Aslanım!
Gəl, ey qoçaq Aslanım!
Gəl ki, meydan sənindir,
Tülək tərlan sənindir.

Aslan süzür o xanı...
Geyinir ağ çuxanı,
Qalxır atın belinə.
At dönür dağ yelinə
Uçur düzdə quş kimi,
Dardan qurtulmuş kimi.
Sonra dönür geriyə,
Dik yeriyə-yeriyə
Duranlara baş əyir,
Xanın kefinə dəyir
Ki, üstün gəldi Aslan;
Səs çıxmadı xanlardan...

Sevinərək Mahniyar
Boylanır xumar-xumar.
Taleyindən küsür xan.
Onun qaş-qabağından
Bulud yağır elə bil!
Çünki qaytaran deyil
Verdiyi vədəsini:
"Çölün bir gədəsini"
Çağıracaq "kürəkən!"
Demək, bir səhər erkən
Qovuşdu sevgililər,
Doğan ətirli səhər
Öpdü, öpdü onları:
Dağların da ağ qarı
Hey əridi mum kimi.
Həyat bir zəqqum kimi
Görünürdü o xana,
İçindən yana-yana
Dedi: – Qızım! Mahniyar!
İndi nə muradın var?
Qaçaq Aslan sənindir,
Saray da vətənindir.

O gündən, oxucum, keçdi sənələr,
Keçdi bu dünyanın başından nələr!..

Toplar guruldadı, saraylar yatdı,
Bunları insanın əli yaratdı.

Gəlinlər, qocalar, qızlar, qarılar,
Beşikdə çağalar, ömrü yarılar
Cidalar ucunda parçalandı hey,
Ölkə dağıdıldı, el talandı hey...
İnsanlar bezikib, cana dayandı;
Qurunun oduna höyüş də yandı.
Taladı elləri yırtıcı xanlar,
Günəşin altında göl kimi qanlar
Qaynaya-qaynaya buxara döndü.
Qapılar bağlandı, ocaqlar söndü,
Ay da buludlarda gizlənib yatdı,
Bunları insanın əli yaratdı!..

Günlərin birində əsən küləklər
Gətirdi Bakıya acı bir xəbər:
"Bakının hakimi Hüseynqulu xan
Səhər yuxusundan ayılan zaman
Bütün dövlətini, bütün varını,
Şəhər qalasının öz açarını
Knyaz Sisyanova təslim verməli!
Yoxsa, ordumuzun dağıdan əli
Sizin də ölkəni yandıracaqdır,
Yerdə padşahların dediyi haqdır".

Şəhər kənarında durmuş ordugah
İsti bir dumana bürünmüş sabah.
Sabahın qoynunda min sızıltı var,
Yorğun piyadalar, atlı ordular
Azacıq dincəlir...
Fəqət kənarda,
Düşünən gözləri bir intizarda
Bir saldat əyləşmiş, seyr edin onu,
Bağrına basaraq dilli qarmonu,
Dərdini söyləyir ötən dillərə:

“Mən niyə gəlmişəm bu yad ellərə?
Görəsən neyləyir bizim tək qarı.
Yenə gözləyirmi uzaq yolları?
Mən evdən çıxanda boş qaldı anbar –
Bu ilki vergiyə getdi taxıllar...
Lap soyub taladı bizi mülkədar,
Böyük Rusiyada səadətmi var?
Nədir çəkdiyimiz bu ölüm, bu qan?
Qırıb tökdüyümüz deyilmi insan?
Neçin göz yaşına batsın analar,
Deyin, bu qanunda ədalətmi var?
Yox... düz atmayacaq əlim gülləni...
Qarı son nəfəsdə gözləyir məni.
Mən evdən çıxanda boş qaldı anbar –
Bu ilki vergiyə getdi taxıllar...”
Yayılır ətrafa qarmonun səsi,
Təmiz bir vicdanın saf zümzüməsi
Gəzir könülləri söz yaza-yaza...
Çuğul xəbər verir bunu knyaza.
Knyazın əlləri çox batmış qana,
Saldatı tutdurur gülləbarana.
Buna şahid olur hər dağ, hər dərə,
Bir cənub axşamı, mavi göylərə
Dikildi saldatın ala gözləri...
Sizə danışdığım o gündən bəri
İstisi sönməmiş o qardaş qanı
Oldu könüllərin şeir dastanı.
Başına and içir Sisyanovun çar;
Yorğun piyadalar, atlı ordular
Daşınır gecələr Qafqaza sarı.
Darğın bir ölkənin qara qaşları
Çatılmış yay kimi kinlərlə dolu,
Gözləyir yağının gəldiyi yolu.
Sisyanov – o döşü medallı knyaz!
O alçaq, o çəngli-cidalı knyaz...
Çarın sədaqətli, yaxın nökəri,
At üstündə qılınc vurandan bəri

Yayılmış şöhrəti bütün Qafqaza.
Çar xeyli güvənir məğrur knyaza.
Almış sifarişi Hüseynqulu xan,
İldırım tökülür qaş-qabağından,
Qolları qüvvətsiz, ömrü ixtiyar,
Oynayır gözündə qara buludlar.
Düşünür gecəni sabaha qədər,
Ağarır dan yeri, açılır səhər
Fəqət sahilləri döyür dalğalar,
Saray qarşısında bir izdiham var.
"Ah, zalım xan! Zalım xan!
Sən qorxub öz canından
Yurdu versən hər yada,
Kor olasan dünyada!
Bir xan da artsa əgər
Çoxalacaq vergilər.
Yorulduq işləməkdən,
"Allah, Allah" deməkdən
Tez çağırın Aslanı.
Yığsın eli, obanı,
Sel olsa da qanımız,
Qurban olsun canımız
Bu sünbüllü çöllərə –
Bu mehriban ellərə!
Ah, zalım xan! Zalım xan!
Sən qorxub öz canından
Yurdu versən hər yada,
Kor olasan dünyada!"

Knyazın ordusu yetişib həmən
Bürümüş şəhəri dörd bir tərəfdən.
Xansa fikirlərə qərq olub, naçar
Sorur nökərlərdən: – Hardadır açar?
Aparın! Aparın, verin knyaza;
Güvənsin Rusiya böyük Qafqaza.
Selin qarşısını almaq olarmı?
Tüfəngli çıxmağın mənası varmı? –

Özünü irəli verərək Aslan
Deyir: – Qoy açarı mən aparım, xan!
Xansa qəzəblənib bağırır.
– Apar!
Əl çalıb oynasın gələn ordular.
Knyazın başında bir qara dəstə
Gəlir yavaş-yavaş sarayın üstə.
Durur salamına saraydakılar.
(Öyünmə! Gecənin gündüzü də var...)
Aslan qarşılayır onları, naçar
Knyaza "baş əyir" əlində açar.
Qırılır qəlbində sədəfli bir saz;
Başını dik tutan o məğrur knyaz:

"Sadiq qullarına şöhrətli çarın
Knyaz Sisyanovdan salam aparın!" –
Deyərək, açara qürurla baxır...
Aslanın başından tüstülər qalxır,
Qan onun beyninə sıçrayır birdən.
Açarı knyaza təslim edirkən
Çalır xəncərini onun köksünə.
Alqış tarixdəki o şanlı günə!
Al! – deyir – payını, soruşma nədir –
Çara "qullarından" ilk hədiyyədir!..

Döşü medallı knyaz,
Cəngli-cidalı knyaz
Boyanmışdır al qana.
Salam Azərbaycana!
Gələn o qara bulud,
Ölüm rəngli o tabut
Artıq çəkildi yoxa
Bizim Ağ at, ağ çuxa.
Halal olsun Aslana!
Onu böyüdən ana
Dağların maralıdır,
Sorsanız haralıdır:

Salam Azərbaycana!
Boyanmışdır al qana
Döyüş medallı knyaz,
Cəngli-cidalı knyaz,
Tez yayılır bu xəbər,
Qaçır dünən gələnlər
Aylıq yolu bir gündə.
Axır suyun üzündə
Kakartlı göy şapkalar...
Gecənin gündüzü var...
Qaçır çar orduları,
Gilavarın ruzgarı
Toz qaldırır göylərə,
Seçilməyir dağ, dərə;
Amansızdır küləklər.
Qalır toplar, tüfənglər,
Qurşunlar, dinamitlər;
Sarı paqon zabitlər
Qucaqlayıb suları,
Qaçır şimala sarı.

O gündən, oxucum, keçdi sənələr,
Keçdi bu dünyanın başından nələr!
Çarın orduları ikinci dəfə
Hücuma başladı Bakı tərəfə:
Gecə sakit, gecə lal,
Gecə qərib bir xəyal...
Qaralmış pəncərələr,
Kiçik dağlar, dərələr
Qara sükuta dalmış.
Elə bil ki, qocalmış
Bu yerlərdə təbiət.
Xəzər dinməyir, əvət,
O da sakit, o da lal.
Gecə qərib bir xəyal...
Xan sarayı pərişan.
Nə işıqdan bir nişan,

Nə günəşdən soraq var.
Yatır saraydakılar...
Arabir ixtiyar xan
Ayılır yuxusundan,
Dilində bir soyuq ah,
Ya da “Ey böyük Allah!”
Yenə yuxuya gedir,
Bu aləmi tərk edir.

Yatır gəlin Mahniyar,
Nə gözəl görkəmi var
Gözəllərin yuxuda!
Bir ölümdür yuxu da.
Şəhərdə yoxdur Aslan,
Verəcəkdir yurdu xan.
Gecənin qəlbi qara,
Cecəni yara-yara
Gəlir səssiz ordular.
Gecənin vicdanı dar...
Nə ulduz var, nə də Ay,
Yuxuya getmiş saray.
Ordu dolur şəhərə,
Az qalmışdır səhərə.

Başlanılır vurhavur;
“Al payını, qaçma, dur!”
Şarak-şarak-şara-rak –
Güllələr şığıyaraq
Dolur pəncərələrdən.
Cavab gəlirsə hərdən,
Sarayda qüvvə yoxdur;
Qaçanlar daha çoxdur.

Tez oyanır Mahniyar
Gözündə fırtınalar.
Görür saray od almış,

Nə bir köməkçi qalmış,
Nə Aslandan bir xəbər...

Bunu qopan küləklər
Xəbər verir Aslana,
O sınanmış aslana.
Ağ at uçur quş kimi,
Dardan qurtulmuş kimi.

Qızı görür yağılar...
Şahin kimi Mahniyar
Atılır pəncərədən,
Alovlar uda-uda.
Onu tutur havada
Mehriban, güclü bir əl,
Deyir ki, Aslanam, gəl!

Aman, Ağ at! Can, Ağ at!
Gah sıçra, gah yerə yat!
Bizi vermə düşmana,
Apar çıxar bir yana!
Ağ at gedir çaparaq,
Nalından od qoparaq.
Arxasınca ordular,
Hər tərəfdə ölüm var...
Havadan qurşun yağır,
Hava qurşundan ağır.
Bu düzlərdə Ağ at tək,
Keçdiyi yol daş-kəsək.
Heyrət o qanlı günə!

Bir qayanın üstünə
Gəlib çıxdı bizim at.
Üstündə iki həyat –
İki duyğu, iki qan...
Dənizin dalğasından
Sahillər zağ-zağ əsir,

Qaya əsir, dağ əsir.
Qabaq – dibsiz qara su,
Arxa – düşmən ordusu.
Laçın kimi Mahniyar
Gözündə fırtınalar
Deyir: – Aslan, əzizim!
Son günümüzdür bizim.
Düşmənlər gördü bizi.
Tutub hər ikimizi
Zindanlara salacaq,
Kim ölüb, kim qalacaq!
Dözməkdənsə bu dərdə,
Namusumuz əllərdə
Didilməsin, aman, ah!
Dəniz bizə son pənah!..
Sür Ağ atı dənizə,
Dəniz anadır bizə;
Udsun bizi dalğalar! –
Deyə, gəlin Mahniyar
Göz gəzdirir son dəfə
Günəş doğan tərəfə...

“Aman, Ağ at, can, Ağ at!
Dənizin qoynuna yat!
Bizi vermə düşmana!”
Bir ruh gəldi Aslana.
Öpərək Mahniyarı,
Vurdu dənizə sarı
Atını dik qayadan,
Ağ at sıçradı əlan
Köpüklü dalğalara,
Suları yara-yara
Azacıq qol atdılar,
Gözdən itib batdılar,
Onlar çəkildi yoxa,
Bir də Ağ at, ağ çuxa...

O gündən titrədi yurdun üstündə
Cütbaşlı qartalın qanlı bayrağı.
Tarixin doğduğu o qara gündə
Böyük bir ölkənin söndü çırağı.

O gündən göründü sarı paqonlar,
Boşaldı kəndçinin dolu xırmanı.
Elləri qurd kimi taladı onlar
Dedilər, padşahın sağ olsun canı.

O gündən ağladı aşığın sazı,
Dilində can yaxan dərdli haraylar.
Uçan durnaların küskün avazı
Ötdükcə dişnədi yıldızlar, aylar.

Buludlar çaxnaşdı, hava daraldı,
Cumalar* dolaşdı bizim elləri.
Bizim ipəkləri Peterburq aldı
Bəzəndi knyazın madmazelləri.

O gündən saraldı yaşıl təbiət,
Axdı həzin-həzin Kür çayı, Araz.
Baş əydi qanuna kitab, şəriət,
Ürəklərdə zədə, baxışlarda yas.

Tər içdi, qan uddu motal papaqlar,
Son dana, son çuval getdi vergiyə...
Vağlandı qapılar, söndü ocaqlar,
Qarılar, qocalar yalvardı göyə...

Çəkdi qamçısını azğın mülkədar
Ver dedi! Ver dedi! Çıxar belindən!
Göydə bir Allahdır, yerdə də bir çar,
Qabarlar tökülsün sənin əlindən.

---
* Hamballar

Satdı mənliyini “əsilzadələr”,
Çarın xidmətinə baş əydi Quran.
Bütün gördüyümü danışsam əgər,
Kağızım qurtarar, yorular insan.

Yüz il biz ayrıldıq ana dilindən,
Məktəbin adına dedik “uşkola”.
Oxucum! Bir daha nəzər yetir sən
Keçdiyin o qanlı, o qorxunc yola.

Yüz il Füzuliyə həsrət qalaraq
Doğma anamıza söylədik “mama”.
Yüz illik yuxuya birdən dalaraq
Yatdıq gözümüzdən yaş dama-dama.

Yüz il nəfəsini çəkə bilmədi
Şairlər oylağı böyük bir ölkə.
Yüz il öz qolunu çəkə bilmədi...
Tarix! Səninkidir bu qara ləkə!

Axdı Rusiyaya neft kəmərləri,
Daşıdı onları ilk dəmir yolu...
Tarixə hökm edən o gündən bəri,
Çalışdı yadlara Azərin oğlu.

O gündən qaraldı göydə buludlar,
Bir günəş doğmadı Azərbaycana.
O gündən saraldı çiçəklər, otlar,
Gəmimiz çıxmadı varıb bir yana...

## EPİLOQ

Sevgilim! Sahilin dəmi var yenə,
Gəl çıxaq dənizin axşam seyrinə.
Dəniz gülümsəyir bir saf üz kimi,
Təbiət şadlanır ömrümüz kimi.

Küləklər dağıdır buludu lay-lay,
Dənizdə parlayır gümüş rəngli ay.
O da göz qoyaraq bizim gəncliyə,
Göyləri seyr edir “azadlıq” – deyə.
Odur bax! Yazdığım “Aslan qayası”,
Silinmiş alnından ellərin yası...
Onun sinəsində oxuyur bir quş,
Quş deyil, bir qızdır adı “qurtuluş”.
Dilində Vaqifin gözəlləməsi,
Yayılmış ətrafa onun zil səsi,
Bir gənc də baş qoymuş onun çiynınə;
Burda sevgililər zövq alır yenə
Vətən torpağının azadlığından.
İnsan – azadlıqdır, azadlıq – insan!

*1935*

## BULAQ ƏFSANƏSİ

Deyirlər, bəşərin çocuqluq yaşı
Daima titrəmiş ölümə qarşı...
Ölüm! O matəmin pərişan səsi,
İnsanın ilk dərdi, ilk fəlsəfəsi,
Açarsız, qapısız dəniz kimi lal,
Üstündə çırpınıb, döyünmüş xəyal...
Onun dəhşətini duyduğu zaman
Şaşırmış cəbhədə bəzən qəhrəman...
Bəzən də yaşamaq həvəsilə tək,
Bir insan ətrafa qılınc çəkərək
Bütün bir ordunu heyrətə salmış,
Xeymələr dağıdıb, çadırlar almış.
Ölüm! o matəmin pərişan səsi,
Bəşərin ilk dərdi, ilk fəlsəfəsi
Düşündürür bizi bu gün və yarın.
Böyük dahilərin, filosofların
Duyub düşündüyü bu qorxunc cahan,
Sirlər yuvası olmuş hər zaman.

Onun qüvvətilə düşür xəzəllər,
Şairin ilhamı – dilbər gözəllər
Onun pəncəsilə torpağa dönür,
Parlayan bir həyat onunla sönür.
Sanma ki, qorxuncdur ölüm daima,
Onda da gizlənir bir canlı məna.
Onsuz bu dünyanın olmazdı sonu,
Səadət və həyat yaratmış onu.
Onsuz açılmazdı şüur və xəyal,
Donardı bir yerdə arzu, ideal.
Onsuz açılmazdı yeni çiçəklər,
Uçmazdı düzlərdə ağ kəpənəklər.
Onsuz dəyişməzdi ulduzlar, aylar,
Göylərin altında məğrur saraylar
Verərdi hökmünü gündə bir qana –
Qılınca, süngüyə, topa, qalxana.
Düşməzdi şahların tacı başından,
Küsərdi hər şeyə könül və insan;

Hər əski ənənə, hər əski adət,
Məhəbbət, iztirab, gülüş, qiyafət,
Məncə, bıqdırardı bəşəri hər an,
Eyni dodaqlarla gülən bir cahan...
Ölümlə çarpışır, axır kainat;
Ölüm də başqa bir sevdalı həyat!
Onda qərinələr, onda nələr var!
O məchul aləmi çox aramışlar,
Fəqət, sorağını alan olmamış.
Yenə öz yerində hər bahar, hər qış...
Bəşər xəyallara qapılıb hərdən
Təsəlli bulmuşdur əfsanələrdən...

Deyirlər, Şirvanda bir bulaq varmış,
Suyu almaz kimi par-par axarmış.
Gözəlmiş bulağın yar-yaraşığı,
Oynarmış üstündə günün işığı,
Düşərmiş qoynuna zərif kölgələr
Deyirlər, bu sudan Xıdır peyğəmbər
Gəlib, təsadüfən içmiş doyunca,
O gündən ölməmiş tarix boyunca.
İnsan donundakı o qanadlı quş
Əsrlərdən bəri uçub, yox olmuş.
Fəqət, deyirlər ki, o yenə sağdır;
İslamın dar günü qayıdacaqdır.
Bu əski əfsanə gülünc olsa da,
Qalmış əsrlərcə qoca dünyada.
Bulağın şöhrəti düşmüş dillərə,
Yayılmış bu xəbər uzaq ellərə...
Aramış elçilər yerini bir-bir,
Almış sorağını İskəndər Kəbir,
Sürüb karvanını gəlmiş Şirvana,
Adamlar salaraq dörd bir yana,
Arayıb, axtarıb heç yorulmamış,
Bulaqdan bir əsər, bir iz bulmamış.
Həsrətli gözlərlə bizi tərk etmiş,
Fəqət, karvanını yükləyib getmiş...

*1935*

## TALISTAN

İxtiyar dağların döşündə meşə,
Qayalar yüksəkdən baxır keçmişə.
Ağaclar baş-başa çatılmış burda,
Günəş salam verir bu doğma yurda.
Sürürəm atımı üzü yuxarı;
Bu qarlı dağların ağ buludları
Könlümü ardınca çəkib aparır,
Yüksəyə qalxdıqca sinəm qabarır...
Burda ağ suların xoş nəşidəsi,
Hər budaq üstündə bir quşun səsi...
Top, tüfəng səsləri batandan bəri
Gəzir qayalarda dağ keçiləri.
İşıqdan, insandan xeyli aralı
Hər axşam mələyir dağlar maralı.
Göydə fanar kimi işıq salır ay,
Buludlar açılır, örtülür lay-lay...
“Ay ellər!” – deyirəm ürəyimdən mən,
Ömür cavanlaşır ellər deməkdən.

Ormanlar içində durur Talıstan,
Ona bir baxışda vurulur insan.
Günəş bu yerlərdə qalxır atına,
Yüksəlir göylərin yeddi qatına.
Bu yurdun havası, suyu sərindir,
Keçdiyim dərələr göydən dərindir.
Baxdıqca insanın gözü qaralır,
Şair olmayan da xəyala dalır...
Burda süd kimidir dağların qarı,
Sallanır qayadan buz salxımları.
Qayalar, qayalar, quş qonmazsınız!
Məhəbbət anlamaz, söz qanmazsınız!..
Burda əsrlərdən yadigar qalan,
Üstünü çiskinlər, dumanlar alan
Böyük bir qala var: dörd yanı hasar,
Daşında paslanmış əski yazılar.

Kimdir o sənətin böyük ustadı?
Ölməz sənətkarın, sənətin adı.
Göz qoyun bu yerə, bir yadigardır;
Hər batan axşamın bir adı vardır...

Mən ellər oğluyam! Ellər canımdır,
Xəyalım, sənətim, həyəcanımdır.
Çayların ahəngi axır qanımda,
Çiçəklər öpüşür hər dastanımda;
Hər bulaq, hər gülüş, hər yaşıl yarpaq,
Bu sünbül, bu əkin, bu daş, bu torpaq,
Bu çovğun, bu külək, bu söhbət, bu saz,
Ətirlər içində “gəl!” deyən bu yaz,
Bağrından su sızan dəlikli daşlar,
Göydə qanad çalan havalı quşlar,
Çayların üstündə süzən sonalar,
Qəlbi dağlar kimi böyük analar
Mənim qismətimə düşmüş əzəldən;
Tarixlər zövq alır yaradan əldən...

Burda boy atmışdır Talıstan dağı;
Donur dumanlarda quşun ayağı.
Qızıl gül kimidir isti yanaqlar,
Heyrət içindədir gələn qonaqlar.
Burda insanların xoş baxışından,
Yazından, yayından, qarlı qışından.
Könül xumarlanır, ilham canlanır,
İnsanın başında dağ dumanlanır;
Xəyal qanadlanır, uçur uzağa...
İnsan birnəfəsə dırmanır dağa;
Döyüntü bilməyir burda ürəklər.
Səyirdir atını qopan küləklər.
Genişdir oylağı, gendir meydanı
Enəndə çaylağa dağın dumanı,
Dumanlar içində dağ da sürünür,
Hər qaya örpəkli bir qız görünür;
Burda bilinməyir dünyanın yaşı,

Fırlanır əski bir dəyirman daşı.
Axır qıjıltıyla Talıstan çayı,
Göydə ulduzların neçədir sayı?..

Bənövşə toplayır çöldə uşaqlar;
Hər ağac altında göz-göz bulaqlar
Axır almaz kimi, göz yaşı kimi,
Yığışıb çay olur dərənin dibi.
Əriyir yaz günü quzeydəki qar,
Gəzir dağ döşünü gəlinlər, qızlar;
Hər bulaq başında bir söhbət olur,
Gah gözaydınlığı, gah qiybət olur.
Hər axşam kökləyir aşıq sazını,
Daşıyır könlündə elin nazını.
Dinir Füzulinin şirin qəzəli...
Əli çənəsində ellər gözəli
Dinləyə-dinləyə "oxay"lar deyir.
Canına yağ kimi yayılır şeir.
O bir şəlalədir axır ürəkdən...
Burda bir haşiyə çıxmalıyam mən:

Sənin bu gənc yaşında
Dayanmışam qarşında,
Torpağında, daşında
Məhəbbətin dadı var,
Ulduzların adı var.

Bənzəyirsən gülə sən,
Ömrün boyu gülməsən.
Qoca vətən, gənc vətən!
Bu qüvvətin var olsun!
Sənə salamlar olsun!

Nə bəy qaldı, nə də xan,
Ölüm keçdi yaxandan...
Qəlbim kimi alış, yan
Qızıl bayraqlı vətən!
Çox borcluyam sənə mən.

Yerinin alt qatında
Dəmir də var, altun da.
Hər daşının altında
Bir şairin qəbri var,
Min ananın səbri var.

Ləkəsizdir vicdanın,
Əzəldən safdır qanın!
Hər müqəddəs ananın
Laylasında həyat var,
Ölsün inanmayanlar!

Zəncirin yox, qalan yox,
Yurdsuz anan, balan yox,
Dilində bir yalan yox,
Ləkəsiz ruhunla sən
Bakirə qız kimisən!

Gəlsin yoldaş mühəndis
Bu yeri də gəzək biz,
Qızıl, gümüş, dəmir, mis
Torpaqda pas atmasın,
Tənbəl-tənbəl yatmasın!

Bizə bu dağ, bu dərə
Təslim olsun bir kərə –
Əl dəyməmiş yerlərə
İşləsin qüvvətimiz,
Sözümüz, söhbətimiz.

Şair, bu yerləri yaxından tanı!
Təbiət quranda Azərbaycanı
Onu sığallamış qüdrətin əli
Bir böyük ürəkli qüvvətin əli.
Yazıq! Bu gözəllik, bu bahar, bu qış
Əsrlərcə yatıb yuxuya qalmış...
Qədrini bilməyən kəndli qardaşım,

“Azca aşım, – demiş, – ağrımaz başım...
Çayların suyunda yumuş özünü,
Ömründə bilməmiş hamam sözünü.
“Təvəkkül” sözləri dilində əzbər,
Açmış qapısını vaxtsız ölümlər.
Yerini əyri bir çubuqla sürmüş,
Gözilə dünyada nə odlar görmüş!
Başında hər zaman bostan əkilmiş,
Gözünə bir qara pərdə çəkilmiş...
Əllərində qabar, gözəllərində qan,
Bir qarın yeməmiş qazandığından.
Həyəti, qapısı, dalanı palçıq;
Körpə uşaqların baldırı açıq,
Titrəyə-titrəyə girmiş tonqara.
Onun gövdəsinə daraşan yara
Təbibsiz, davasız simlər atmışdır;
Oğulsuz analar yasa batmışdır.
Gəlinlər sığınmış cindara, fala;
Bir el tapşırılmış bir “ağsaqqala”.
Budur, Talıstanın sıx ormanları
Mənə xatırladır o zamanları.
Həyat bu yerlərdə sakit axarmış,
Hər kolun dibində bir oğru varmış.
Keçən karvanları soyub talayan,
Dağların başında ocaq qalayan,
Hər axşam bir evə basqına gələn,
Yırtıcı qurd kimi öldürüb, ölən
Ellərin yağısı o vəhşilərdən
Bir nişan görmədim Talıstanda mən.
Tüfənglər bağlıdır, qılınclar qında,
Kəndlimiz yer sürür ay işığında.
Deyirəm: Bu yerdə dilənçi varmı?”
Deyirlər: “Kolxozda aclıq olarmı?”
Oturmuş qapıda məktəbli bir qız,
Əlində bir qələm, bir parça kağız,
Dumanlı dağlara boylanıb durur,
İndidən sadəcə rəsmlər qurur.

Onun da ruhunu oynadır sənət,
Qoynunda bəsləmiş onu təbiət.
Çatılmış yay kimi qara qaşları,
Yığılmış başına qız yoldaşları;
Bir deyib, bir gülüb, aşıb daşırlar,
Bəzən kəklik kimi qaqqıldaşırlar.
Gözlərdə yaşamaq, gülmək həvəsi,
Bəzən də göylərdə bir matros səsi...
O ağ buludları doğrayıb biçən,
Bu qəlbi dağların üstündən keçən
Bizim təyyarəyə dikilir gözlər,
Yüyürür ardınca bu sadə qızlar,
“Ay qız! Ay Pərican! Ona bax, ona!
Sürən ya Leyladır, Ya da ki, Sona!
Sağ əli başıma! Bir mən də... mən də...”
Gülür bu nəşəylə çöl də, çəmən də.
Gülür nəslimizin qızıl bayrağı.
Gülür dumanlarda Talıstan dağı.
Kəndi dolaşıram yedəyimdə at,
İçimdə bir qüvvə əmr edir: yarat!
Bu böyük günlərin adını sən yaz!
Ötür könüllərdə min sədəfli saz;
Bu ellər, bu günlər səni səsləyir,
O ilk sevgisini sənə bəsləyir;
O deyir – mənim də şairim vardır,
Şeirsiz bir cahan xarabazardır...
Cavab ver bu səsə! Doğmadır bu səs!
Çörək itirənə ar olsun əvəz!..
Kəndi dolaşıram yedəyimdə at,
İçimdə bir qüvvə əmr edir: yarat!
Qarşıma müxtəlif insanlar çıxır,
Kefimi soruşur, əlimi sıxır.
Hər gələn qapıma qonaq düş, – deyir,
Bu ağ günlərimlə gəl öpüş, – deyir.
Mənim təbiətə bir sualım var:
Ölərmi bunları görən sənətkar?
Axşamdır, qaralır göyün həşyəsi,

Canlanır bu dəli suların səsi.
Böyük bir həyətdə iclasımız var,
Sükut içindədir sonsuz yamaclar...
Bu ayrı dağları baş-başa çatın,
Günəşə, ulduza kəməndlər atın!
Qanun da sizdədir, yer də sizdədir,
Ölkənin taleyi əlinizdədir!
Qolunu çırmasın igid oğullar,
Dağılsın bu daşlı, kəsəkli yollar!
Çəpərlər aradan bir-bir sökülsün,
Palçıqlı yollara çınqıl tökülsün.
Talıstan yolları düzəlsin dümdüz!
Burda seçilməsin gecəylə, gündüz –
Axşam elektrik lampalar yansın,
Onun işığına quşlar oyansın.
Sanma ki, məqsədim boş yaraşıqdır,
Cahanda ən böyük qüvvət işıqdır,
İşıqdır o günəş, işıqdır o ay!
İşıqsız könülün taleyinə vay!
Onsuz açılmazdı ətirli səhər,
Donardı dəryalar, sərin küləklər.
Onsuz qızarmazdı nə alov, nə şam,
Daima kor kimi gəzən bir axşam
Zümrüd şəhərlərə həsrət qalardı,
Qaranlıq həyata qanad salardı.
Nə çirkin, nə gözəl bilinməzdi heç,
Könül təbiətə küsərdi tez-gec.
Olmazdı sənətdə gözəllik sözü,
Düşərdi qüvvədən insanın gözü.

Ormanlar içində durur Talıstan,
Ona bir baxışda vurulur insan!
Qayalar az qalır göylərə dəyə...
Boylanıram yaxın bir gələcəyə;
Yenə yerindədir dağlar, dərələr,
Xəyalı güldürən xoş mənzərələr,
Çıxır seyrəngaha qızlar, analar.

Ağaclar içində təzə binalar
Baxın, durna kimi cərgələnmişdir,
Göydən yer üzünə nur ələnmişdir!
Böyük pəncərələr günəşə doğru;
İsti mədənlərin çalışqan oğlu
Burda saf havalar udur ürəkdən,
Taxır sinəsinə güldən, çiçəkdən,
Açır süfrəsini bulaq başında,
Ömrünün bəxtiyar, azad yaşında
Gözüylə seyr edir, zövq alır qəlbdən,
Sərin hovuzlardan, fəvvarələrdən.
Yaratmış bunları işçinin əli,
Yaratmış bu günün böyük əməli!..

Gecə də, gündüz də qaynayır həyat,
Həyatdan zövq alır qoca kainat.
Mənim təbiətə bir sualım var:
Ölərmi bunları görən sənətkar?

*1935*

## BƏSTİ

Yurdumuz silkinib çıxalı yasdan,
Aldım sorağını Kürdən, Arazdan;
Adına bağlayım bir yeni dastan;
Gözümdə canlanır xəyalın sənin!

Sənmisən ömründə hiylə bilməyən?
Artıq danışmayan, artıq gülməyən?
Qəlbi düşündürür duyduqca bəzən,
Bu ağır duruşun, kamalın sənin!

Səndə qüdrəti var böyük bir elin,
Təmizdir vicdanın, doğrudur dilin.
Qəlbində qalmamış nə Tanrı, nə din,
Həyata başqadır sualın sənin!

Laləli çöllərdə doğruldan da sən
Tərlan səhərlərin ilk müjdəsisən;
Baxıb hünərinə, saz tutanda mən
Açılır gül kimi camalın sənin!

Gözündə parlayır qaynar bulaqlar,
Könül duyduğunu xatirə saxlar;
Əlilə göstərir səni uşaqlar,
Şairə bənzəyir bu halın sənin!

Sən bir günəş kimi yandıqca yerdə,
Xəyalım ev tikir mavi göylərdə;
Bir qələm çəkmisən ömürlük dərdə,
Bir də gəlməyəcək zavalın sənin!

Anan səni doğanda adına "Bəsti" dedi,
"Əllərimi bir fələk oğuldan kəsdi", – dedi.
Beləydi qayda bizdə... Qız doğanda analar
Baxıb qara geyərdi su üstündə sonalar;
Yazıq qadın utanıb, qızarardı ərindən,

Min bir varaq qopardı könlünün dəftərindən;
Deyərdilər: "Qız nədir? Qazancı yox, varı yox,
Vəfası yox, qəlbi yox, aşiqə ilqarı yox,
Özgə şamı yandırır... Bu gün-sabah gedəcək,
Köçəri quş kimidir, oylağı tərk edəcək".
Bizim cahil babalar xor baxardı qadına,
Deyərdilər toy günü gəlninin sağlığına.

"Anam, bacım qız gəlin,
Əl-ayağı düz gəlin!
Yeddi oğul istərəm,
Bircə dənə qız, gəlin!"

Yenə tarix açıldı xəyalımda uzaqdan,
Dünya mənə göründü bir qaranlıq otaqdan.
Ah! müqəddəs analıq! Nələr gəlmiş başına,
Axar sular qarışmış günahsız göz yaşına...
Sən boy atıb qalxanda zindanlara atıldın,
Qoçulara, bəylərə bir qul kimi satıldın.
Hər yediyin xörəkdə min acılıq duyardın,
Qonağının, ərinin ayağını yuyardın.
"Nəzakət" sayılardı bu çirkin əyləncələr...
Saçlarının rənginə bənzəyirdi gecələr.

Sən ey sular sonası!
İnsanlığın anası!
Mehribandır qucağın,
Saf vicdanın böyükdür!
İşığı çox sönükdür
Sənsiz yanan ocağın.

Gün aşiqdir üzünə,
Ay həsrətdir gözünə,
Bəşər səndən doymamış;
Kim başını qoymamış
O mehriban dizinə?

Çal qəlbimin sazını,
Aç ömrümün yazını.
Kim çəkir gənc yaşında,
Gecə beşik başında
Körpələrin nazını!

Bil ki, təmizdir südün,
Bir məktəbdir öyüdün.
Sənə layiq bir əsər
Yazmamışdır şairlər
Ah, nə dünən, nə bu gün.

Biri dedi: "Mələksən",
O biri də: "Çiçəksən".
Sən ey könül dildarı!
Bir-bir desəm onları
Dinləyib, güləcəksən.

Ağ üzünə "ay" dedi,
Qaşlarına "yay" dedi,
Yazmadı zəhmətindən,
Qəmindən, möhnətindən,
"Günlərini say" dedi...

Sən xırmanlar başında,
Torpağında, daşında,
Əlində sarı başaq,
Dalında körpə uşaq
Saraldın gənc yaşında.

Dinmədin toyda, yasda;
İnək sağdın ayazda.
Möhnət oldu sirdaşın,
Asta-asta göz yaşın
Axdı Kürdə, Arazda...

Bilmədi qurtuluş var
Bizim yazıq analar.

Nə bir səmir, nə bir səs...
Onlara oldu qəfəs
Soyuq hərəmxanalar.

Keçdikcə ömrün yaşı,
Dərddən ağardı başı.
Baxıb o solğun gülə,
Əliylə atdı çölə
Onu vicdan oynaşı...

Sən ey müqəddəs ana!
Nə yazsam azdır sana.
Ruhuna güldü gündüz,
Şerimi gül kimi düz
Səhər-səhər yaxana!

Ac qaldığın yaman gün,
Ürək sinəndə sürgün...
Qızdırmalar canında,
Yetimlərin yanında
Çöllərdən qırp döşürdün.

Sən qəlbini, ey qadın,
Yumaq kimi bağladın!
Baxtın saçından qara...
Baxıb-baxıb sulara,
Layla deyib, ağladın:

"Eləmi harayından,
Oyanın harayından,
Gündə bir kərpic qopur
Ömrümün sarayından".

Bəsti! Qələm çəkdik o günlərə biz!
Günəşdən pay aldı azad nəslimiz.
Dəyişdi suların əvvəlki səsi,
Dəyişdi dünyanın ilk xəritəsi.

Azad yurdumuzda nə şam qaralır,
Nə dağlar başını duman, qar alır.
Öldü tanrıların səfil röyası,
Doğdu ömrümüzün qızıl dünyası.
Sənin də gözünə düşdü aydınlıq,
Ömürlük zindandan çıxdı qadınlıq.
Dahilər yaradan ey böyük ana,
Şerimin hər sözü alqışdır sana!
Alqış, o boyasız, rəngsiz üzünə!
Alqış, o hiyləsiz, təmiz sözünə!
Alqış, əmdiyimiz halal südünə!
Bu gün də borcluyam hər öyüdünə...
Səndə təbiətin saflığı vardır,
Səni duyan könlüm nə bəxtiyardır!
Həyatın şeridir gül yanaqların,
Günəşdən rəng alır al dodaqların.
Sözün doğrusunu deyim ürəkdən:
Vurğunam mənalı gözəlliyə mən,
Silkinib çıxmasa qadın mətbəxdən
Nə azad ana var, nə azad Vətən!
Bu söz parladıqca bir şimşək kimi,
Açıldı rəngimiz bir çiçək kimi.
Şərqin göylərində günəş parladı,
Sevindi analıq, qadınlıq adı.
Atıldı ellərin başından qara,
Qaranlıq gecələr çəkildi dara...
Artıq saçlamayır səni qoçular.
Hər yerdə, hər dildə danışığın var,
Baxıb yurdumuza ilham alırsan,
Göydə quşlar kimi qanad çalırsan.
Çiçəklər rəng çalır o gül bənizdə,
Qüvvətin görünür yerdə, dənizdə.
Qızıl bir əsgər tək sən də hazırsan!
Xalça toxuyursan, şeir yazırsan.
Bu yeni qəlbinlə, şüurunla sən
Bizim kəndimizdə müəlliməsən.
İnək də sağırsan – bu ar deyildir,

Yaradan əllərin hüququ birdir.
Canlanır yenidən sönən hər həyat,
Nə gözəl yaraşır sizə ağ xalat!
Uşaq bağçasından keçirdim dünən,
Göz qoydum oynaşan körpələrə mən.
Onlar eşitməmiş nə din, nə millət.
Dodaqlar deyirdi yalnız: məhəbbət!
Bir qələm qaşlı qız yığıb onları
Bir-bir göstərirdi xoş oyunları,
Bu gənc mürəbbiyə gülərək hərdən,
Baxıb zövq alırdı bu körpələrdən,
Baxıb göz olurdu öz balası tək
Silinsin tarixdən doğma və ögey!
Bəsti! Səninkidir tərlan səhərlər!
Deyir tərifini kəndlər, şəhərlər –
Deyir bizim Bakı, bizim Moskva,
Sənin şöhrətini dalğalı hava
Aparmış, bilirəm, bu gün hər yana:
Hində, Fələstinə, Ərəbistana.
Yuvası, oylağı ölüm qoxuyan.
Bu gün də kor kimi Quran oxuyan
Şərqin gözəlləri eşidir səni,
Baxıb arzulayır bizim Vətəni...
Azadlıq uğrunda çarpışır insan,
Şərqin səhərləri qalxmış yuxudan.
Qoy ölsün Adəmdən qalan bir adət,
Azadlıq yaşasın, bir də səadət!
Bəsti! Günəş kimi təmizdir üzün,
Sən ilk yavrususan bizim gündüzün!
Sənindir obalar, sənindir ellər,
Ətəyi yellənən pambıqlı çöllər,
Sənindir havası sərin yaylaqlar,
Ceyranlar su içən soyuq bulaqlar,
Sənindir səhərin ülkər ulduzu,
Sən ey yurdumuzun qəhrəman qızı!
Sənindir insanlıq, sənindir vicdan!
Asılmış gül kimi günəş yaxandan.

Sənindir şairin şeri, ilhamı,
Mənim kimliyimə şahiddir hamı.
Ey, ana yurdumun gözəl gəlini!
Mən ki məhəbbətlə sıxdım əlini;
Bu dostluq, qardaşlıq, söylə, var olsun!
Unutsaq bu eşqi, bizə ar olsun!
Qoy yazsın başqası – karset geyinən,
Ərinin üstünə gündə deyinən,
Gündə min rəng alan, min cildə girən,
Yanında fors üçün tula gəzdirən,
Çəkdiyi pudranı üzündə satan,
Marmelad dodaqlı, ruhu şarlatan
Meşşan qadınların "gözəlliyindən".
Səninsə şairin yaranmışam mən!
Mən səni yazmadım "dili məzəli",
Yazmadım "kef quşu, məclis gözəli";
Mən səni yazmadım nə "cin", nə "mələk",
Biz ki, özümüzük, bunlar nə gərək?
Yazmadım "dolanım, dönüm başına".
Sən rəva görməzdin öz qardaşına.
Bu yağlı sözlərin sonunda hər an
Atılmış qadına min qara böhtan;
Satılmış xanlara bir balıq kimi,
Sonra da kirlənmiş bir yaylıq kimi
Atılmış o bizim yazıq analar.
Tarixin alnında nə damğalar var!..
Bəsti! Yorulma gəl, hələ qulaq as!
Yenə şairliyim qızışır az-az;
Könlüm Qırat kimi dönmüş ağ yelə,
Qızışır getdikcə uzaq mənzilə.
Düşmən danışmasın başından yekə...
Anamdır sevdiyim bu qızıl ölkə.
Vicdanım ləkəsiz, üzüm də ağdır,
Boş keçən bir günüm olmayacaqdır.
Bu ellər bağında doğma bir quşam,
Azad nəğmələrçün yaradılmışam...
Olmuş ilk ilhamım bu qızıl bayraq,

Gün kimi parlayan baxtıma bir bax!
Cavabsız qalmamış hələ sualım,
Hay vurur, qıy vurur tərlan xəyalım...

Ah səhər-səhər
Doğanda ülkər,
Bəsti, qoluna
Güvənir ellər.

Sən düzləri tək
Ətəkləyərək,
Vurur sinəndə
Böyük bir ürək.

Gülür çiçəklik,
Hər qaya, hər dik.
Sənə söz qoşur
Xınalı kəklik.

Alnında titrər
Puçur-puçur tər,
Nə yazsa azdır
Min sinədəftər.

Sən yığın-yığın
O ağ pambığın
Yaradanısan,
Zəhmətə sığın!

Keçdi qara qış,
Bahara alqış!
Sən ey qəhrəman,
Günəşlə yarış!

Buludu lay-lay
Doğrayanda ay,
Sən yükləyirsən
Pambığı tay-tay.

Həyatdır əmək,
Daha nə deməк,
El sənin anan,
Sən ona kömək...

Ey azad qadın,
Gözləri aydın!
Mən nə yazardım
Sən olmasaydın?

Borcluyam sana,
Ey böyük ana!
Hələ bu dərdim
Qalsın bir yana.

Açıldı yazım,
Söhbətim, sazım;
Sən hünər göstər,
Mən şeir yazım.

Məsləkimiz bir,
Aləmə bildir!
Şair həyatsız
Şair deyildir.

Artıq yuvan var,
Elin, oban var.
Tarın danışır –
Min bir havan var.

Azaddır dilin,
Azaddır elin.
Bir də, sevgilim,
Bükülməz belin!

Səhər-səhər gül,
A saçı sünbül!
Desin şərqini
Şair və bülbül.

Bəsti! Bizim bu dağların,
Şır-şır axan bulaqların
Üzərinə gün doğalı,
Nəşəsi var yaylaqların.

Ölsün, dedik, hər möhnətə,
Qanad verdik məhəbbətə.
Hər qapıda bir bağ salaq,
Hörmət olsun təbiətə!

Qoy açılsın min bir çiçək,
Qızıl güldən ətir çəkək;
Təbiəti bolşeviklər
Gəlin kimi bəzəyəcək.

Bizimkidir uca dağlar,
Dünya qədər zövqümüz var.
Qoy yollara kölgə salsın
Cərgə-cərgə boylu çinar.

Başa salın kommunxozu;
Daş yolların olmaz tozu;
Dörd tərəfdən gül bürüsün
Hər kolxozu, hər sovxozu!

Aşıb-daşır elin varı,
Kolxozumun ilxıları.
Tutaq boğaq içimizdən
Köpək oğlu ziyankarı.

Düşmən girir "şirin dilə",
Üzümüzə gülə-gülə
O daraşır ac qurd kimi
Bağçamızda qızılgülə.

Faşist bizi "yada salır",
Qanlı gözü çox qaralır.
Xırdaca bir sirrimizi
Min qızıla satın alır.

Hər cəbhədə ayıq-sayıq
Əsgər kimi durmalıyıq!
Yoxsa gedib dəyər daşa
Dəryamızda üzən qayıq.

Taqsırımı deyim, düzü,
Batan deyil haqqın sözü –
Bəzən görə bilməmişdir
Şairin də açıq gözü.
Bəzən məni hər yad baxış
Dönə-dönə “alqışlamış”.

O gün xallar vurdu qəlbimizdə tar.
Bir günəş parladı gözlərimizə,
Açdı qapısını səadət bizə...
Yolda dörd gün bizi oxşadı hava.
Bizə “buyur” dedi qızıl Moskva.
Moskva! Dünyada ən böyük şəhər!
Onun daşlarında həyat gülümsər.
O bir dəniz kimi çalxanır hər an,
Günün batmağını duymayır insan.
Beyinlər işdədir, əllər işdədir,
Moskva hər zaman bir gərdişdədir.
Burda duyğuları oxşayır hər şey,
Oxşayır gözləri burda hər muzey, –
Bizə xəbər verir qərinələrdən.
Bəsti! O yerləri dolaşmısan sən!
Şığıyır quş kimi yeraltı qatar,
Başının üstündə ağır binalar,
Dəyişmiş Moskva – əski Moskva,
Ruhları güldürür burdakı hava.
Üzünü görmədim zər paqonların,
Görmədim balını dvoryanların;
Mən burda görmədim nə keşiş, nə çar,
Bunları nəql etdi bizə qarılar.
O gün zəncirlənmiş kilsəli şəhər,
Bu gün səhər kimi ruha gülümsər.

Mən burda görmüşəm min bir yadigar,
Varaqla tarixi, gör bir nələr var!
Moskva ömründə geyməmiş qara,
Əyməmiş başını Napalyonlara...
Çoxdur Moskvanın yaradan əli,
Burdadır Puşkinin böyük heykəli.
Tatyana Larina təbiət qızı,
Onegin o qızın ilk vəfasızı
Günlər keçirmişdir burda bir zaman;
Mazurka rəqsinin gurultusundan
Aynalar titrəmiş – hardadır onlar?
Yaşadı ömrünü sərxoş salonlar...
Cütbaşlı qartalın sındı qanadı,
Silindi tarixdən onun son adı.
Xəyalım dönərək yenə tərlana,
Yenə də baş çəkir Qızıl Meydana...
(Başqa bir şairin sıxıldı qəlbi,
Yıxıldı daşlara boz sərçə kimi).

...Bəsti! Nə xoş keçir bizimlə dövran...
Var olsun dövranı, belə yaradan!
Bu şair könlümün bir şüarı var:
Ölsün yurdumuza xain çıxanlar!
Bununla qurtaraq bu şerimizi,
Başqa temalar da gözləyir bizi.

*1937*

## YAZLA QIŞIN DEYİŞMƏSİ

Yenə fikrim seyrə çıxdı yer üzünü başdan-başa,
Dünya böyük bir tamaşa...
Hər şey mənə tanış, – dedim,
Baxıb, baxıb, danış, – dedim,
Könül adlı ilk sirdaşa!
Bu dağ mənim, o dağ sənin, gəzdim yeri qarış-qarış,
Nələr açdı bu axtarış...
Ey səadət səninkiyəm!
Dünya deyir mən ikiyəm –
Sağımda yaz, solumda qış.
Yaz nə deyir: – Bağlarım var, güllərim var çiçək-çiçək,
Qoxla məni, ətrimi çək!
Mənə könül bağlayanlar,
Hər sirrimi saxlayanlar
Boran üzü görməyəcək.
Mehribanlıq beşiyimdir, yerim bağça, yurdum bağdır,
Alnım açıq, üzüm ağdır.
Çoxdur sərin bulaqlarım,
Göy çəmənli yaylaqlarım;
Qəlbim isti, canım sağdır.
Adım yazdır, gələndə mən axar çaylar daşa-daşa
Haray salar dağa, daşa...
Seyrə çıxar oylağımı,
Hər bağçamı, hər bağımı
Sevgililər qoşa-qoşa.
Mən açmışam bu dünyada qızıl gülün yanağını –
Evimin ilk qonağını.
Anasıyam bu güllərin,
Süsənlərin, sünbüllərin.
Mən açmışam bülbüllərin
Nəğməli ney dodağını.
Adım yazdır, şöhrətim var tərifində şairlərin.
Havalarım sərin-sərin.
Gülüşüyəm dost üzünün,
Min bir bahar gündüzünün.

Məndən öyrən yer üzünün
Mənasını dərin-dərin!
Al qumaşa bəzənmişəm gəlin kimi başdan-başa.
Yaranmışam bir tamaşa!
Bəxtiyardır analarım,
Suda üzən sonalarım;
Göydə uçar durnalarım
Qaqqıldaşa-qaqqıldaşa.
Cənnət ki, bir uydurmadır, gəl gör nədir çiçəkliyim!
Qızıl güldür köynəkliyim.
Mənimkidir bu meşələr,
Qıvrım telli bənövşələr.
Kollarımda turac gəzər,
Xanalıdır hər kəkliyim.
Ayın, günün, ulduzların yaranma bir sirdaşıyam,
Səadətin qardaşıyam.
Bizim bu qarlı dağların,
Qəlbi vüqarlı dağların
Əyilməyən dik başıyam!
Adım yazdır, gələndə mən yağış yağar narın-narın,
Ruhu gülər torpaqların...
Günəş bizə qonaq gələr,
Kölgəsində quş dincələr
Əl boydakı yarpaqların.
Hər il bizi gülə-gülə qarşılayır May bayramı,
Seyrə çıxır o gün hamı;
Bütün qızlar geyir dümağ,
Yanaqları çıraq-çıraq.
Əllərdəki qızıl bayraq
Qurtuluşun ilk salamı.
Tərlanlarım, qırğılarım qanad çalır göy havada,
Toy qurulur min yuvada;
Bütün dərdlər unudulur,
Söhbət olub, saz tutulur
Ağır elli hər obada.
Adım yazdır, qucağımda nə boran var, nə də ki qar,
Qapılardan qaçır azar.

Mehribanam yaranmışa.
"Gəlmə" deyir, qara, qışa
Məxmər telli bu yoncalar.
Bəzən mənə qara bulud düşmən kimi baxar, gedər,
Şimşəklərin çaxar, gedər.
Çox sevirəm mən gündüzü,
Qaranlığın o dar gözü
Sərxoş kimi axar, gedər.
Günəş mənim ilk anamdır, istisi var saf qanımda,
Axar sular dörd yanımda.
Görən mənə heyran qalar,
Şair məndən ilham alar
Könlün tərlan zamanında.
Görməmişəm pis üzünü nə hicranın, nə möhnətin,
Beşiyiyəm məhəbbətin.
Kefim sazdır, damağım çağ,
Yaratmışdır üzümü ağ
Gözəl əli təbiətin.
Mən gələndə bu düzlərdə ceyran qaçar, quzu mələr,
Dilə gələr lal dərələr;
Qış əriyər yana-yana...
Sinəsini açar mana
Örtüsü ağ pəncərələr.
Təmiz havam təzələyir ciyərini insanların,
Gözəliyəm dastanların.
Güllər olur iç köynəyim,
Dərmanıdır hər çiçəyim
Təbiblərin, loğmanların.
Artıq azad baxışların gözlərimdə işığı var...
Keçdi çovğun, əridi qar.
Yaşıl dağlar atlaz geyir;
Baxıb-baxıb, "gəncəm" deyir
Ağ birçəkli ixtiyarlar.
Dodaqlarım səhər-axşam söhbət açır səadətdən,
Bu şeirdən, bu sənətdən!
Qurtuluşun mənəm yolu.
Can qurtardı insan oğlu

Həmişəlik əsarətdən.
Qoy var olsun bu dünyada azad könül, azad bahar,
Qayıtmasın o zindanlar!
Qapımızda casus duran,
İnsanlara qan udduran
O zamanlar, o zamanlar!..
Qələm çəkdik keçmişlərin o qaralmış üzünə biz!
Qoy var olsun bu nəslimiz!
Mehribanam hər yoldaşa.
İyirmi il vurdum başa,
Qəlbim isti, qanım təmiz.
Adım yazdır, yazılmamış taleyimə nə dərd, nə qəm...
Səhərlərin ney səsiyəm;
Könlümdədir sədəfli saz;
Soran olsa: – Nədir bu yaz?
Deyin: – Sovet ölkəsiyəm!
Qış nə deyir? – Mən faşistəm, yaranmışdır üzüm qara.
Zülm edərəm insanlara;
Qan içirəm, həzz alıram,
Bu dünyanı mən salıram
Boranlara, tufanlara.
Mən tökərəm çəmənlərə, gülşənlərə soyuq qarı,
Talan olur elin varı;
Diş ağardıb güləndə mən,
Kəfən geyib gələndə mən
Bağlayıram qapıları.
Adım qışdır, əzəl gündən bir qardaşam canavara.
Paltarım ağ, içim qara.
Dərd andırır hər mənzərəm,
Şaxtanı mən gətirirəm
Səhərlərə, axşamlara.
Saraldıram bülbüllərin yuvacığı – yarpaqları,
Dondururam torpaqları.
El demişkən – qara qışam,
Mən uğursuz yaranmışam,
Soldururam çəmənzarı.
Atam boran, balam ölüm, budur mənim öz sənətim,

Yamanlıqlar təbiətim.
El bilir ki, amansızam,
Neron kimi vicdansızam,
Yoxdur qəlbim, məhəbbətim.
Adım qışdır, özüm faşist, mən gələndə sular donar,
Səhralara quzğun qonar.
Nə duyğum var, nə ürəyim;
Əsən kimi sərt küləyim
Yarpaq tökər boylu çinar.
Mən gələndə görünməyir göydə süzən qaranquşlar –
Yaz gününə yar olmuşlar;
Dilim: “Boran, boran!” deyər,
Baxıb mənə “ilan” deyər
İncə ruhlu yaranmışlar.
Adım qışdır, özüm faşist, mən aləmi saldım səsə.
Gündə min yol kəsə-kəsə
Əsəcəkdir boranlarım.
Ağır-ağır zamanlarım,
Günəş məni əritməsə...
Şair deyər: – Bu qara qış qurda qardaş yaranalı,
Yemək istər istiqbalı.
Çox sevirik canımızdan,
Ətimizdən, qanımızdan,
Bizim böyük istiqbalı...

*1937*

## AYIN ƏFSANƏSİ (AYBƏNİZ)

Ay gözəllik çadırını açıb, buludlarda,
Yenə bizim ay başına dolanırkən buludlar da
Gözlərimə göz dikərək gəlib baxdı pəncərəmdən,
Bu gözəllik elçisinə heyran olub dedim ki, mən:
– Nədən az-az görünürsən?
Cavabımda susdu bir az.
Sonra xumar baxışilə canlar alan o sərvinaz
Gözlərimə yenə baxdı,
O dinmədi... Utancaqdır...
O bəlkə də öz qəlbini başqasına açacaqdır?!
Lakin onun sifətində bir solğunluq nişanı var,
Məncə onun bu dərdini dərd çəkənlər duyub anlar...
Dedim: – Susma, gözəlim Ay! Deyiləm ki, mən özgəsi!
Mənə tanış yaranmışdır şadlıq neyi, hicran səsi.
Əzəl gündən dolanmışam Yer üzünü qarış-qarış;
Məndən gizli bu dünyada bir sinədə söz qalmamış.
Sevinənlər, dərdlənənlər öz qəlbini açar mana,
Mənim varlıq nəfəsimdən torpaqlar da gələr cana,
Çünki insan yaranmışam.
Yenə baxdı üzümə Ay,
Arxasınca qoşun çəkib buludlar da gəldi lay-lay.
Sonra, bir az gülümsəyib dilə gəldi Ay da bu dəm:
O dindikcə ağ kağıza inci düzdü qızıl qələm.
Dedi: – Az-az görünməyim nədən sizə ağır gəlir?
Dedim: – Çünki bu dünyada gözəlliklə söz yüksəlir
Gözəlliksiz bir sənətin nə duyğusu, nə canı var.
O dırmalar qulaqları, balta kimi odun yarar
Ay üzümə yenə güldü... Tez açıldı qaş-qabağı,
İşıqlandı səhər kimi xəyalımın söz otağı.
Dedi: – Az-az görünməyim küskünlükdən nişanədir.
Dedim: – Bir az açıq danış, bu sözünün sirri nədir?
Dedi: – Sən ki, dilbilənsən, düşmədinmi məni başa?
Dedim: – Bəzən varlığıma hakim olan bir tamaşa
Uçurduqca yer üzündən xəyalımın qanadını,
Unuduram hər canlının, hər cansızın öz adını.

Cəhalətin pəncəsində boğulduqca qəlbim yenə,
Bir kor kimi boylanıram bu mənalar aləminə
O vaxt mənim şüurum da, xəyalım da qaçır məndən,
Qayıq qalır fırtınada, dalğalara düşür yelkən...
Ay yenə də gülümsədi... Saçlarını dağıdaraq,
Dedi: – İnsan qəlbindəki sadəliyə, saflığa bax!
Sən ki, bizim ilk görüşdə öz sirrini dedin mənə;
Mən də bütün varlığımı açacağam bu gün sənə.
Dedim: – Buyur, şad olaram!
                                        Sarılaraq Ay boynuma,
Bir günahsız quzu kimi gəlib girdi o qoynuma.
Dedi: – Mənim küsməyimin başlıca bir səbəbi var,
Qoy eşitsin bu sirrimi şair olub, söz yazanlar...
Bilirsən ki, mən gözələm, dastanlara düşmüş adım,
Yarandığım gündən bəri bağlanmamış qol-qanadım.
Bir qocaman şahidiyəm bu varlığın əzəl başdan,
Çünki mənmi varlığım da yoğrulmuşdur sudan, daşdan.
Çox gəzmişəm bu dünyanı oba-oba, oymaq-oymaq,
Kim istəyir bu neməti öz əlindən yerə qoymaq.
Mən doğanda göy üzünə, qaçıb gedir qaranlıqlar,
Gözəlliklə əkiz olan bir qüvvətim, qüdrətim var.
Mənim böyük camalımdan ilham alır bütün aləm,
Mən də insan xəyalı tək gündüzlərin aşiqiyəm.
Lakin bizim şairlərdən incimişəm sözün düzü,
Onlar bəzən düz görməyir nə gecəni, nə gündüzü.
Onlar elə zənn edir ki, gözəllik bir oyuncaqdır,
Hər "sevirəm!" deyən gəncə o da aşiq olacaqdır...
Elə mənim özümə də qəlb açmışlar min bir kərə,,
Mən nə deyim? Nə ad verim o ötərgi vədlərə?
Onlar baxıb ilham almış yalnız mənim zahirimdən,
Lakin onlar bilməmişdir bir nəçiyəm batində mən.
Onlar məni bənzədərək min gəlinə, min də qıza,
Arabir də oxşatmışlar hər ötərgi vəfasıza.
Hətta böyük Puşkin belə bir vaxt mənə söz atmışdır,
O da məni göy üzündə ağılsıza oxşatmışdır.
Lakin duyan olmamış ki, mənim öz aləmim vardır,
Bu səbəbdən ürəyimdə dünya boyda qəmim vardır.

Ah, nə deyim şairlərə! Öz döşünə döyə-döyə
Xam at kimi təpik atıb, sığışmırlar yerə, göyə.
Bir demirlər mən nəçiyəm, yarandığım gündən bəri,
Nələr görmüş bu dünyada Ay deyilən gözəl pəri?!
Mənim də öz dastanım var, mənim də macəram vardır,
Bu dünyada macərasız ürəyi daş olanlardır.
Düzdür, insan yaranmadım, baxtım belə yazılmışdır,
Bu səbəbdən bağrım başı bir dumanlıq, bir də qışdır.
Lakin mənə çox tanışdır insanlığın böyük səsi,
Bir də nəyə toxunmamış o dahinin xoş nəfəsi?
Dünya karvan yaranmışsa, insan oğlu bir sarbandır,
Bəşər qəlbi göyə sığmaz, onun fikri bir ümmandır.
Qoy şairlər vurulmasın yalnız mənim camalıma,
Baxıb dastan bağlasınlar bu gözəllik kamalıma!

Ay kiriyib dayandı.
Qəlbim yandı, nə yandı!
Tüstü çıxdı başımdan.
Bu gözəl sirdaşımdan
İlham alıb mən bu dəm
Dedim: – Düzsən, ey sənəm!
Sənin də ürəyin var,
Qəlbin var, diləyin var.
Fəqət, bilmirəm niyə
Sən deyən dərinliyə
At çapmayır şairlər?
Bəlkə tükənmiş hünər?
Ay çatıb qaşını “Yox” – dedi birdən,
Qəzəblə oynadı durduğu yerdən.
Dedi: – Nə deyirsən, uşaqsan, nədir?
İnsanın hünəri bir xəzinədir.
Nə qədər xərcləsən dünyada onu,
O da vaxt kimidir – görünməz sonu!
Lakin bu hünərin qədrini bilmək
Hər hünər əhlinə borc olsun gərək!
Dedim: – Düz deyirsən, ay nazlı sənəm!
Haman şairlərin biri də mənəm...

Mən də təbiətdən yazıram bəzən,
Sonra ağrı qopur öz ürəyimdən.
Görürəm gözlərim baş-ayaq vurur,
Bəzən quş yerinə dağ-daş uçurur,
Bəzən gül yerinə tikan deyirəm,
Göyün qurşağına örkən deyirəm.
Bəzən ağ buludu yazıram qara,
Baxıb gülüşürlər mən sənətkara.
Hanı təbiətin dilini bilən?
Gözəl Ay! Qarşında utanıram mən.
Ay yenə hirslənib "yox!" – dedi birdən,
Qəzəblə oynadı durduğu yerdən.
Dedi ki, insafsız olma bu qədər,
Yenə az olsa da, səndədir hünər.
Yenə sən bilərsən eşqin dilini,
Mən şahid tutaram öz sevgilini!
Yenə sən sevirsən bu təbiəti,
Ucuz tutmayırsan şeri, sənəti,
Yuxulu gecələr çox az yatmısan,
Mən kor deyiləm ki, saç ağartmısan –
Deyib xumarlandı ayın gözləri,
Sığındı qoynuma o gözəl pəri.
Baxdı gözlərimə gülümsəyərək,
Sinəmdə quş kimi çırpındı ürək
Mən elə bildim ki, ürəyim acdır,
Məhəbbət əbədi bir ehtiyacdır!
Sonra solğun üzlü o dərdli sənəm
Xəyala qərq oldu gözlərində qəm.
Nəysə pıçıldamaq istədi mana,
Lakin utanaraq çəkildi yana.
Axdı yanağına iki damla yaş,
Dedi: – Salamat qal! Gedirəm, qardaş!
– Yox, – dedim! – Bir dayan! Hələ sözüm var!
Gəl mənə bir danış, ey nazlı nigar!
Sən ki, yaranışdan gözəlsən belə,
Bir dastan olmusan ağıza, dilə,
Aləmə səs salır hüsnün, camalın,

İndi də bildim ki, çoxdur kamalın.
Nədir üzündəki qara ləkələr?
Anlada bilsəydin bunu birtəhər...

Ay çatıb qaşını birdən qaraldı,
Sanki gözlərində dünya daraldı.
Süzülüb sel kimi axdı göz yaşı,
Yazığın köksünə sallandı başı.
Bulandı siması bir dərya kimi,
Ümidsiz, nəşəsiz bir dünya kimi.
Mən peşiman oldum öz sualımdan,
O mənim halımı görüb bu zaman
Hə!.. – dedi, – gəlmisən mətləb üstünə.
İndi mənə qulaq as,
Nə danışsam, onu yaz!
Heç sorma ki, bu nədir?
Bəlkə bir əfsanədir.
Dedim: – Danış, tez danış!
Daha səbrim qalmamış.

Ay qaldırdı başını,
Silərək göz yaşını
Dedi: – Yaxşı qulaq as!
Nə danışsam onu yaz:

Bizim dövrümüzdən nə qədər qabaq,
Nə mavi göy vardı, nə qara torpaq.
O vaxt nə həyatdan vardı bir əsər,
Nə dağlar, dərələr, nə də meşələr.
Nə yaşıl yarpaqlar, nə də xəzəllər,
Nə bulaq başında seçmə gözəllər.
Nə məhəbbət sözü, nə hicran dərdi,
Nə də qəm karvanı axıb gedərdi.
Dünya görməmişdi bir damlacıq qan,
Nə bir canlı vardı, nə də bir insan.
Nə sərhəd seçkisi qoyan ölkələr,
Nə qanlı qanunlar, nə məhkəmələr,

Nə bir ağa vardı, nə də ki, bir qul,
Nə zəngin yaşardı, nə də ki, yoxsul.
O vaxt görməmişdi dünya göz yaşı,
Hər başın üstündə bir qəbir daşı!
Nə də yer üzündə ayrılıq vardı,
Dövran öz-özünə gəlib axardı.
Günəş anam idi, mən onun qızı,
Dünya salamlardı ilk baxtımızı...
Ondan şəfəq alıb nura boyandım,
Mən onun eşqilə alışıb-yandım.
Anamın bir ana ürəyi vardı,
O mənim boyumu öpüb oxşardı,
Yanımdan getməzdi fikri, diləyi;
Bəzən dil açaraq ana ürəyi
Deyərdi: – Ay adlı bir balam vardır,
O məndən dünyaya ilk yadigardır.
Mənsə sığınardım onun qoynuna,
Salıncaq qolumu atıb boynuna
Üzündən öpərdim onun doyunca,
Yorulmaq bilməzdim illər boyunca.
Anam bu sevgidən min zövq alardı.
Sonra ucaldıqca hey ucalardı...

* * *

Bir gün axşam çağında,
Göylərin qucağında
Anam oturmuşdu tək,
Mənsə yaxın gələrək
Acam, – dedim, – anacan!
Onun qaş-qabağından
Tökülürdü buludlar...
Dedim: – Ana, de nə var,
De nə var ki, belə sən
Dərdlə fikirləşirsən?”
Anam üzümə baxdı,
Qəlbindən qanlar axdı.

Heç soruşma, – dedi, – gəl!
Bunu bilsəydim əvvəl
Heç doğmazdım səni mən,
Deyərək gözlərindən
Sellər kimi yaş tökdü,
Qəlbinə zülmət çökdü.
Mənsə döndüm, doğrusu,
Ana, – dedim, – nədir bu?
Mən ki, sənin hər zaman
Gözəl üzündə bir dəm
Nə dərd görmüşdüm, nə qəm.
Sən ki, əzəldən bəri
Şad gəzərdin göyləri;
Tutulmazdı qabağın;
Sənin o gül dodağın
Hər vaxt gülərdi mana.
Can ana! Söylə, ana!
Söylə nə oldu ki, sən
Azad gülüşlərindən
Ayrı düşdün? De görək!
Anam bir ah çəkərək
Dedi – Bala! Qulaq as:
Analar dərdsiz olmaz!
Sən deyirsən acam mən
Süd gəlməyir döşümdən...
Yalnızam... Yoxdur ərim;
Qurumuşdur döşlərim
Ac-acına durmaqdan.
Azdan-çoxdan bir zaman
Nə yığmışdımsa bütün
Yedik qurtardı bu gün.
Tamam boşaldı anbar,
Bircə təknə unum var.
Ah, qızım! Mən baxtı kəm
O unu da bişirsəm
Ac qalarıq sabahdan
De, neyləyim, balacan?!.

Ayın bu sözündən düşərək dərdə,
Asıldı gözümdən bir qara pərdə.
Açıldı qarşımda bir dar pəncərə.
Xəyalım boylandı keçən günlərə,
Yenə körpəliyim düşdü yadıma,
Bir qaya bağlandı qol-qanadıma.
Gözümdə canlandı anam yenidən,
Onu min dəfə də xatırlasam mən,
Min kitab yazsam da, o gül camala,
Yenə də ondakı böyük kamala
Yol tapa bilməmiş şair qələmi,
Mən şahid tuturam bütün aləmi.
Dünya binasını qoyandan bəri,
De, hansı dahinin xəyal şahpəri
Ucala bilmişdir barı bir kərə
Ana qəlbindəki sonsuz göylərə?
De, hansı şairin məğrur qələmi,
Olsa da günəşin, ayın həmdəmi,
Dilini bilsə də otun, çiçəyin,
Sirrini açsa da hər bir ürəyin,
Cana gətirsə də cansız daşları,
Karvana düzsə də uçan quşları,
Dönüb bac alsa da əsən küləkdən,
Bir dünya qursa da minbir diləkdən,
Xəyalı göylərə sipər dursa da,
Günəşin qoynunda çadır qursa da,
İnciyə tutsa da bütün aləmi,
De, hansı şairin məğrur qələmi
Ana qəlbindəki dəryadan keçmiş?
Bu sonsuz, bu böyük dünyadan keçmiş?

Fikrə getməyimi Ay duyar-duymaz,
Şirin söhbətini saxlayıb bir az,
Dedi ki: – Nə üçün getdin xəyala?
Cavab verməyərək mən bu suala,
Dedim: – Bu uzundur... sözünü qurtar!
Tamam danış görək, nə macəran var?!

– Bəli! – dedi, – o vaxt mən
Anamın söhbətindən
Saraldım birdən-birə;
Sonra baxıb göylərə
Bir ah çəkdim ucadan,
Yaxşı, – dedim, – anacan!
Darıxma yoxsulluğa,
Əvvəldən də bolluğa
Öyrənməmiş ağzımız.
İndi qalsan da yalnız,
Mənə izn ver gedim,
Dünyaları seyr edim.
Bir ruzi tapsam ana,
Qovuşaram tez sana.
Anam baxdı üzümə,
İşıq verdi gözümə,
Dedi: – Qızım, yaxşı yol!
Ancaq bir az ayıq ol!
Bir də unutma ki, sən
Varım-yoxum bir sənsən!

Mən örtdüm başıma bir ağ kəlağay,
Buludlar qarşımda açıldı lay-lay...
Mən getdim, arxamca su səpdi ana,
Bütün kainatı çıxdım seyrana.
Keçdim göy üzünün çəmənzarından,
Göylər dünyasının ilk baharından.
Gah endim aşağı, gah da yüksəldim,
Görüb bilmədiyim yerlərə gəldim.
Gördüm ki, kainat naxış-naxışdır,
Sənət işlənməmiş yer qalmamışdır.
Bir hünər oxunur hər çeşnisindən.
Aləmə baxdıqca anladım ki, mən
Hər kiçik zərrənin öz aləmi var,
Dünya bir ahəngdə tutmuşdur qərar...
Az getdim, üz getdim, dolandım yenə
Gəlib yaxınlaşdım Yer kürəsinə.

Nə görsəm yaxşıdır? Dərələr, dağlar,
Kahalar, daxmalar, odlar, ocaqlar...
Duydum yaşayışın xoş nəfəsini,
Eşitdim ilk dəfə insan səsini.
Bu səsdə nə böyük bir ləzzət varmış,
Duyanlar daima xoşbəxt olarmış!
Bil ki, iliyimə işlədi bu səs,
Yüz min il yaşasam canımdan getməz...
Mən onda bildim ki, "yaranmaq" nədir?
Bəşərsiz kainat bir viranədir.
Bildim, insan kimi böyük bir qüdrət
Hələ yaratmamış bizim təbiət.
Çatdı qulağıma onun nərəsi,
Hələ dağ döşündə o çoban səsi
Ruhuma dad verdi ilk gündən bəri,
O vaxtdan sevirəm mən bu yerləri.
Bircə gün görməsəm, görməsəm onu,
İlan vurmuş kimi rəngim qaralar,
Başımın üstünü dumanlar alar...
Ay bir az dayanıb sildi tərini,
Yenə varaqladı can dəftərini:
– Vuruldum dünyanın o gənc yaşına,
Sərdim qanadımı bir dağ başına.
Dağın ətəyində bir cütçü vardı,
Nə bilim, yer əkib, yer şumlayardı...
Çox dikdim gözümü mən ona sarı,
Eşib sovururdu o torpaqları;
Qan-tərə batmışdı bütün bədəni.
Başını qaldırıb görüncə məni
Dedi ki: – Yaxın gəl, uzaqda durma,
Yetim uşaq kimi boynunu burma!
Bu səsdə bir böyük mərhəmət duydum,
İlk dəfə torpağa mən qədəm qoydum.
Cütçü dilə gəlib, soruşdu məndən:
– De qızım, nəçisən, haralısan sən?
Üzünü görürəm birinci kərə,
Sən heç bənzəmirsən bizimkilərə.

Dedim: – Günəş qızı Aydır öz adım,
Daima göylərdə uçar qanadım.
İndisə gəlmişəm Yer kürəsinə.
Cütçü gülümsəyib dilləndi yenə:
– Qızım! Xoş gəlmisən, gəl əyləş görək...
Bir ağac altında biz əyləşərək,
Oturduq diz-dizə, cütçüsə dərhal
Verdi qonağına belə bir sual:
– Nədir gözündəki bu qəmli baxış?
De, rəngin nə üçün belə saralmış?
Dedim: – Yol gəlmişəm, özüm də acam,
Doğrusu, bir parça yemə möhtacam.
Cütçü bir ah çəkdi, gözlərində qəm,
Öz bağlamasını açaraq bu dəm
Çıxartdı bir parça pendirlə çörək,
– Ye! – dedi, – can qızım!
Mənsə gülərək
Soruşdum: – Bu nədir?
Dedi: – Çörəkdir!
Qonaqsız boğazdan ötməyəcəkdir!
Ye, qızım! Bununla yaşayır insan,
Ye, rəngin düzəlsin, görürəm acsan!
Verdiyi çörəkdən kəsərək bir az,
Dilimin üstünə mən qoyar-qoymaz
Ağzıma dad gəldi, qoluma qüvvət.
Dedim: – Nə şirindir bu gözəl nemət!
Dedi: – İnsan əli yaradır bunu,
Bu çörək yaşadır insan oğlunu.
Bəri bax, görürsən bu sünbülləri?
Bunların dilini tapandan bəri
Biz aclıq sözünü qovmuşuq evdən.
Get, Günəş anana xəbər ver ki, sən
Bol isti, bol işıq göndərsin bizə,
Onlar səbəb olur çörəyimizə.
Dedim: – Bəs nə üçün göylər mülkündə
Çörək tapılmayır bizə bir gün də?
Anamın istisi orda da vardır,

Bəs nədən göy üzü bir boş anbardır?
Cütçü gülümsəyib dedi: – Qulaq as!
Çörək bir istiylə, işıqla olmaz.
Budur, bax, gördüyün bu qara torpaq
Nə qədər vardırsa, çörək olacaq.
Torpaqdan süd əmir hər sarı sünbül,
Torpaqdan göyərir hər çiçək, hər gül.
Bir də öz başına yaranmır onlar,
Torpaq üstündə də insan gözü var...
Budur, bax, alnımdan tökülən bu tər! –
Dünyada ac qalar tər tökməyənlər.
Onların ömrü də tez gedir bada,
Hər kəs əkdiyini biçər dünyada.
Al, sana verirəm mən bir ovuc dən,
Apar göy üzünə bizim bu yerdən.
Orda əlinizlə səpib becərin,
Bir az zəhmət çəkib barını dərin
Dedim: – Cütçü baba, sağ ol, çox sağ ol,
Daima kefi kök, damağı çağ ol!
İndi salamat qal, ömür gödəkdir,
Səfərim uzandı, anam da təkdir.
Durub cütçü baba öpdü alnımdan,
Bildim ki, mehriban olurmuş insan.
O dedi: – Yaxşı yol! Get, qızım, Xumar,
Get anan sevinsin, pisdir intizar.
Ancaq yoldan-izdən özünü gözlə,
Ehtiyatlı dolan gecə-gündüzlə..
Mən uçub yüksəldim, yenə yüksəldim,
Bir zaman anamın yanına gəldim.
Anam sevincindən ağladı, bilsən?
Dedi: – Nə qoçaqsan, sən qız deyilsən!
Ancaq az qalırdı çatlasın bağrım,
Nə yaman gecikdin, ay ağrın alım?
Dedim ki, səfərim xoş keçdi, ana!
Gör nə gətirmişəm insandan sana!
Mən ona göstərib toxumluq dəni,
Danışdım başımdan gəlib keçəni.

Dinlədikcə məni anam şad oldu,
Ehtiyac dərdindən o azad oldu.
Yorğun olduğumdan yatdıq gecəni,
Səhər açılınca oyatdı məni.
Əl-ələ tutuşub qız ilə ana,
O vaxt göy üzünü çıxdıq seyrana.
Cütçünün verdiyi toxumları biz
Mavi göy üzünə səpdik tərtəmiz.
Keçdi bir neçə ay, yetişdi bahar,
Nə gördük? Cücərdi bütün toxumlar –
Parladı ulduzlar, o ağ sünbüllər,
Yarandı aləmdə yeni bir əsər.
Dünya dəyişmişdir, o vaxtdan bəri
Ölçüb biçməmişəm qərinələri...
Dəyişmiş yerini dağlar, dərələr,
Bəlkə də qalmamış ilk mənzərələr.
Nə deyim! Dünyanın qocadır yaşı,
Daima fırlanan dəyirman daşı
Nələr üyütməmiş!.. Lakin ulduzlar
Hələ də cütçüdən qalmış yadigar.
Onlar düşməmişdir hərəkətindən,
İnsan çörəyinin bərəkətindən
Göy üzü daima gülər-gülşəndir,
Hər kiçik ulduzun surəti şəndir.

Bir gün mən bəzənib çıxmışdım seyrə,
Ulduzlar mülkündən baxırdım yerə.
Hər ulduz dil açıb deyirdi: – Xumar!
Sənin nə möhtəşəm gözəlliyin var?!
Camalın süd kimi belə dümağdır,
Daima sönməyən bir şəbçıraqdır.
Gözəllik sözünün ruhu var səndə,
Arabir sən bizə qonaq gələndə
Sayrışan ulduzlar verib baş-başa
Gözəl camalına qılır tamaşa.
Doğrudan cəlalın böyükdür sənin!
Nurdanmı tökülmüş, söylə, bədənin!

Ayıq gəz, sayıq ol,göz dəyər sana,
Batar bu göy üzü günahsız qana.
Ərköyün böyümə!.. Az dolan, az gəz!..
Gözəllər nəzərə tez-tez görünməz.
Mənsə, dinlədikcə bu ulduzları,
Gülərdi qəlbimdə hüsnün vüqarı.
Qol-qanad açardım sözün doğrusu,
Hər bir yaranmışın arzusudur bu.
İstər gözəl olsun bütün canlılar;
Gözəlliyə qarşı məhəbbət də var.
Çirkin yaranmışlar çox vaxt dərdlənər...
Gözəllik eşqindən yaranmış səhər!

Mən ayın sözünü kəsdim bir anlıq,
Dedim: – Çirkinlərdən danışma artıq;
Mən də onlardanam, öz aramızdır...
Ay dedi: – Gözəllik dediyim qızdır.
Qoy, qızların üzü gün kimi gülsün,
Kişinin üzündən mərdlik tökülsün!
Yox, – dedim – yoldaş Ay! Səhv eləyirsən,
Qol çəkə bilmərəm bu fikrinə mən.
Çünki ərzə verər şairdən qızlar,
Deyər düz yazmayır bizi sənətkar.
Deyər həyat üçün yaranmışıq biz,
Hünərdir ən böyük gözəlliyimiz!
Təbiət deyər ki, lalə yanaqlar,
Vurğunun dediyi yaqut dodaqlar
Gəldi gedər olur qoca dünyada;
Çox şirin olsa da, tez gedir bada.
Qızlar dil açar ki: – Zəhmət çək bir az,
Gözəllik sözünün kamalından yaz!
Yoxsa, qaşın belə, gözün də belə,
Amandır üzünü göstərmə elə,
Nə bilim, çiçəksən, ağzı göyçəksən,
Mələksən, pərisən, dünyada təksən...
Artıq bu sözlərin köhnəldi vaxtı,
İndi gözəlliyin başqadır taxtı.

Bu taxta nə mələk, nə də pəri var,
Bu taxtda əyləşir ağlı olanlar.
Bir mələk olsa da, ağılsız bəşər,
Yüzillik hörmətdən bir gündə düşər!
Ay baxıb, sükuta getdi bu dəfə,
Üzünü döndərdi göylər tərəfə.
– Hə!.. – dedi, – o zaman sevinərək mən
Keçdim gəlin kimi göylər mülkündən.
Güvənib hüsnümə xeyli yüksəldim,
Sonra öz anamın yanına gəldim.
O baxıb boyuma, sevindi yenə,
Sevindi qızının gözəlliyinə.
Ay keçdi, il keçdi yenə boy atdım,
Bir zaman gəlinlik yaşıma çatdım.
Yazıq ki, çox gördü vaxt bunu bizə,
Fəlakət yazıldı taleyimizə.
Bu vaxt bir ah çəkdi Ay sinəsindən,
Titrədi varlığım onun səsindən.
Nə yazım, nə deyim bu dərdə dair?
Gözəllik ağlarsa, gülərmi şair?
Dedim: – Nə fəlakət? Gəl, danış bir-bir
Bizim ki qəlbimiz ayrı deyildir!
Yenə işıq gəldi Ayın gözünə,
Baxıb davam etdi o öz sözünə:
– Qara gəlmiş bir gündə,
Bizim göylər mülkündə

Oturmuşdu anam tək,
Qolunu çirməyərək,
O, xəmir yoğururdu.
Bir nağıl olsa da, bu,
Həqiqət var səsində,
Anamın dövrəsində
Hoppanırdım pişik təki...
Özün yaxşı bilirsən ki,
Qız tayfası şıltaq olar;

Anam dedi: – Bəsdir, Xumar!
Gəl dolaşma əl-ayağa.
Mən anamı qoyub lağa,
Gah atıldım, gah da düşdüm.
Birdən-birə mən sürüşdüm.
Dəydim onun sağ qoluna
Acıq gəldi bu səhv ona.
Öz yerindən anam durdu,
Üzümə bir şillə vurdu
O, xəmirli sağ əlilə.
Günahımı bilə-bilə,
Söz deməyib uzaqlaşdım,
Buludlardan keçib aşdım.
Küsdüm yazıq taleyimə,
O dərdimi bu gün demə!
Ağrıdıqca üzüm dəm-dəm,
İçimdə dərd, gözümdə qəm
Çox ağladım sərin-sərin
Qucağında fələklərin.
Ah, nə deyim! O şillədən
Yaralıyam bu gün də mən.
Doğrusunu desəm əgər,
Üzümdəki bu ləkələr
Öz anamdan yadigardır,
Gör nə böyük dərdim vardır...

Ayrılıq zor verdi ana qəlbinə,
Gəl! – deyib, yanına çağırdı yenə.
Mənim də ürəyim yumşaldı bir az,
Övladın küsməyi çox uzun olmaz.
Barışdıq... O məni qucaqlayaraq,
Dedi: – İndən belə sözlərimə bax!
Birdən nə oldusa, rəngi saraldı,
Anam bir daş kimi yerində qaldı.
Sonra qüvvətini yığıb bir təhər,
Bağırdı: Ləkələr, qara ləkələr!
Mənsə heyrətləndim sözün doğrusu,

Dedim: – Nə olmuşdur? Nə danışır bu?
Anamın göz yaşı axıb göllündi,
Sonra saçlarını yolub dillündi!
– Can bala! Əllərim yanıma düşsün.
Üzüm bu dünyada gülməsin bir gün!
Dedim: – İraq candan! Nə söyləyirsən?
Anam bağırdı ki, günahkaram mən;
Üzündə qalmışdır qara ləkələr...
Bir matəm örtüsü geyindi səhər.
Ah, əlim qurusun!
Dedim: – Ağlama!
Mənim də qəlbimi söküb dağlama!
Nə olmuş? Üzümdə ləkəmi qaldı?
Anam çıraq kimi birdən qaraldı,
Dayana bilməyib getdi özündən;
İşıq məhv olarsa ana gözündən
Gülməz ki, dünyada övladın üzü!
Gecədən seçilməz gündüzün üzü.
Sonra yazıq anam özünə gəldi,
Dərdli sinəsindən bir ah yüksəldi.
Bağrına basaraq məni o zaman
Çeşmələr yaratdı göz yaşlarından.
O bir quzu kimi yalayıb məni,
Dedi: – Göz yaşlarım yusun ləkəni.
Üzümə axdıqca onun göz yaşı.
Qəlbindən qan getdi, hərləndi başı.
Baxıb balasına hey yana-yana
Döndü ana qəlbi o gündən qana...
Aylar, illər boyu ağladı belə,
Dizinə çox döydü öz əllərilə.
Yazıq ki, sonuncu peşimançılıq
Bir fayda verməyir bizə apaçıq...
İndi doğrusun söyləsəm əgər,
Üzümdə gördüyün qara ləkələr
Bil ki, öz anamdan bir yadigardır,
Görürsən, nə böyük faciəm vardır!..

Ay susdu, yol çəkdi qəmli gözləri.
Doldu şairliyin könül dəftəri...
Xəyala qərq oldu, əlimdə qələm;
Bir anlıq sükuta getmişdi alım.
Dedim: – Nə dərdliymiş bu qəmli dastan!
Mən yazım, oxusun eşitsin insan.
İstər ana olsun, istərsə ata!
Bəzən ehtiyatsız, kiçik bir xata
Böyük faciələr yaradır demək!
Sonra ömrü boyu dərd çəkir ürək!
Ay durub yerindən getmək istədi,
Sonra baxıb mənə: – İzin ver! – dedi,
– Gedim öz yerimə, anam da təkdir.
Dedim: – Bir az dayan, sözüm gödəkdir,
Sən deyib qurtardın, indi qulaq as!
Şairə dərd açan davasız qalmaz.
Nə gözəl əfsanə var imiş səndə!..
Sən danışan zaman yazırdım mən də.
İndi qulaq as ki, oxuyum sana,
Əzbərlə şeirimi, söylə anana.
Oxuyub qurtardım dastanımı mən,
Qonağım şad oldu buna ürəkdən.
Sonra gülümsəyib göylər gəlini,
Uzatdı əlimə isti əlini.
Dedi: – yarandığım ilk gündən bəri,
Əlimə dəyməmiş insan əlləri...
Çox zaman üzümə gülümsəyərək
Bəlkə can atmışdır mənə min ürək...
Ala bilməmişlər könlümü ələ,
Üzümdən öpməmiş bir insan hələ.
Özüm də heyranam öz xilqətimə,
Bu dünya vüqarlı təbiətimə.
Fəqət, bil, yazdığın bu dastanla sən.
Mənim də qəlbimə min hökm edirsən.
Ay bu son sözünü utancaq dedi,
Əyilib alnımdan öpmək istədi.
Yox! – dedim, – gözəl Ay! Hələ dayan bir!

Həsrətlə ayrılsaq daha gözəldir...
Uçdu göy üzünə o dilbər sona,
O getdi, mən baxdım həsrətlə ona.

Azacıq keçmədən açıldı səhər,
Geydi al donunu yaqut üfüqlər.
Xəzər bir aynaydı üzü ləkəsiz,
Ayıldı yuxudan qızım Aybəniz.
Mən basıb bağrıma bu ayüzlümü,
Bu şirin dillimi, şəkər sözlümü,
Dedim ki: – Aybəniz! O Aya bənzə,
Daima saf yaşa, daima təzə!..

*1941*

# HÜRMÜZ VƏ ƏHRİMƏN

## BİRİNCİ SƏHNƏ

(*Zaman və məkanın təsviri*)

Azərbaycan, gözəl bir yaz... Həyat bolluq, işıq çoxdur,
Qaranlıqdan, əsarətdən, xəyanətdən nişan yoxdur.
Baharın qəlbi gümrahdır, gülür hər şey səadətlə;
Ocaqlar yandırılmışdır, keçir dövran ziyarətlə.
Qədim dağlar qucağında şəhərlər, qələlər vardır,
Zaman keçmiş... Həyat başqa... Fəqət, dağlar o dağlardır!
Çəmən sevdalı bir qızdır, o tac qoymuş çiçəklərdən,
Müqəddəsdir yerin ruhu, yaranmışdır ürəklərdən...
Buludlar sallanıb bəzən öpər dağlar camalından,
Günəş ilham alıb parlar göyün sonsuz kamalından.
Çatılmış varlığın alnı... Fələklər min xəyal eylər,
Baxıb heyrətlə hər insan zamandan bir sual eylər...
Axar çaylar, sular çağlar, dayanmaz kainat bir dəm,
Bu gün matəm, sabah bayram, əzəldən böylədir aləm...
Əsər ruzgar, qopar yanğın uğursuz bir qığılcımdan,
Ömür keçdikcə odlardan, alovlardan keçən insan.
Gələr Zərdüşt, deyər bəzən: – Mənim öz ehtişamım var,
Bəşər qəlbi müqəddəsdir, bu qüdsiyyətdə kamım var...
Ölüm iblisə layiqdir, həyatdır ən şirin nemət,
Qaranlıqdan uzaqlaş ki, işıqdır ən böyük ziynət.
Çalış, qəlbin saf olsun ki, təmizlikdir sənin hüsnün,
Bütün ömründə zəhmətsiz, hünərsiz keçməsin bir gün...
Gözəl sözlər gözəldirsə, azadlıq min hünər istər!
Əməl uğrunda candan keç, özün mərdanəlik göstər!
Dönükdür dövranın hökmü, sən öz simanı saf saxla!
Səadətdən, məhəbbətdən danışma hər bir alçaqla!
Bir "Allah" adlanan eşqi sən öz qəlbində axtarsan,
Özün öz hüsnünü tapsan – ölüb getsən də sən varsan!
Zamanın nəbzini tut ki, nə canandan, nə candan tut,
Nəyin vardırsa aləmdə sən öz simana qalxan tut...
Ölüm qorxar cəsarətdən, həyatın şəni qüdrətdir;





Təvəkküllə keçən ömrün nəsibi qəmlə möhnətdir.
Vuruş öz haqqın uğrunda, hünər bir ehtiyac olsun,
Köçüb getsən də dünyadan adın başlarda tac olsun!
Bu eşqin isti nurilə bütün dağlar boyanmışdır.
Səhərdir... Quşlar, insanlar bu eşq ilə oyanmışdır.
Baharın qəlbi gümrahdır, gülür hər şey səadətlə,
Ocaqlar yandırılmışdır, keçir dövran ziyarətlə.
Neyin titrək sədasından könül mülkü xuramandır,
Açıl, pərdə! Görün, səhnə! Baxaq dövran, nə dövrandır!

Qocaman Qaf dağında məbədgah...
Od-alov asimana yüksəlmiş.
Sanki göydən yerə yanğın gəlmiş,
O zaman atəş imiş ilk Allah.
Min murad istəyərək odlardan,
Açır öz qəlbini hər bir insan,
Yerə batsın deyilir şərlə zülüm,
Qalmasın yerdə nə zülmət, nə ölüm!
Ah, o günlər! O müqəddəs babalar,
O xəyal yolçusu ellər, obalar
Çəkdi dünyanın əzəl qəmlərini,
Yardı zülmətləri, yol açdı bizə,
İrs qoyub getdi bizim nəslimizə
Ömrün imanla keçən dəmlərini.

## DAĞLAR SULTANI

Qəlbi saf, alnı dümağ,
Göyə əl qaldıraraq:
– Ölüm məlun bir iblisdir, o varlıqdan kənar olmaz,
Ölümsüz, fitnəsiz, şərsiz, – deyirlər, – bir diyar olmaz.

Onun tufanı qopduqca uçar evlər və ehramlar,
Onun ruzgarı əsdikcə qış ağlar... İlk bahar olmaz...

O əzrayıl yaranmışdır, qılınc qurşar, qiyam eylər,
Deyər: Mən hökm sürdükcə bir insan bəxtiyar olmaz.

Ölüm heçliklə sirdaşdır, bu hikmət sığmaz idraka;
Qıfıllanmış onun sirri, açılmaz, aşikar olmaz.

Rəqabətdən, xəyanətdən yaranmışdır bu iblis ki,
Könül verməz, könül almaz, sevən bir qəlbə yar olmaz.

Həyat dünyada durduqca ölümdür ən yaxın dostu,
Yaxın dostlarda adətdir əzəldən etibar olmaz!

Böyük Hürmüz! Böyük Hürmüz! Ölümdən intiqam al ki,
Bu iblis qatil olduqca həyat sevdası var olmaz!

Eyni ahənglə bütün məclisdə
Yalvarır Hürmüzə odlar üstə

Böyük Hürmüz! Böyük Hürmüz!Ölümdən intiqam al ki,
Bu iblis qatil olduqca həyat sevdası var olmaz!

* * *

(Baxın, qol çirməmiş indi, gəlir saysız pəhləvanlar,
Oda baş endirib əvvəl, dönüb qurşaq tutur onlar.
Tamam meydan qızışmışdır, sükut eylər uzaq dağlar,
Deyirlər ağ ipəkdənmiş, qırılmazmış o qurşaqlar.
Bütün məclisdə heyrət var, ürəklər titrəyir zağ-zağ;
İgidlər nərə çəkdikcə əsir torpaq, düşür yarpaq...
Enir hiddətlə toppuzlar, poladdandır, nədir canlar?
Düşənlər ah çəkib sızlar... Gülümsər qalib insanlar.
Bu qanundur əzəl başdan – hünər alqışlanar hər an,
Vətən övladı, qalib çıx zamanın imtahanından!)

**SİRDAŞ ƏMİ**

Əyləşin, indi bahar aləmidir,
İndi gül fəsli, məhəbbət dəmidir.

(*Tale pərisinə*)

Sən gözəl yurdumuzun dilbərisən.

(*Dağlar sultanına*)

Sən də dağ sultanı, dağ əjdərisən!
Bu xeyir iş, bu məhəbbət yaşasın,
Yaşasın, mehr ilə ülfət yaşasın!

SƏS

Yaşasın şöhrətimiz dağ gözəli!

KÜSKÜN

(*Ətrafa*)

Onu ağlatmasa dövranın əli...

SƏS

Yaşasın ulduzu sönməz gecələr,
Yaşasın daima sevdalı səhər!

SİRDAŞ ƏMİ

Yaşasın, buğda biçən əllərimiz,
Suyu bol, torpağı bol ellərimiz!

TALE PƏRİSİ

Yaşasın sünbülü dolğun zəmilər,
Qalmasın yerdə səfalətdən əsər!

DAĞLAR SULTANI

Lənət olsun ölümün ac gözünə,
Bir də hicranla xəyanət sözünə!
Hərə şadlıqla içir badəsini,
Dinləyir qəlbinin Allah səsini...

SİRDAŞ ƏMİ

Oxu, Tale pərisi, dağlara düşsün nəfəsin
Oxşasın qəlbimizi dadlı, məlahətli səsin!

DAĞLAR SULTANI

Oxu, sən yurdumuzun taleyisən, öz qızısan,
Sən Vətən göylərinin sirli dan ulduzusan!

TALE PƏRİSİ

Hər çiçəyin bir adı,
Hər könülün muradı,
Qovuşsun diləyinə
Bütün insan övladı!

KÜSKÜN

(*Ətrafa*)

Mənimsə eşqimin artıq rübabı yüz daşa dəydi,
Mənimsə sərvimi birdən boran döydü, külək əydi,
Sevinmədi yazıq ömrüm, səadətin dili lalmış,
Gülür bu gün bütün aləm, bir ağlamaq mənə qalmış...

TALE PƏRİSİ

Könüllər sirdaş olsun,
İnsanlar qardaş olsun.
Bir məhəbbət, bir xeyir
Hər məclisdə baş olsun!

KÜSKÜN

(*Ətrafa*)

Mənimsə məclisim artıq, vərəmli bir yasa dönmüş,
Nələr deyir qara baxtım? Əzəldən ulduzu sönmüş!..
Musiqi dalğalanır, dinlə, könül nəğməsidir!
Rəqs edənlərsə vətən qızlarının dəstəsidir.
Bir mələkdən daha safdır üzü nazəndələrin,
Ala gözlər süzülür, göy kimi mənası dərin...
Əldə yaylıq, kəlağaylar qanad açmış havada,
Bunu quşlar da görüb rəqsə gəlirlər yuvada.
Əl çalırlar ana yurdun bu gözəl sənətinə,
Toyla, bayramla keçən ömrün əziz nemətinə...

* * *

DAĞLAR SULTANI

O nədir? Kimdir o hikmətlə gələn?
Kim olar sizcə bu sürətlə gələn?

SİRDAŞ ƏMİ

Nə deyim, bəlkə qonaqdır...

DAĞLAR SULTANI

Görünür...

TALE PƏRİSİ

Arxasıncan da üfüqlər sürünür...
Tanrı simalı gözəl bir qocadır,
Boyu da sərv ağacından ucadır!

* * *

Gəlir dağ gövdəli bir pir, onun alnında hikmət var,
Onun qəlbində, ruhində tükənməz bir məhəbbət var.
Gəlir qartal vüqarilə... Öpür göylər ayağından,
Kimin qanunu düzdürsə, onun hökmündə qüdrət var...
O insanlıqla fəxr eylər, gözəldir feli, rəftarı,
Günəşdir qəlbi, vicdanı, könül mülkündə ülfət var.
Azadlıqdır onun eşqi, həyatdır ən böyük andı,
Onun qüdsi kitabında nə istibdad, nə möhnət var!

HÜRMÜZ

Çox mübarək bu gözəl, həm də əziz bayramınız!
Kimin eşqilə sevinmiş bu böyük ilhamınız?

SİRDAŞ ƏMİ

Biri dağ sultanıdır, digəri dağlar gözəli!



HÜRMÜZ

Çox gözəl xəlq eləmişdir sizi dövranın əli!
Nə zamandır gəzirəm, dövr edirəm aləmi mən,
Başqa bir zövq alıram indi bu xoş mənzərədən!
Burda hər şey dəyişib, burda bahar aləmi var,
Nə əsarət, nə səfalət, nə də hicran qəmi var...
Burda eşqin günəşindən yaranır nazlı səhər...
Belə bir gün görəcəkmiş başı sevdalı bəşər!
Kimin övladısınız!

DAĞLAR SULTANI

Hürmüzün övladı!..

HÜRMÜZ

Neçin?

DAĞLAR SULTANI

Çünki insan yaranır insana dost olmaq üçün
Hürmüzün ruhu suvarmış bu məhəbbət bağını,
Bizim odlar beşiyi – doğma vətən torpağını.

HÜRMÜZ

Vətənin sevgisi xoşdurmu?

DAĞLAR SULTANI

O şərbət kimidir,
Vətən andı, vətən eşqi əbədiyyət kimidir...

HÜRMÜZ

(*Onun alnından öpərək*)

Elin idrakı gül açmış bu kamalında sənin!

TALE PƏRİSİ

Tanrının hüsnünü gördüm bu camalında sənin
Söylə kimsən, babacan?

HÜRMÜZ

Mənmi kiməm?
Sorma bunu!

Yenə dövran deyəcəkdir sizə dost olduğumu...
Qızım! Solmaz çiçəklərdən
Səninçin tac düzəltdim mən.
Səməndər adlı bir quşdur,
Alovlardan doğulmuşdur...
Ölər ayrılsa odlardan –
Vətənsiz böylədir insan!
Zamanın nəbzi vurduqca
Bu məndən yadigar olsun;
Vətən sevdası durduqca
Sənin eşqin də var olsun!..

KÜSKÜN

Yalandır! Eşqlər yoxdur... Sönükdür baxtımız hər an,
Fəlakətdən doğulmuşdur zavallı, kimsəsiz insan!

SİRDAŞ ƏMİ

(*Hürmüzə*)

Azardır... Əfv edin siz də, onun ömrü şikayətdir,
Hər ağ gün, hər gözəl bayram onunçün bir fəlakətdir.

HÜRMÜZ

Gəl, oğlum! Durma pəjmürdə. Xeyirdən qaçma, şərdən qaç,
Nədir dərdin? Nə sirrin var? Din, oğlum, sən də söhbət aç!

Göy guruldar şimşək oynar
Bir fəlakət qorxusundan;
Böylədir talesiz insan.
Ömrü atəşlərdə qaynar...

Əhrimən öz dəstəsilə,
Devlər, iblislər səsilə
Qışqırıqlar saldı birdən,
Nalə, fəryad qopdu yerdən...

HÜRMÜZ

Söylə, kimsən? Niyə gəldin? De, xəyalında nə var?

SİRDAŞ ƏMİ

De, salamsız niyə gəldin?

ƏHRİMƏN

Nə olar?
Sizin adətdə yazılmış quru söz, haqqı-salam,
Məni bir başqa təriqətdə böyütmüşdür anam.

HÜRMÜZ

Qoca! Kimsən deyirəm?

ƏHRİMƏN

Sən deyiləm... Mən də mənəm!..
Yoxsa ölmüşmü sayırdın qocaman Əhriməni?
Hələ məhv olmamışam, var yenə aləmdə səsim,
Bir yanar dağ kimiyəm, daima oddur nəfəsim!
İndi bildinmi kiməm?

HÜRMÜZ

Şər köpəyi!

ƏHRİMƏN

Bir də tanı!
Külə döndərməyə gəldim bu gözəl xanimanı!

HÜRMÜZ

Niyə daş doğmadı, zalım, səni xəlq etdi anan?
Sən deyilsənmi bu aləmdə bütün xeyri danan?
Sən deyilsənmi bu tarixləri çaxnaşdıran əl...
Qoca Hürmüz də mənəm! Gəl, yenə meydanıma gəl!

ƏHRİMƏN

Bir zamanlar yaralar vurmuş idin sinəmə sən,
İntiqam eşqim alovlandı, sağaldım yenidən!
Mən qılınc qurşamışam, bax, bu gələn nəslimə, bax!
Nə qədər ölməmişəm, üstünə tufan qopacaq!

HÜRMÜZ

Sən uğursuzsan, a zalım! Bilirəm hiyləni mən,
Sən ki varsan, göz açılmaz dediyin faciədən!
Yenə evlər yıxacaqdır o sənin murdar əlin,
Yenə qanlar tökəcəkdir o şərəfsiz əməlin!
Yenə yurdlar, yuvalar tapdalanıb xar olacaq,
Yenə güllər tökülüb, nazlı çiçəklər solacaq!

ƏHRİMƏN

Mənim andım var əzəldən, bunu yer bilsə gərək,
Ayağım dəydiyi torpaqda çiçək bitməyəcək!..

DAĞLAR SULTANI

Bəs deyildirmi bu zülmün? Nə olar, haqq yola gəl!
Sən də eşqin günəşilə sevişib, qol-qola gəl!

ƏHRİMƏN

Mən günəş düşməniyəm, zülməti göstər mənə sən!
Bir əsarətdir əzəldən o məhəbbət deyilən...
Mən qaranlıq mələyi, bir də şərin tanrısıyam!..

HÜRMÜZ

Mən də xeyrin günəşi, bir bəşərin tanrısıyam!

(*Ətrafa*)

İki Allah yaşadıqca qurumaz qan dənizi...

ƏHRİMƏN

Bu qılıncım kəsəcəkdir o xeyir nəslinizi.
Ayaq altında gərək tarımar olsun vətənin!

HÜRMÜZ

Bir vətən sevgisi olsaydı qılıncında sənin,
İnanardım gücünə! İndi dayan, şər yuvası!
Mənə qüvvət verəcəkdir ana yurdun havası...
Haydı! Sərkərdəni seç!

ƏHRİMƏN

Bax, o duran Zülmətə bax!
Adı Zülmət, özü zülmət, sizə cəllad olacaq!
(Zülmət gəlir. Əhrimənin qarşısında diz çökür)

ZÜLMƏT

Atam matəm, anam hicran, bu möhnətdən yarandım mən,
Bütün qəlbimlə vicdanım doğulmuşdur müsibətdən.
Mənim tanrımsa bir sənsən, özüm zülmət, yolum haqdır,
Mənim eşqim, mənim qayəm sənin zəvvarın olmaqdır!

ƏHRİMƏN

Al! Mənim köhnə qılıncımla bütün əlmi yar!
Hara getsən özün ilə qatı bir zülmət apar!
Aldanıb uyma nə insan, nə də vicdan sözünə,
Çünki bir pərdədir onlar, bu qılınclar gözünə!..
Yanma aləmdə nə hicran, nə də bir göz yaşına,
Kim ki, qan aşiqidir onları yığ öz başına...
Çünki qan olmuş əzəldən bizə şöhrət qazanan,
Doqquz ay qanla yoğurmuş səni bətnində anan!
Sən də sərkərdəni seç!

HÜRMÜZ

Bax, tanı, Dağ Sultanıdır!
Adı Dağ Sultanıdır, şöhrəti el vicdanıdır!
Günəş göy göstərir əlan,
Deyir çarpış bu zülmətlə.
Əlindən Hürmüzün Sultan
Öpür bir saf məhəbbətlə.

HÜRMÜZ

(*Qılıncını ona verərək*)

Al, oğul! Qurşa bunu, bil ki, bu haqqın əlidir,
Bu qılınc ilə şərin tanrıları ölməlidir!
Günəşin nurunu, ulduzları yığ öz başına,
İldırım sürəti çax sən bu əsarət daşına.
Bəşərin eşqini, sevdasını qəlbində yaşat!
Sən həyat aşiqi ol ki, sənin olsun bu həyat!
Bu yolun qorxulu tufanları, yanğınları var...
Hara getsən də, xeyirdən yeni bir nemət apar!
Dara düşdükcə, oğul, başqasının qeydini çək!
Səni sevsin bəşəriyyət, sənin olsun gələcək!
O zaman Zülmətin üstündə boranlar kimi əs,
Sən bu şər tanrısının birdəfəlik nəslini kəs!

SƏSLƏR

Amin! Amin

DAĞLAR SULTANI

(*Hürmüzə*)

Sən ki, xeyrin günəşi, bir bəşərin tanrısısan,
Səndən ilham alacaq qanlı döyüşlərdə zaman.
Mənsə bir əsgəriyəm sən dediyin nurlu yolun,
Mənim andım da həyatdır, buna siz şahid olun!
Baxır ətrafa hörmətlə,
Baxır bir mehri ülfətlə...
Oxu, Tale pərisi! Dağlara düşsün nəfəsin
Oxu, düşmən qabağında ürəyin titrəməsin!

TALE PƏRİSİ

Sənə yar olsun, əzizim, dövran!
Naümid çıxma bu tufanlardan.
Ulu Hürmüz! Onu sən hifz eylə
Duyğusuz, eşqsiz insanlardan!

Qılınclar, nizələr, oxlar süzüb göylərdə rəqs eylər,
O mizraqlar, o qalxanlar fəlakətdən xəbər söylər...
Qabaqlaşmış xeyir şərlə, baxışlardan alov parlar,
Göyün eyvanı uçmuşmu? Yerin qəlbində tufan var...
Sorun Tale pərisindən – məhəbbətmi düşən dərdə?
Qaranlıq sıxlaşır artıq... Susur nəğmə. Düşür pərdə...

*1944*

# BAKININ DASTANI

## PROLOQ

Neçə ildir könül deyir söylə, şair,
Şeir, sənət gülzarında Bakı hanı?
Sən nə zaman yazacaqsan ilk dastanı
Bu müqəddəs, bu möhtəşəm hüsnə dair?!
Lakin bizim böyük şəhər bir ümmandır,
Bu ümmanda üzmək üçün qəvvas gərək.
Bu arzuyla yaşamışam nə zamandır,
Var ol, məni bu ümmana atan ürək!
Var ol sən də, gözəl Bakı, qadir ana!
Camalının şöləsidir bu ilhamım.
Öz borcumu ödəyərsəm bu gün sana,
Gözlərimdə qalmayacaq heç bir kamım!

*Birinci nəğmə*

## BAKININ BAHARI

Hava sakit... Dəniz şəffaf... Səhər dilbər...
Al günəşin şəfəqləri düşür suya.
Asta-asta oynadıqca göy ləpələr,
İlham verir min arzuya, min duyğuya.
Qanad kimi, qayıqların ağ yelkəni
Süzüb gedir, seyr edirəm onları mən,
Dastan kimi oxuyuram bu dənizdən
Dünya görmüş, zaman görmüş bir ölkəni!
Sahildəyəm, mən dənizi bu ülfətlə
Duymamışdım, sevməmişdim indiyədək.
Nə xoşbaxtam! İlahi bir məhəbbətlə,
Dəniz! – deyir, – Dəniz! – deyir bu gün ürək!..
Osa, açmış öz mehriban qucağını,
Gəlin, – deyir – sinəm üstə yeriniz var!
İlk baharı seyrə çıxın, özəl dostlar!
Seyrə çıxın bu ülviyyət ocağını!

Nə gözəlmiş dəniz üstə neyin səsi –
O, insanın çiçək açmış arzusudur
Həyat verir, bir arzunun zümzüməsi,
Azadlığın, səadətin hökmü budur!
Oxu, oxu! Ana yurdun körpə qızı!
Mavi dəniz xumarlanır nəfəsinlə,
Günəş belə salamlayır baxtımızı.
Oxu, quzum, öz qəlbinlə, həvəsinlə!
Oxu, bala, dinləyirəm təranəni,
Dodağında gül açmışdır bəxtiyarlıq.
Mən duyduqca, düşündükcə bu gün səni,
Ürəyimdə şeir olur bütün varlıq.
Ləkə yoxdur sənin o gül yanağında,
Gözlərində yanan alov – ilk bahardır.
Şərqi deyən sənin körpə dodağında
Bir ölkənin haqqı vardır, özü vardır
Oxu, qızım! Alnın açıq, ürəyin şad,
Al günəşdən heç ayırma əlini sən;
Qəlbi azad, fikri azad, eşqi azad
Yurdumuzun sabahkı bir gəlinisən.
Bir analıq şərəfin də vardır sənin,
Qoynundadır insanlığın saf diləyi...
Övladları azad olmuş bir Vətənin
Al şəfəqə bürünmüşdür gələcəyi.
Oxu, dedim, sənə, quzum, gülür bahar!
Bir ilhamdır nəfəsindən gələn avaz.
Söylə, neçin gülümsədin! Sözünmü var?
Hə... deyirsən, gəl şərqimi sən özün yaz!
Alqış sənin bu arzuna! İndi dinlə,
O şərqini öz əlimlə yazıram mən.
Mənim şerim sənin şirin nəfəsinlə
Yer üzünə salam versin ölkəmizdən:

“Bakı! Bakı! Ana vətən!
Bizə şöhrət yarandın, sən!
Gün camalın şölə salır...
Qəhrəmanlar ilham alır

Sənin həyat qüdrətindən
Bilinməyir hələ yaşın,
İnsan olmuş ilk sirdaşın...

* * *

Aç tarixi varaq-varaq,
Hər dövranın hökmünə bax...
Burda min bir od yanarmış,
Onun da öz hüsnü varmış.
Müqəddəsmiş hər bir ocaq...
Çıraqbanlar bir tamaşa –
Alışarmış başdan-başa.

* * *

Bu torpağın oğlu, qızı,
Yanaqları al-qırmızı,
Bu torpaqdan ilham almış.
At belində qılınc çalmış,
Yaşatmışdır haqqımızı.

Bakı, Bakı, gözəl diyar!
Qəhrəmanlıq şöhrətin var.
Bu quruda, bu dənizdə,
Eşqi azad ölkəmizdə
Xar olmuşdur qəsbkarlar.

Ana torpaq! Ana torpaq!
Əlindəki bu al bayraq,
Beşbucaqlı bu ulduzun
Ülkəridir baxtımızın,
O daima parlayacaq!..

Bakı! Bakı! Gözəl vətən!
Bizə şöhrət yarandın sən!
Zülmətlərə sinə gərən,
Qoca Şərqə yol göstərən
Al bayraqlı bir günəşsən!...”

Şərqi uçur... Dalğalanır neyin səsi...
Ruhum quşu qanad çalır asimana.
Gözlərimdə saf dənizin mənzərəsi –
Bütün dünya bir yanadır, o bir yana!
Dəniz! Dəniz! Nə genişdir ənginlərin!
O, bəlkə də bir ölkənin kamalıdır...
Günəş qızğın... sahil yaşıl... hava sərin...
Bu gözəllik ana yurdun camalıdır
Dolandıqca sahil boyu mən vüqarla,
Düzülmüşdür sərv ağacı qatar-qatar,
İnsan oğlu görüşdükcə ilk baharla
Fəsil-fəsil təzələnir saf duyğular...
Bizim Xəzər sahilində səhər-səhər
Min zövqü var xəyal ilə dolanmağın.
Bulud kimi çaxnaşaraq keçən günlər,
Müqəddəsdir dərya kimi bulanmağın.
Bəli, Xəzər, dəli Xəzər coşur bəzən...
Qorxunc olur dənizdəki fırtınalar.
Sahilləri gəmirsə də, o, hirsindən,
Yenə bir saf ana qəlbi, bir eşqi var.
Sıçradıqca ağ köpüklü o dalğalar,
Biz deyirik yenə coşan gilavardır.
Xilqətdədir qopan çovğun, əsən ruzgar,
Boranın da, tufanın da hüsnü vardır!
Bəzən çəkir qılıncını qopan külək,
Şiddətindən pəncərələr əsir zağ-zağ.
Ağzı üstə yerə düşür körpə uşaq.
Qocalarsa evə dolur büzüşərək.
Mən sevirəm büsatını boranların,
Fırtınasız, təlatümsüz keçən ömür
Röya kimi, xəyal kimi boş görünür;
Yaz da, qış da nəsibidir insanların.
Mən düşmənəm sükunətə əzəl gündən.
Ara-sıra dalğalansın qoca dəniz!
Fırtınalar dünyasında qoy nəslimiz,
Bərkidikcə, yaşa dolsun ana Vətən!

Eşidirsən? Bizdən bir az uzaqlarda
Dəniz kimi dalğalanır qəhrəmanlar...
Qana batmış o düzlərdə, o dağlarda
Yurdumuzun böyütdüyü mərd insanlar,
Tufan kimi qopur üstə fəlakətin.
Hər ətalət ölümüdür səadətin.
Böyük şəhər! Böyük şəhər! Qəlbin sənin
Gecə-gündüz ürək kimi nə qaynardır?
Sən düşünən bir beynisən bu vətənin,
Fəqət təsvir elədiyim ilk bahardır.
Bu mətləbdən uzaqlaşsaq söz qırılar,
Şeir, sənət dünyasının ahəngi var.
Bakı dedim... Bahar dedim sizə bayaq,
Sahil boyu ətir saçır yasəmənlər.
Hər addımda bir bağçalıq, bir təzə bağ
Üzə gülür axşam-axşam, səhər-səhər,
Seyr etdiyim bu ağaclar içində mən
Hamısından çox sevirəm çinarları,
Bəlkə gözüm alışmışdır körpəlikdən
Mən sevirəm çinardakı o vüqarı.
Vüqar dedim! Bu, insanda yaranmışdır,
Ömür boyu yaşayacaq, “varam” – deyə.
Onun hüsnü çinar kimi daranmışdır,
Vüqar da bir ziynət olsun qoy gəncliyə!
Gənclik dedim! Mən günəşi piyalə tək
Qaldırıram bu gəncliyin sağlığına.
Bir şöhrətdir saçlarımın ağlığına
Bu qüdrətlə sinəmdəki çarpan ürək.
Ürək dedim! O, müqəddəs bir ağacdır...
Qoy var olsun insanlığın bu ilk varı!
Ürək – oddur! Gecə-gündüz yanacaqdır.
Ürəkdədir min arzunun alovları!
Alov dedim, o da ağlın qanadıdır,
Yarıb keçdi zülmətləri şimşək kimi.
O, həyatın dünya görmüş ustadıdır,
O da sadiq yaranmışdır ürək kimi!

Söyüd! Söyüd! Fikri dalğın, qəlbi həssas,
Candan zərif insanlara bənzərin var.
Balta deyil, sənə bıçaq dəysə bir az,
Budağından damcı-damcı sular axar
Bir balaca tərpənəndə sərin külək
Xışıldayır qurd ağızlı yarpaqların.
Yay günündə yağış yağsa narın-narın,
Qol-budağın yerə düşür büzüşərək.
Eh... Nə deyim! Sən də belə yaranmısan,
Deyirlər ki, nə xeyrin var, nə bəhərin...
Zərər yoxdur, yenə sevir səni insan,
İnciməsin zərif telli hisslərin!
Bəs nə deyir nazlı badam, körpə püstə?
Bu nemətlər yarandığı gündən bəri
Busə kimi şirin olur dodaq üstə.
Yaxşı bilir bizim dağlı məhlələri;
Zövqü varmış babaların bu ziynətə,
Qoy püstələr, o badamlar az olmasın,
Qulluq edək, can yandıraq bu nemətə!
Onun nəsli gündən-günə azalmasın!
Şam ağacı, şam ağacı! Küsmə məndən,
Qış da, yaz da camalında bahar yaşar.
Sordum loğman qüdrətini çiçəklərdən,
Sən təbibsən, həyat adlı bir eşqin var!
Boy at, boy at! Göyə dəysin sənin başın,
Təmiz havan şəfa verir xəstələrə!
Qoy hər zaman insan olsun can sirdaşın,
Qoy var olsun bu məhəbbət... bu mənzərə!

Bakı! Bakı! On, on beş il bundan qabaq
Yadımdadır kiçik daşlı o torpaqlar...
Yadımdadır qum sovuran o tozanaq.
Xeyri varmı o səhnəni kamil yazaq?
O günlərdən nə bir əsər, nə nişan var,
Bakı, Bakı! Qoy var olsun ilk baharın;
Qüdrətindir gözəlliyin bu heykəli!

Dəyişmişdir hər səmtini min ruzgarın.
Vətən eşqi... Halal zəhmət... İnsan əli...
Alqış bizim zəfər taclı bu dövrana!
Bu dövranla çiçəkləndi qoca şəhər
Yaşa, Bakı! Yaşa, Vətən! Yaşa, Ana!
Yaşa, zəhmət!Yaşa, sevgi! Yaşa hünər!
Hələ göylər... Bizim göylər... Bir yaxşı bax!
Xəyal kimi sonu yoxdur bu göylərin.
Ağ buludlar dayanmışdır qalaq-qalaq,
Fəza dərin, dəniz dərin... məna dərin!
Rəssam qardaş! Bu mənanın seyrinə dal!
Bizim Bakı göylərinin əksini çək!
Qanad versin ilhamına qadir xəyal –
Səma – çəmən, ulduzların çiçək-çiçək!
Zümrüd səma! Zümrüd səma! Bu hüsnündən
Qoca rəngsaz ziynət versin saraylara!
Yarandığın, yaşadığın əzəl gündən
Bir əbədi şəfəq saçsın ilk bahara!
Bakı! Bakı! Üstündəki bu səmanın
Bir əvəzi varmı görən bu cahanda?
Qəlbin kimi nə genişdir asimanın?!
Bu mənadan duyduğumu bircə anda
Yüzillik bir ömür boyu yazsa qələm,
Camalından ilham alar bütün aləm.
Hələ bizim Qız qalası! O, vüqarla,
Əzəmətlə ucalmışdır mavi göyə!
Dik zirvəsi salamlaşır buludlarla
Bu şəhərin ilk övladı mənəm deyə.
Sözün düzü, mən acizəm təsvir üçün.
Səkkiz yüz il ömür sürən bu sənəti –
O heykəlin surətini çəkdi bir gün
Cabbarlının məndən böyük söz qüdrəti
Artıq sizi yormayıram, gözəl dostlar!
Çünki uzun sürəcəkdir bu ilk dastan.
Nədir bizim şəhərdəki gözəl bahar,
Mavi dəniz... Zümrüd səma... Azad insan!

*İkinci nəğmə*

## BAKI GECƏLƏRİ

Eşit, dünya! Qoca dünya! İndi qələm
Söhbət açır bizim Bakı gecəsindən.
Bu şeriyyət pərisini yazdıqca mən,
Bu axşamda nəfəs alsın bütün aləm!

* * *

Oxu, dünya, seyr etdiyim bu səhnəni!
Nə gözəldir qürub çağı bu şəhərin,
Ruha gülən bir axşamı hər ölkənin
Bəxtiyarlıq müjdəsidir min səhərin...
Axşam üstü... Hava sakit... Üfüq laldır...
Al günəşin şəfəqləri qıpqırmızı,
Bu həqiqət nə röyadır, nə xəyaldır...
Qadir günəş salamlayır baxtımızı.

* * *

Günəş, günəş! Mehribansan, gözəl pəri!
Sənin hüsnün yaranmışdır bir tamaşa,
Alov rəngli saçlarının şəfəqləri
Yayılmışdır üfüq boyu başdan-başa!

* * *

Dolandıqca göy üzünü sən vüqarla,
Ovçu keçir Mil düzündən səhər atla...
Sən, göylərdə öpüşdükcə buludlarla
Biz məşğuluq bu torpaqla, bu həyatla.

* * *

Yaşa, günəş! Mənalısan axşam çağı...
Uğurlu bir ayağın var bu aləmdə.
Meydan açır, büsat qurur qəlb ocağı
Sənin eşqin vicdanlara gülən dəmdə!

Yaşa, yaşa! O basılmaz qüdrətinlə
Yaranmışdır qara torpaq, bir də insan.
Hələ sirri açılmamış hikmətinlə
Söz açıram mən Bakının axşamından.
Nə görürəm: bürümüşdür məni heyrət...
Alov rəngi çökmüş bütün asimana.
Üfüqdəki yanğınmıdır? Şaşır diqqət...
Buludlarmı çaxnaşmada yana-yana?
Alov rəngi çökmüş bütün asimana!

Mən üfüqdə görməmişdim bu lövhəni,
Zümrüd göyə çox yaraşır lalə rəngi,
Qartal xəyal dolandırır yenə məni;
Hər səhnənin xoş olsa da öz ahəngi,
Zümrüd göyə çox yaraşır lalə rəngi.

Bir az sonra... Parçalanır şiş buludlar,
O al şəfəq neçə-neçə rəngə çalır.
(Bu qanundur – təbiətdə yoxdur qərar)
Bu gün günəş qürubundan ilham alır,
Al şəfəqi neçə-neçə rəngə çalır.

Buludların hüsnündəki o şəfəqlər
Gah abıdır, gah narıncı, gah da sarı.
Bəzən eyni gözəlliklə doğur səhər...
Nə əlvandır bizim Bakı axşamları –
Gah abıdır, gah narıncı, gah da sarı!

Ah, Rafael! Ah, Rafael! Qalx məzardan,
Öz fırçanla bu axşamın seyrinə var!
Bu qürubun hüsnündəki çəmənzardan
Sənətinə, ilhamına min rəng apar.
Öz fırçanla bu axşamın seyrinə var!

Xeyr! Xeyr! Sən ki, bizdən uzaqdasan!
Arzum kimi dolandıqca ömrün ili,
Şahid olsun sözlərimə bu gün zaman

Yaranacaq öz yurdumun Rafaeli!
Günəş sürür öz atını asta-asta,
Gözdən itir... O çəkilir dağ dalına.
Yavaş-yavaş zülmət enir evlər üstə,
Bir ağırlıq çökür insan xəyalına...
Bizim şəhər bağındakı sərçələr də
Cik-cik ilə yığışır öz yuvasına.
Lakin insan dalğası var küçələrdə,
Bütün şəhər çıxır axşam havasına.
Bu gün mən də bu dalğanın içindəyəm,
Bir arzuyla seyr edirəm insanları.
Nədir arzum? Cavab versin buna qələm,
Oxucular seyr eləsin qoy onları.
Saçları da, saqqalı da qar kimi ağ
Bir qocanın piranə bir siması var,
Mənalıdır alnındakı qırışıqlar...
Nələr deyir bükülmüş bel... Zəif ayaq...
Çoxlarından salam alan o ixtiyar
Bir təbibdir – həyat vermiş insanlara.
Səksən beş il ömür sürmüş o bəxtiyar.
Lakin yenə vurğun gəzir ilk bahara...
Sönməmişdir gözlərinin odu hələ,
Ürəyində arzuların sevdası var.
Qocalmamış bu dünyada min il belə
Sənətini məhəbbətlə yaşadanlar.
Sahildəsə gənclər gəzir yığın-yığın.
Gənclik ilə nəfəs alır yaz fəslimiz...
Müsibətin, fəlakətin, ayrılığın
Pis üzünü görməmişdir bu nəslimiz.
Bəzən uçur qəhqəhələr sahil deyə.
Ah, nə qədər mehribandır insan səsi!
Gah da bizim Nəsrəddinin lətifəsi
Şuxluq verir gülüş sevən bu gəncliyə.
İnsanlardan danışıram sizə bir-bir,
Necə çəkim mən hamının surətini?!
Təfsilatmı?.. Bu çox çətin şey deyildir...
Mənada gəz şerin, sözün hikmətini.

İnsan var ki, şöhrət verər insanlığa,
Gözlərindən hiss olunar mərifəti.
Sən onunla sirdaş olsan bir anlığa
Ömrün boyu unutmazsan bu ülfəti
İnsan var ki, el uğrunda candan keçər,
Yoxdur onun nə gecəsi, nə gündüzü.
Həyat onun əllərindən şərbət içər,
Qəlbi gümrah... Alnı açıq... Ağdır üzü...
Budur, belə bir dostuma rast gəlirəm;
O, bu axşam seyrə çıxmış təsadüfən.
Onun sadə həyatını mən bilirəm,
Bilir bizim ana torpaq, ana vətən.
Salam! Salam! Axşamınız xeyir ola!
Sən yaratdın ömrün həyat nemətini...
Bəxtiyardır o şair ki, səndən ala
İlhamının, sənətinin qüdrətini!
Söhbətimiz şirin keçir... Axşam da xoş...
Dostum deyir: – Bizdən haçan yazacaqsan?
Ürək şaddır, sahil sərin, hava meyxoş...
Yarat deyir yerə baxsan, göyə baxsan.
– Gözəl dostum! Bu sualı bir çox kərə,
Eşitmişəm sənin o saf dodağından.
Bilirsən ki, çox qarışıq keçdi zaman,
Səsimizi kömək verdik cəbhələrə...
Üç ildir ki, böyük bir şey yaratmadım;
Lakin sənin fəxrin olan mədənlərin
Sevdiyimiz bu axşamın, bu şəhərin
Keşiyində, əsgər kimi, mən yatmadım...
Gəldi zaman... Gəldi bu gün sənin növbən...
Başlayıram surətini bu dastanla.
Şöhrət tapdı zəhmətinlə bizim vətən.
Bir də geniş köksündəki o vicdanla!
Gözəl dostum! İlhamın var nəfəsində!
Bu sözləri öz eşqinlə yaratdın sən...
Bu dastanın sən beşinci nəğməsində!
Öz gözünlə öz hüsnünü görəcəksən!
Dənizdəki bir buruğun çıraqları

Ayrılmayır bu dostumun gözlərindən.
Fikri orda... Huşu orda... Ona sarı...
Gülə-gülə ayrılırıq dostumla mən.
İnsanlardan danışıram sizə bir-bir,
Necə çəkim mən hamının surətini?!
Təfsilatmı?.. Bu çox çətin şey deyildir,
Mənada gəz şeirin, sözün hikmətinin!
İnsan var ki, öz sözünün sahibidir;
Od içinə düşsə belə onu yeməz...
İnsan da var iradəsi yel kimidir,
Beləsindən bacardıqca kənarda gəz!..
İnsan var ki, dost yolunda can da verər –
Bu sədaqət babalardan yadigardır...
Sənin belə bir sirdaşın varsa əgər,
Evinə də, canına da haqqı vardır!
İnsan da var tez-tez girər qılığına,
Deyər: sənə qurban olsun dünya varı!
Yaxşı gündə küp-küp içər sağlığına,
Yaman gündə ceyran olar ayaqları...

Şəhər böyük, insan da çox... İndisə siz
Təkayaqlı bir oğlana nəzər salın.
Öpsün onun əsasını gözləriniz,
Yanındakı o dilbərdən ilham alın.
Gözəl bir qız könül vermiş o insana.
O nəfəslər ayrılmayır gecə-gündüz...
O məhəbbət... O saf alın... O açıq üz...
Halal olsun! Halal olsun qəhrəmana!
Bəs o kimdir? Gövdəsini sürüdükcə
Sifətindən bir ətalət yağır yerə...
Simasını bir kifirlik bürüdükcə
Ürək küsür, göz iyrənir birdən-birə.
Bir ona bax! Pələng kimi addım atan
Yel ayaqlı o gəncə bax qabağında,
Əsrimizin sürəti var ayağında...
O sürəti salamlayır bizim zaman.
Əlli illik ömür sürmüş bir nəfərin

Nə üzündə, nə alnında qırışıq var...
O, övladı olsa belə məclislərin...
Nəşəni də, qüssəni də duymayanlar
Arsız-arsız can gəzdirər bu dünyada,
Gözəl ömrü hırıltıyla verər bada.
Hələ baxın nə aləmdir, nə həyatdır
Yırğalanan, sığallanan o xanımlar!..
Dodaq məzə... Boyaq təzə... Bir büsatdır.
Ah...! Bunlardan danışmağa vaxtımmı var?!
Bir də, dostlar, mən istərəm diqqətiniz
Ayrılmasın gözəl-gözəl səhnələrdən.
Gözəlliyin öz vaxtında yarandıq biz...
Bu hüsn ilə yaşayırıq qələmlə mən!
Hava bir az sərinlədi... Qaranlıq da
Yavaş-yavaş çökdü bizim yollar üstə.
İnsanlarsa dayanmayır qaranlıqda...
Evə dönür qoşa-qoşa, dəstə-dəstə.
Mənim qəlbim ayrılmayır bu gecədən;
Ah, bu gecə! Bu gecənin vurğunuyam,
Öz yerimdə mıxlanmışam bu axşam mən.
Elə bil ki, aylar, illər yorğunuyam.
Bakı! Gecə!.. Yadımdadır üç il qabaq
Sahil boyu şölə saçan çıraqbanlar!
Yanacaqdır! Yanacaqdır yenə onlar
Ulduz kimi qatar-qatar alışaraq
Yenə hilal şəklindəki qızıl kəmər
Dolanacaq gərdəninə bu dənizin.
Şimşəklərdən qanad taxıb gəlir günlər.
Gəlir böyük səadəti ölkəmizin!
O vaxt yenə bu sahilin ağ şamları
Min toy qurub neçə gəlin köçürəcək!
Ah, o zaman bizim Bakı axşamları
Bir ilahi əfsanə tək görünəcək!
Sorun məndən, kimdən aldın bu xəbəri!
Al bayraqlı, zəfər taclı ordumuzdan!
O qəhrəman kimdən aldı bu hünəri –
Azadlığı şərəf sayan yurdumuzdan.

Seyrəlmişdir artıq insan, sanki şəhər
Baş qoyacaq sükunətin yastığına...
Lakin mənim sinəmdəki bu hisslər
Ziynət verir qəlbin qulaq asdığına...
Dalğalandı birdən hava... Radiolar
Geniş açdı öz ağzını səssizliyə,
Sakit gecə, sakit səma, sakit bahar...
Hökm verir bu aləmi dinlə deyə.
“Zabul segah”... Dəli “Şahnaz”... Mənalı “Şur”...
Sanasan ki, bir ananın övladıdır.
Ah, o xallar, o guşələr... fikir uçur,
Hər nəfəs də bir mənanın ustadıdır.
Bir də ki, “Rast”... sarı simdə nələr deyir...
Füzulunun sənəti tək mənalıdır.
Xəyalı da qəlbi kimi sevdalıdır –
Yaşa ilham, yaşa sənət, yaşa şair!
Söylə, o “Rast” sarı simdə nələr deyir!
Ara-sıra tramvayın şimşək səsi
Bu mənanın tellərini qırsa belə,
Yenə onun xoş avazı, xoş nəfəsi
Qartal kimi qanad çalır eldən-elə!..
Bir az sonra aşıq deyir dastanını,
Dinlə, Bakı! Nələr deyir Kirovabad!
Gah qəmərcən, gah bayatı, gah divanı.
Gecə sakit... Xəyal səyyar... Könül də şad...
Dinlədikcə mən onları, gəlib durur
Gözlərimdə Xaçbulağın yaylaqları.
Xəyalımda dövran açır, büsat qurur
Bizim Muğan düzlərinin ovlaqları...
Yazmaq ilə bitən deyil bu şeriyyət,
Ah, bu gecə – yurdumuzun sənətidir!
Gözəl Bakı! Qoynundakı bu ülviyyət
Azərbaycan torpağının qüdrətidir!
O nə səsdir? Nərə çəkdi zavod yenə...
Gözü üzündə buruldoqca o tüstülər
Nəfəs gəldi bu gecənin ahənginə;
Ürək kimi dayanmayır bizim şəhər.

Qara tüstü! Qara tüstü! Ucal göyə!
Çünki insan qüdrətindən yarandın sən!
Hayqır, zavod! O nərənlə həyat deyə;
Sən şəhərin övladısan, şöhrətisən!
Sənsiz keçən bir sükunət xoş olsa da,
Bir qəriblik andıraraq, o can sıxar.
Öz ömrünü sükunətlə vermə bada,
Hərəkətlə zülmət sönər, günəş çıxar!..
Yatmamışdır! Yatmamışdır böyük şəhər,
Bir fabrikin qapısından girirəm mən.
Bir yorğunluq oxunsa da nəzərlərdən,
Görmək olmur – od kimidir orda əllər...
Bəşər kimi nəfəs alır makinələr,
Lakin bizim insanlardan azdır yaşı.
Hər birinin öz dili var, öz sirri var,
Baş çıxarmaz bu aləmdən hər bir naşı.
Burdakılar başdan-başa qadınlardır –
Gəlinlər də, ağ birçəkli qarılar da
Fərhad kimi külüng vurub bu diyarda,
Bu alqışa hər birinin haqqı vardır!
Neçə millət... Neçə tayfa... Neçə insan...
Birdir eşqi... Birdir yolu... Birdir əli...
Yaranmışdır bizim zəhmət dünyasından
Qardaşlığın bu müqəddəs saf əməli!
İsti corab... İsti köynək... O yun əlcək
Ziynətidir gördüyünüz bu səhnənin.
Onlar bizim cəbhələrə pay gedəcək;
O yerlərdə həll olunur baxtın sənin!
Şeir oxu! Şeir oxu! – deyir dostlar,
Mən dindikcə bahar kimi üzlər gülür,
Baxışlardan, ürəklərdən nur tökülür.
Qoy var olsun azad insan! Azad bahar!
Gecə keçir... Mən gedirəm yeyin-yeyin,
Səyyah deyil, bu şəhərin öz səsiyəm.
Ey!.. Gecənin parolunu mənə deyin!
Cavab gəlir: Bizim Bakı fəhləsiyəm!
Saat birdir... Lakin, dayan... Dayan bir dəm.

Dalğalandı yenə hava, bir qulaq as!
Nə çalınır? Qulaq verir bütün aləm.
O nəğməni yavru kimi bağrına bas!
Sovet himni! Dalğalansın qadir səsin!
Möhtəşəmdir, müzəffərdir sənin adın.
Yurdumuza salam verən hər muradın
Tale kimi üstümüzdən kəsilməsin!
Dalğalandır! Dalğalandır göy havanı!
Sən canlısan! Şənimizdir alnındakı...
O səsinlə bizim şanlı Moskvanı
Öz qəlbində, vicdanında duyur Bakı!
Patrul: – Yoldaş, dayan! – deyir mənə bir an
Səliqəylə o yoxlayır vəsiqəmi...
Vətəndaşlar! Qarışıqdır indi zaman,
Keçib getdi o kef vaxtı, işrət dəmi!
Şəhər böyük... İnsan da çox... Lakin şəhər
Var olsun ki, necə keçir bir nizamla.
Yadındamı o qarışıq, ağır günlər?
Bizim Bakı şöhrət tapdı intizamla!
Hər qanunun öz qəlbi var bu diyarda,
Qəlbə dəysən! Yaman olar aqibətin.
Sevgisi var bizim yeni insanlarda
Qurduğumuz hər qaydanın, hər adətin.

Şəhər sakit... Gecə sakit... Göylərə bax!
Nöqtə kimi kiçilmişdir təyyarələr,
O şahinlər səhərədək yatmayacaq...
Yaşayacaq, yaradacaq bizim şəhər.
Artıq gəlib mən döyürəm qapımızı
Alışdığım hər zamankı bir adətlə.
Gəl, gəl deyir saf ürəklə, xoş sifətlə
İlk taleyim, bu mehriban ellər qızı.
Onun eşqi qəlbi kimi müqəddəsdir,
Qoy var olsun hər yuvada bir sədaqət;
O gözlərdən oxuduğum mehri ülfət
Yüz illik bir ilham üçün şerə bəsdir!
Bir az sonra yazı masam başla! – deyə

Ahənrüba qüvvətilə tutur məni.
Duyuram ki, sığışmayır yerə-göyə
İlhamımın qanad açmış söz yelkəni.
Ağ kağıza muncuq kimi düzüldükcə
Bir şəhərdən söhbət açan bu kəlmələr.
Oxucular! Nə tez gəlib keçdi gecə!..
Pəncərəmə şəfəq saldı yenə səhər –
Gözüm onda... Heyrət alır yenə məni,
Nələr varmış təbiətin kamalında!..
Gözəl Bakı! Yazdığımız bu gecəni
Mən görürəm al səhərin camalında!..

*Üçüncü nəğmə*

## KOMMUNİST KÜÇƏSİ

Dünya böyük, şəhərlər çox – bilirik biz,
Şöhrət tapır hər şəhərin baş küçəsi.
Daşqın olur gah gündüzü, gah gecəsi
Bəzən şaşır izdihamda diqqətimiz.
Göz alışır, könül doyur bəzən ondan,
Onun qədri o qədər də bilinməyir.
Lakin uzaq bir səfərə gedən zaman,
Xatirəsi yadımızdan silinməyir.
Qəribədir insanların təbiəti,
Nə qədər ki, ilahi bir hüsn ilə sən
Bir ölkədə, bir şəhərdə, bir yerdəsən;
Sən ondakı o müqəddəs şeriyyəti
Qəlbin kimi sevsən belə, yenə hərdən
O ülviyyət qaçıb gedir nəzərindən.
Lakin ondan ayrıldığın zamanlarda
Bu həsrətlə sığmayırsan yerə, göyə,
Ürək adlı yanğın qopur insanlarda
Həmdəm deyə, övlad deyə, vətən deyə.
Dinlə məni mehribanım, gözəl Bakı!
Söz açıram mən Kommunist küçəsindən,

Qoy ölkələr xəbər tutsun qoynundakı
Bu küçənin gündüzündən, gecəsindən!
Qəlbi geniş, köksü geniş, daş sinəsi
Qabarmışdır bir pəhləvan sinəsitək;
Kəsilməyir üstündəki həyat səsi,
Dayanmayır köksündəki qaynar ürək.
Alqışlayır onu günəş bir də ruzgar,
Göz baxdıqca bu səhnənin hər yanına...
Bu vüqarın, əzəmətin bənzəri var
Moskvanın məşhur Qızıl meydanına!
Aynabəndlər, ağ pərdəli pəncərələr
Açıldıqca bu küçəyə səhər-səhər,
O kölgəli eyvanları gördünmü sən?
De, keçdimi bir sərinlik ürəyindən?
De, gördünmü sən ordakı limonları?
Ətri xoşdur, yarpaqları yaraşıqdır.
Kim ki, sevir öz qəlbində ilk baharı,
Eyvanı da, aynası da sarmaşıqdır!

* * *

Bu möhtəşəm binalara diqqətlə bax!
Bu evlərə ziynət vermiş neçə memar,
Hər birinin öz şəkli var, öz hüsnü var...
Mən bu sənət dünyasından sizə, ancaq
Bir az sonra birisindən deyəcəyəm.
O binanın ətrafında gəzir qələm;
Dastanını yazdığımız bu şəhərin
Baş küçəsi dəniz kimi coşub qaynar.
Bu küçədə hər axşamın, hər səhərin
Yay da, qış da sinəsində külək oynar.
İsti avqust günlərin də xatirə sal,
O zaman ki, üstümüzə bürkü çökür,
Elə bil ki, göy ağzından alov tökür;
Sən Kommunist küçəsində bir nəfəs al.
Yadındamı, bəzən üzü yuxarı sən
Gedən vaxtda hücum çəkir sənə külək.
Gah papağın, gah örpəyin yellənərək





Bizim Sabir bağçasına düşür birdən.
Tənqidçilər deməsin ki, burda qələm
Vaxt itirir xırda-xuruş təsvirlərə.
Bir böyüklük görünsə də bütün aləm,
Neçə rəngdən yaranmışdır hər mənzərə.
Bir ümmanı görməyinlə fəxr etmə sən,
Kor da görsə o ümmanı deyil hünər.
Sənət deyir: ümman yarat zərrələrdən –
Bir zəhmətin surətidir hər bir əsər.
Qərəz... Mətləb qırılmasın. Sizə bu gün
Söz açmışam mən Kommunist küçəsindən.
Ürəyimdə nələr varsa qoy büsbütün
Boşalsın ki... Oxqay!.. deyim axırda mən.
Bayaq Sabir bağçasını yada saldım,
O bağçaya kim basmamış bir yol ayaq?
Mən ilk dəfə iyirmi il bundan qabaq
Bu şəhərin havasını burda aldım.
Sabir! Əvvəl söhbət açım qoy gəncliyə
Bu kəlmənin bir rəmz olan mənasından.
Sonra onun o qaranlıq dünyasından
Xəbər tutaq o dühaya hörmət deyə!
O, cəhalət dünyasında bir günəş tək
Şəfəq saldı öz yurdunun qüdrətinə.
Min boranla, min tufanla əlləşərək
Səbr elədi zamanının möhnətinə.
O dedi ki: Basılmazdır qadir insan!
Daş ürəkli qanunlara sinə gərdi.
O bağçanın əlvan sənət bağçasından
Bizim nəsil gül qoparıb, çiçək dərdi.
O, gülüşlə məlhəm qoydu yaralara
Qəflət ilə yatanlara "oyan!" – dedi.
İnqilabla şöhrət tapan bu diyara: –
– Günəş kimi al şəfəqə boyan! – dedi.
Söylə, tənqid! Neçə qış var, neçə bahar
Bir Sabirin o məzəli, xoş səsində?
Məncə, onun şikayətkar nəfəsində

Zəfər taclı bir inqilab dalğası var.
Bu gün yenə bizim Sabir bağçasında
Oturmuşdur arxalıqlı bir ixtiyar,
O, boşaldır nə varsa söz boğçasında,
Diqqət ilə qulaq asır ona dostlar.
Ağ saqqallı, nazik xətli, qarapapaq.
Bardaş qurub cütləmişdir başmaqları.
Bığlarını xınalayıb darayaraq
Oğlan kimi qarşılayır ilk baharı.
Nə bir kitab görmüş onlar, nə də məktəb,
Hər birisi yaranmışdır sinədəftər.
Gözlərində yuva salmış feyzi-ədəb,
Dillərində dastan olmuş qərinələr.
Hikmətamiz, arifanə söhbətlərin
İlhamı var o ağ tüklü sinələrdə.
Külək meyxoş, bağça təmiz, hava sərin,
Qocaların öz hüsnü var bu şəhərdə.
Qoca Hafiz, qoca Sədi, bir də Xəyyam,
Nizaminin dastan olmuş İskəndəri.
Bir söz, bizim keçən tarix, keçən əyyam –
Şeir, sənət dünyasının ilk səhəri
Əzbər olmuş qocaların lisanında,
Öz qəlbi var hər savadsız insanın da.
Zövq alırıq danışdıqca bu qocalar,
Yad deyilik hikmətlərin mənasına.
Lakin mənim deyiləcək bir sözüm var
Zaman görmüş bu qocalar dünyasına:
Təvəkkül də, əfsanə də, hər zaman da
Yaranmışdır insan ilə bir zamanda.
Hər tanrı da, peyğəmbər də, təriqət də,
Hər qayda da, hər qanun da, hər adət də
Bir zamanın ürəyindən qopan səsdir,
Hər nəsil üçün öz amalı müqəddəsdir!
Fəqət Şərqi, qoca Şərqi əfsanələr
Ayıltmadı təvəkkülün yuxusundan.
Bir nəfərin ətrafına toplaşaraq,

Xəyalata bir qul oldu yazıq insan.
Ərəb oğlu! Aç gözünü, bir bəri bax,
Eşit sən də, Hindistanın məhkum qızı!
Deyin görək, xəyalatmı qurtaracaq
O zəncirli, o kilidli baxtınızı?!
Xəyal xoşsa, bir səhərdir hər açıq göz
Bir səhər ki, min bir ətir saçmalıdır!
Hər ağıllı, hər mənalı deyilən söz
Bir hünərin qanadında uçmalıdır!
Gəl, oxucum! Gəl arxamca, indi gedək
Nizaminin bağçasında məclis quraq.
Hələ soyuq düşməmişdir, xoşdur külək,
Bir saat da bu bağçada biz oturaq,
Qoca bağban suladıqca çiçəkləri
İlk bahardan ayrılmayır gözlərimiz.
O fəvvarə sərinlədir ürəkləri,
Sanki bulaq başındayıq bu axşam biz.
Orkestro! Orkestro!.. Qadir səsin
Səda salır pəncərədən-pəncərəyə.
Qüdrətin var! Qoy gurlasın var nəfəsin,
Mən aşiqəm hər sevdalı mənzərəyə...
Səda dedim! – İstiqbala çağırışdır,
Bir həyatdır eşidilən hər bir avaz;
Səssiz ömrün qəlbi yazıq, fikri qışdır,
Bu mənada çiçək solar, gül yaşamaz.
Orkestro! Nəfəs alma, gurla görək,
Rəqsə gəlir oğlanla qız dəstə-dəstə
Bu bağçada neçə nəsil görüşərək
Sirdaş olur bir pərdədə, bir saz üstə.
Sula, bağban, bu bağçanı, toz olmasın!
Qızılgül tək ləkə düşər yanaqlara.
Gül, ey bahar, bu bağçalar heç solmasın:
Gözəllikdir ziynət verən hər bahara.
Analarsa öz yanında körpəsini
Bu bağçada seyrəngaha gətirmişdir.
Dinləyirik biz onların xoş səsini –
Hər bir budaq neçə meyvə yetirmişdir

İndi baxın kəlağaylı bir gəlinə,
Qarşısında üç oğlan var, iki də qız;
Kim sadiqsə analığın əməlinə,
Övlad adlı nemət olur haqqı yalnız.
Söylədiyim kəlağaylı xoşbəxt ana
Baxır bu gün ətrafına iftixarla...
Göz qoydunmu əlindəki o romana,
Ürəyinə söylədinmi sən vüqarla:

Yeni nəslin anaları bəxtiyardır!
Gözəlliyin bu şərəfə haqqı vardır.
O yandasa gülər üzlü beş-on uşaq
Bir nəfərin ətrafına toplaşaraq
Dinləyirlər on dörd yaşlı bir hünəri,
Çiçək açmış o şairin hissləri.
Oxu! Oxu! Körpə şair, xoşdur dilin!
Nəfəsində ana yurdun nəfəsi var.
O körpənin ilhamında siz də bilin:
Mənim kiçik rübabımın xoş səsi var.
Deyinməsin dargözlülər, bilir insan –
Paxıllıq da bir qurdudur rəzalətin!
Bilir dünya, bilir tarix, bilir zaman –
Həsəd olmuş ilk anası xəyanətin!
İndi bir az sizin qüdsi fikrinizi
Ayırıram bu bağçanın xoş səsindən.
Öz qəlbimdə duyub da hər birinizi
Söz açıram Nizaminin muzeyindən.
Sən Kommunist küçəsilə enən zaman
Çox dalmısan yüz rəng çalan bu sənətə.
O vaxt köksün qabarmışdır vüqarından;
Bakı! – deyib, baş əymisən ülviyyətə.
Nə zaman ki, al günəşin şəfəqləri
Kölgə salır bu binanın yüz rənginə.
O andırır əlvan donlu bir səhəri;
Hər səhnənin öz hüsnünə, öz rənginə
Başqa boyaq, başqa bir rəng vursa əlin,
Memar yoldaş! Puça çıxar öz əməlin!

* * *

Əlvan-əlvan o çeşidlər, o naxışlar
Zümrüd kimi, yaqut kimi şölə salır.
İnsan gözü!.. Onun həssas bir qəlbi var,
Hər zövqü də nəsil-nəsil bir irs qalır.
Hələ baxın, zərif-zərif o cizgilər –
Nə həssasdır, nə mahirdir insan əli!
Ehtiyatlı, səliqəli hər bir əsər
Gah şəfəqli, xoş görünür, gah kölgəli
Altı heykəl şöhrətidir bu binanın.
Hər birinin öz dövranı, öz dünyası,
Sanasan ki, rövnəqidir asimanın
Bu surətlər aləminin ilk mənası.
Birincinin simasında: "Şəbi-hicran
Yanar canım" söyləyərək alışan şam
Çıxa bilmir zülmətlərin qucağından;
Ah qoparıb, nalə çəkir səhər, axşam.
O mənalı baxışları xəyalpərvər,
Qəlbi kövrək, pərişandır onun səsi.
Boğulduqca, ağladıqca o gülümsər,
Bir tarixdir o rübabın təranəsi.
İkincinin surətindən nə yazım mən?
Alqış bizim səhnəmizin qüdrətinə!
Ziynət verdi o Vaqifin surətinə,
İlham aldı öz oğlundan ana Vətən.
Üçüncünün surətində bir hünər var,
Kamalında yeni əsrin fəlsəfəsi.
Qoca Şərqə, – ayıl! – deyir o sənətkar,
Keçdi, – deyir, – orta əsrin səfsəfəsi!
Boyun bükür Məstəli şah, Hacı Qara,
O qələmin xəncər olmuş qüvvəsinə.
Günəş kimi zülmətləri yara-yara
"Qarış", – deyir, – "Avropanın" gur səsinə.
Həyat deyir, torpaq deyir, insan deyir,
Dərk etdiyin, hiss etdiyin həqiqətdir!
Sən varlığa varlıq kimi inan, – deyir,
Bu ən doğru, ən müqəddəs təriqətdir.

Dördüncüsü – rübabıdır bu gün belə,
Qadınlığın, analığın, məhəbbətin.
Nəğmə kimi qanad çalır dildən-dilə
“Bənövşə”si “Ölürəm”i o ülfətin...
Beşincisinin qəribədir təbiəti:
Özü gülməz, başqasını çox güldürər.
“Ölülər” də dərd eləyir bu hikməti.
Bir hikmət ki, gah dirildər, gah öldürər.
Altıncının surətinə baxdıqca biz,
Yadımıza qılınc gəlir, qalxan gəlir.
“Sevil”, “Almaz” – öz dünyamız, öz əsrimiz,
O yandan da Aqşin gəlir, Elxan gəlir.

* * *

Altı heykəl, altı düha, altı vicdan,
Altı qələm, altı hünər, altı ürək!
Şahid olsun sözlərimə qoy gələcək;
Hələ bizim Azərbaycan torpağından
Nə dühalar, nə günəşlər yaranacaq.
Oxuyuram istiqbalı varaq-varaq.
Axşam ötür, az qalmışdı lap unudam
Cibimdəki bir çağırışı... Akademiya!
O binaya getməliyəm mən bu axşam –
Axtardığım nə lüğətdir, nə də kimya.

* * *

Açıldıqca qapıları onun lay-lay,
Hər səliqə, hər yaraşıq üzə gülür.
Pəncərədən gah gün düşür, gah da ki, ay;
Bu binaya təbiətdən nur tökülür.
“Buyur”, – deyir bizə mərmər pilləkanlar,
Bina geniş, səqfi uca, havası bol.
Bir abidə qoyub getsə hər sənətkar
Onun böyük ustasına deyək: sağ ol!
İndi sizə alimlərdən verim xəbər,
Sakit olur alimlərin təbiəti.

Həqiqəti idrak ilə kəşf edənlər
Yaranmışdır insanlığın son ziynəti.
Bu sakitlik, məncə, elmin fitrətidir,
Tufanda da şaşırmayır hüsni-kamal.
Hər kamal da bir dimağın siqlətidir,
Bu surətlə ziynət tapar hüsni-camal.
Elmin böyük qüdrətilə silahlanan
Bir ordu da, sərkərdə də basılmazdır.
Bu dünyada min il ömür sürsə insan
İdrak üçün, kamal üçün yenə azdır.
Təəssüf ki, yetişincə bir çörəyə
Bağlayırıq kitabların ağzını biz.
Bir qəflətdir, göz yummaqdır gələcəyə –
Bu sözləri unutmasın qoy nəslimiz!
İnsan oğlu öz elmilə loğman oldu,
Ayı, günü, ulduzları duydu ürək.
Mədəniyyət! Sənsiz neçə əməl soldu,
Neçə arzu, neçə murad, neçə dilək?
Elmin qartal qanadında uçan xəyal!
Siqlətin yox, hüdudun yox, nə səyyarsan!
Sehrkarsan, qəlbimizi kəməndə sal,
Sən daima yaşıl qalan bir baharsan!
Sən hakimsən! Çıxardığın bu qərarlar,
Bu qanunlar müqəddəsdir həyat qədər!
Sənin kiçik bir zərrəndə kainat var,
Bir anında nəfəs alır qərinələr.
Kim bilməyir sənin böyük qüdrətini?
Zənn etmə ki, sadəcə bir şairəm mən!
Daşdan çörək çıxardanın zəhmətini.
Öz əlinlə sən qurtardın köləlikdən.
Qoca Marks! Qoca Marks! Piranəsən,
Zəvvarındır yer üzünün dörd bir yanı...
Öz elminlə, kamalınla dəyişdin sən
Əflatunlar şərh etdiyi bir dünyanı!
...Akademya! Nələr vardır burda bilsən!
Min illərdən qalmış o əlyazmaları.
Xəbər verir yurdumuzun keçmişindən.

Hər vətəndaş bircə dəfə görsün barı!
O dərilər üstündəki gözəl xətlər
Babaların müqəddəs bir sənətidir.
O toz basmış, zaman görmüş hər bir əsər
Nəsillərin bir-birilə söhbətidir!
Hələ daşlar, o mədənlər, qırıntılar
Dayanmamış bir qəlbidir zamanların.
Azı-azı dörd min illik tarixi var
Azərbaycan torpağında insanların!
Kərgədanın çürüməmiş sümükləri,
Yaşamışdır, yüz min illər bundan qabaq.
Alim deyir: bizim Bakı səhraları
Öz-özünə alov kimi alışaraq
Yandırarmış nəfəs alan canlıları.
Fəqət nefti bir qan kimi soran torpaq
Yanmışların cəsədinə yapışaraq
Bir çoxunu yaşatmışdır indiyədək,
Qərinədən-qərinəyə "qal!" deyərək.
Gənc filosof! Mütəfəkkir durduqca sən
Alnındakı o cizgilər, qırışıqlar
Xəbər verir dahilərlə söhbətindən;
Qəlbindəsə bir tükənməz məhəbbət var.
Hər elmdən çox sevirəm fəlsəfəni –
O min hikmət şərh edərək, min sirr açar,
Hər dühanın öz günəşi bir nur saçar.
Bir günəş say sən də kamal xəzinəni!

* * *

Yeni tarix! Yeni tarix! De fəlsəfən
Hansı böyük həqiqəti açdı bizə?!
Təzadların vəhdətindən yarandın sən,
Eşqin – həyat, bayrağındır mübarizə!

* * *

İnsan ağlı yalnız elmin nəfəsilə
Dəniz kimi, ümman kimi aşıb-daşar.

Mənaların şeir-sənət nəğməsilə
Sözün ömrü həqiqətlə qoşa yaşar!
Yaşa, elmin qadir səsi! Bir tanrısan,
Qıfıllanmış hikmətlərə sənsən açar.
Böyüksən ki, yaratmışdır səni insan,
Bu hüsn ilə gün camalın şölə saçar!

* * *

Sən həqiqət aşiqisən! Nələr deyir
Öz qəlbinin, vicdanının sakit neyi?
Hər arzun bir ilahi səhər deyir,
Qoca tarix unutmamış Qalileyi!

* * *

Əmr olundu o dühaya son nəfəsdə:
Sən söylə ki, fırlanmayır qara torpaq.
– Mən deyirəm. Həqiqət də susmur, ancaq.
O deyir ki: Yer fırlanır oxu üstə.
Məslək eşqi, məslək eşqi, müqəddəssən!
Zəfər tacın ziynət verir ölümlərə.
Simasızlıq, yüz il ömür sürsən də sən,
Alqış səsi eşitməzsən bircə kərə.

İndisə biz qədəm qoyaq bir salona:
Ulduz kimi qatarlanmış çıraqbanlar.
Qurultaydır! Ölkə qulaq asır ona,
Bu xüsusda oxucumla söhbətim var.
Neçə libas, neçə sima, neçə sifət –
Müxtəlifdir qurultayda əyləşənlər.
Ürəklərdə ana yurda bir məhəbbət,
Dillərdəsə könül açan min bir xəbər.
Mədən oğlu, tarla qızı, çoban-sərkər,
Professor, vətəgəçi və komissar,
Min bir sənət ustaları, min bir nəfər,
Hər insanın öz nəfəsi, öz səsi var.
Nə ixtiyar, nə vəzifə, nə də rütbə

Ayırmayır bu məclisdə insanları.
Öz gözümlə çox görmüşəm mən onları,
İndi yazım gördüyümü növbə-növbə.
Sən, ikinci nəğməmizi xatirə sal,
Dinləyirəm o dostumun xoş səsini.
Mən duyuram avazından onun dərhal
Buruqların o yeraltı nəfəsini.
O rəqəmdən, o hesabdan qorxma, şair!
Hər rəqəmdə bir həyatın səhnəsi var.
Sayların da öz dili var, təklif deyir,
Az danışıb, çox iş görür yaradanlar.
Mədən oğlu! Mədən qızı! – deyir Bakı, –
Səninkidir bu ziynətlər, yaraşıqlar.
Yurdumuzun şöhrətidir alnındakı
O ləkələr, o cizgilər, qırışıqlar.
Mən görürəm döşündəki qoşa-qoşa
Şəfəq saçan, şölə saçan nişanları,
Ziynət verir, rövnəq verir dağa-daşa.
Yurdumuzun bu qəhrəman insanları.
Bəs o kimdir danışdıqca asta-asta,
Bir gül kimi qızarmışdır yanaqları;
Məclis böyük, o utancaq. Nə xüsusda
Söhbət açır o gəlinin dodaqları?
"Bizim kolxoz... Bizim zəmi... Bizim tarla..."
Kəlmə-kəlmə danışsa da o saf qadın,
Geniş köksü nəfəs alır iftixarla.
Ana torpaq! Anan mərddir, gözün aydın!
Səhər-səhər şeh düşəndə zəmilərə
Yaşıl şaxlar öpür onun əllərini.
Zəhmətinin nübarını dərə-dərə.
Salamlayır ömrün azad illərini!
Sözləri az, hünəri bol o bəxtiyar
Elçisidir kəndimizin qurultayda.
O, şəhərə gətirmişdir sanki bahar,
Camalında min ulduz da, gün də, ay da.
Professormu? – Salon sakit bir hal alır,
Söhbət gedir hərbi xəstəxanalardan;

İnsan ağlı doğrudan da heyran qalır –
Ölümlərdən xilas olmuş neçə insan!
Zaman sərtdir! – Bu tufanlar, fırtınalar
Aparacaq insanlığı bir bahara.
Qoy var olsun o alimlər, o loğmanlar,
O əllər ki, məlhəm qoyur yaralara!
Qurultayın al məxmərli kürsüsündən
Hesab verir neçə beyin, neçə ürək.
Ellər bizi ana kimi dinləyərək,
Haqq da verir hər bir işə ana vətən!

...Tənəffüsdür, dağılırıq qurultaydan,
Yol gedirik biz Kommunist küçəsilə.
Nə ulduzdan söz açıram, nə də aydan –
Danışmışıq bu şəhərin gecəsilə.

* * *

Axın-axın insanların izdihamı
Dəniz kimi dalğa vurur sahillərə.
Bir iş üçün, məqsəd üçün qoşur hamı,
Qoşur gözəl, səadətli bir səhərə...
Yolçu, yolçu, uğur olsun! Hara belə,
De, qoşursan hansı gözəl bir niyyətə?
Söylə hansı uğurlu bir cəmiyyətə
Sən gedirsən aydan-aya, ildən-ilə?
O aləmi mən görürəm, deyil uzaq...
Bir aləm ki, insanları bəxtiyardır.
Bir aləm ki, ürəyi saf, alnı da ağ,
Hər hissində bir solmayan şərəf vardır!
O aləmdə nə qan vardır, nə ədavət,
Nə rəyasət, nə cahangir, nə qəsbkar,
Nə bir kin var, nə həsəd var, nə xəyanət,
İnsanlığın bir hüsnü var, bir eşqi var!
Yolçu, yolçu, uğur olsun səfərinə!
Qoca Şərqi, de, çoxdanmı çağırırsan
O azadlıq, o qurtuluş səhərinə?
Lakin durur yollarında min-bir boran...

Əngəl olan hər tufanı, hər zülməti
Öz süngünlə, hünərinlə açmalısan!..
Qorxma, yolçu! Sən salamla qüdsiyyəti.
Zülmətdə də iradənlə uçmalısan!
Axır küçə... İzdihamla gedirəm mən,
İlahi bir səhnə keçir gözlərimdən,
Azərbaycan bir müzəffər ordu kimi
Addımlayır bu Kommunist küçəsilə,
Addımlayır qəhrəmanlar yurdu kimi,
Hər ayaq da bir ürəyin öz səsilə...

*Dördüncü nəğmə*

## İÇƏRİŞƏHƏR

Seyr et, səyyah, bizim qoşa qapıları,
Görürsənmi, onlar yenə pürvüqardır!
Açıq qəlbi, səxavəti, hüsnü vardır;
Unutmamış o ilk andı, ilk ilqarı.
Seyr et, səyyah, bizim qoşa qapıları,
Bir yaxşı bax, geniş köksü açılmışdır;
Buyur! – deyir dost ürəklə gələnlərə.
Sən baxma ki, bir çox yeri uçulmuşdur,
O da xoşdur Vətən qədri bilənlərə.

* * *

Bu qapıdan neçə nəsil gəlib keçmiş,
Yada düşür ömrün uzaq zamanları –
Bizim qala qapılardan azmı keçmiş
Zınqırovlu, yüklü dəvə karvanları?!
At çapdıran, ox süzdürən, nizə tutan
Nə oğullar gəlib keçmiş bu yerlərdən.
Bir çoxunu unutmuşdur onun zaman...
Söylə, səyyah! Bilirsənmi bunları sən?
Səyyah susur, çünki o da bu yerləri
Kitablardan oxumuşdur ala-seyrək,

Axşam kimi zənn edərək hər səhəri,
Həqiqətə boyaq vurmuş əfsanə tək...
Səyyah dalır bu cəlala bir diqqətlə,
Duyur sakit baxışımdan hörmətimi,
Mənsə könül mülkündəki bir riqqətlə,
Qonağıma başlayıram söhbətimi:
Səqfi çökmüş bu qalanın boz daşları
Boran görmüş, külək döymüş bir dənizdir.
Qalmasa da onun köhnə sirdaşları,
Sahibi var! – O da bizim ölkəmizdir!
Səyyah sorur: – Neçin sərtdir onun üzü?
Mən deyirəm: – Amansızdır qəsbkara!..
Bu qalalar çağırmışdır nəslimizi
Qurtuluşa, azadlığa, ilk bahara!
O gərdikcə yadlara tunc sinəsini
Xar olmuşdur neçə leşkər, neçə ordu;
Parçalamış cahangirlər nizəsini
Sən gördüyün bu alovlar, odlar yurdu!
Bəzən düşmən taleyinə gülmüş zəfər,
Qıfıllanmış dustaq kimi bizim ellər,
Şərəflilər öz-özünü çəkmiş dara,
Ya da gedib bu dağlarda qaçaq olmuş –
El içində şöhrət tapıb qoçaq olmuş.
Şərəfsizlər "buyur!" – demiş zalımlara
Bu son sətri mən dedikcə qonağıma
Bir sızıltı gəlib keçdi ürəyimdən...
Fəqət yerin səsi gəldi qulağıma:
"Tarixləri cəsarətlə şərh elə sən!"

Səyyah dostum! İndi sənə deyim bir az
Bu şəhərin bir çox qədim adətindən.
Mən dedikcə, dəftərinə xatirə yaz,
Öz ölkənə töhfə apar özünlə sən.
Mən duyuram istəyini bu gün sənin,
Hər səyyahın öz dinləmək qaydası var.
Bəzən ona sadəcə bir xatirənin
Yüz kitabdan daha böyük faydası var.

Bəli, kiçik bir hadisə, yaxud xəbər
Görürsən ki, ağızlarda əzbər olur.
Yaşatdıqca öz qəlbində onu ellər
Dildən-dilə möhtəşəm bir əsər olur.

Neçə xəyal, neçə duyğu, neçə lisan
Ziynət verir bir ilhama, həyəcana.
Bu qaydayla keçir həyat, keçir zaman,
Bir zərrəcik gəlib dönür bir ümmana!
Sən də, könül! Gəl öyünmə bu əsərlə,
Hələ baxaq, ellər ona nə ad verir?
Neçə ürək nəfəs alır bu səhərlə,
Neçə xəyal bu dastana qanad verir?
Bəxtiyardır o şair ki, bu dünyada
Yaxın dostu şeir duyan insan olsun.
Ömrü boyu neçə əsər yaratsa da,
Bir sözüsə dildən-dilə dastan olsun?
Hanı? Hanı? Bu taleyim varmı mənim?
Ürəyimdən xəncər kimi keçdi bu səs!
Cavab verdi bu suala öz vətənim:
– Sənin şerin xatirəsiz keçə bilməz!..

Doğmalıq var hər torpağın adətində,
Səyyah dalır, mən baxıram o gözlərə...
Bir təbəssüm işığı var sifətində,
Xoşmu gəlir danışdığım bu mənzərə?
Şaqqıldadı qoşa zurna axşamçağı,
Damdan-dama haray saldı nağaralar,
Min insanla doldu yolun solu, sağı –
Gəlin köçür! Gəlin köçür! Bərəkət var!..
Üzündəki lalə rəngli o al duvaq
Parıl-parıl ətrafına şölə salır.
İxtiyarlar ömrü açır varaq-varaq...
Subaylarsa ona baxıb ləzzət alır.
Yengə süzür, şabaş yağır, ölmə, aman!..
"Qaşa vəsmə, gözə sürmə çəkilmişdir".

Meydan qızır, gözlər qızır vurharaydan,
Elə bil ki, göy də yerə tökülmüşdür.
Yurdumuzda toxunulmuş şal tirmələr
Bu toydakı gözəllərin başındadır.
Xısın-xısın deyir eyni yetirmələr:
Köçən gəlin görən neçə yaşındadır?
Biri "on dörd", biri "on beş" deyir ona,
Görmək olmur o dilbərin camalını;
Qocalarsa göz gəzdirir tək boyuna,
Yerişindən nişan verir kamalını...
Hələ əllər, ağ biləkli ipək əllər,
Kəklik kimi xınalanmış, yaxşı baxın!
Öz eşqini, öz zövqünü duyan xalqın
Bir rəsmidir mən dediyim o gözəllər!
Qara kirpik tökülmüşdür yanaqlara,
Gözlərdəsə göz-göz olmuş bulaq qaynar.
Hələ öpüş dəyməmişdir dodaqlara,
Hələ onda qüdsiyyətin şövqü oynar...
Aha!.. Qoşa qapılardan yel tək əsən
Atlıların üzündəki heybətə bax!
Qabaqdakı kəhər ata deyin əhsən,
Elə bil ki, nallarından od qopacaq.
Ağ çuxası vəznəlidir bizim Aslan,
Cıdır gedir, arabir də tüfəng səsi...
Bir də atəşpərəstlikdən adət qalan
Bayramlara ziynət verən fişəng səsi...

Yaxşı bir at at buraxmaz öz yanına
Üstündəki qəhrəmanda ürək olsa...
Kimin atı hamısından yüyürək olsa
Ağ kəlağay bağlanacaq yalmanına.

Sahibisə papağını yan qoyaraq,
Ortalıqda pələng kimi dolanacaq...
Paxılların sifətində bir qaşqabaq,
Bəlkə bir az ürəyi də bulanacaq...

Meydan açın! Meydan açın! Dəstə-dəstə
İndi gəlir o sınanmış pəhləvanlar.
Hanı şərbət? Əvvəl verin içsin onlar,
Sonra qurşaq tutacaqlar meydan üstə.

Vur, nağara! Di şaqqılda, qoşa zurna!
Öz odunla sən onları qızdır görək!
Pəhləvanlar şirlər kimi əlləşəcək,
Hər ana da güvənəcək öz oğluna.

Yazdığımız o dövr üçün siz də bilin,
Qurşaq tutub güləşməyin bir dadı var.
Zarafatdır. Hər məhlənin, hər nəsilin
O meydanda öz qeyrəti, öz adı var.

Qabardıqca əzələlər, tunc sinələr –
Kim yıxılsa ad da düşür, san da düşür...
Bir ox kimi şəstə dəyir bu pis xəbər,
Görürsən ki, qırğın olur, qan da düşür...

Sən sadəcə vəhşət kimi baxma buna,
Günah varsa, şərəfi də qeyrətdədir...
Hər zamanın bir hökmü var öz oğluna:
Baş əyməmək, basılmamaq fitrətdədir!

İndisə gör, Xan sarayı nələr deyir –
Daş sütunlar heykəl kimi dayanmışdır.
Bu binanın üzü sərtdir, qəlbi qışdır,
Yelkən taxıb qanad açmaz burda şeir...

Beş yüz illik bu sarayın ömrü vardır,
Yaratmışdır Şirvan şahı Xəlilüllah.
Yazılardan gözə çarpır bir "bismillah",
O zər yazı bir rəssamdan yadigardır.

Bomboz olmuş artıq onun divarları –
Nə bir rəsm, nə bir səhnə, nə bir naxış...
O sənətdən, o ziynətdən iz qalmamış,
Silib yumuş tarixlərin min rüzgarı...

Bakı adlı, dünya görmüş bir limanda
O hökmüdar qurdu Şirvan paytaxtını.
Qəsbkarlar axışdığı bir zamanda
Dönə-dönə o sınadı öz baxtını...

Bayaq sizə söylədiyim o qalalar
Əsrlərcə sinə gərdi azğınlara.
Hər bir quyu yadlar üçün oldu məzar,
Hər baxış da bir ox atdı quzğunlara!..

Saraydakı neçə eyvan, neçə otaq
Xəbər verir bir büsatdan, bir cəlaldan.
Bu abidə oxunsa da varaq-varaq,
Əfsanə tək bəzən qaçır o, xəyaldan...

İç sarayda altı hücrə gördüm ki, mən,
Hər birinin öz mənası, öz adı var
Hankısından çıxarmışsa o hökmüdar,
Bilinərmiş bir cür qanun, bir cür qərar!..

Ətrafdakı kiçik-kiçik hücrələrə
Saray əhli toplanarmış yığın-yığın.
Divanxana, ən dəhşətli bir mənzərə –
Şahididir min ölümün, ayrılığın.

Yer altında bir quyudan, bir lağımdan
Boynu bükük çıxan zaman müqəssirlər.
Günəş belə qan ağlarmış səhər-səhər,
Xəlilüllah öz hökmünü verən zaman...

O, ağıllı olsa belə, yenə xanmış –
Adətiymiş göz çıxarıb, boyun vurmaq;
Qan üstündə qanun verib saray qurmaq –
Qaydasıymış! O zaman da bir zamanmış...

Qəribədir saraydakı başdaşları,
Bir çoxunu, yaxına gəl, seyr et barı.

Səliqəylə yonulmuşdur bir köhlən at.
Görünür ki, o zamanlar bizim elat.

At belində yetişərmiş hər murada.
Eh, nə deyim, nələr yoxdur bu dünyada!..
O, bəlkə də at belində qılınc çalmış
Bir igiddən, igidlikdən nişan qalmış...

"Qoça" bir bax! Buynuzları buruq-buruq,
Yadigardır köçərilər dünyasından:
Heyvanla da ülfət tutub, dost oluruq...
Neçə məbəd yaratmışdır bizim insan.

"Qoç" dediyim, zaman görmüş bu başdaşı
Bəlkə olmuş bir çobanın vəsiyyəti...
Bəzən ağıl şərh etməyir bir hikməti,
Baxır ona soyuq-soyuq, naşı-naşı.

Bir də "öküz!", təpəl öküz! Qəribədir:
Maral kimi qaldırmışdır öz boynunu.
Ayaqları uğurlumu? Söylə nədir?
İnsan oğlu bərəkətmi saymış onu?

Hələ qablar, saraydakı saxsı qablar
Tufan görüb dəyişməmiş öz rəngini...
O qablarda nə lövhələr, surətlər var!
Əzəl seyr et bizim dağlar pələngini.

Atmış enli pəncəsini əzəmətlə,
Qoca pələng cavanlaşır şikar vaxtı.
Kimə çəkmiş hücumunu o hiddətlə?
Qorxuludur kimin ömrü, kimin baxtı?

Bir nimçədə yamyaşıldır Muğan düzü,
Ovçu görüb ürək qaçır körpə ceyran.
Ah, nə qədər günahsızdır onun üzü,
O gözlərə hansı rəssam oldu heyran?

O bəlkə də eşqə düşüb, hicran çəkən
Qara gözlü bir gözəlin timsalıdır –
Bəlkə də ki, çox uzaqdır həqiqətdən –
Bir sənətkar dühasının xəyalıdır.

Hələ baxın qırqovula! Sehrkardır!
Yüz rəng çalır onun əlvan lələkləri.
Meşə yaşıl, axşamüstü, ilk bahardır,
Bir bahar ki, təmsil edir al səhəri.

Bu zövq əhli babalara rəhmət olsun!
Alqışlayın seyr olunan bu sənəti
Qəlbimizə, evimizə ziynət olsun
Azərbaycan torpağının təbiəti!

Ey oxucu! Ömrün boyu qalma darda,
Gəl qurtaraq saxsılarla bu söhbəti.
Fikri dönük, qəlbi sönük adamlarda
Mən görmədim saxsıdakı mərifəti!..

İndi sizə söhbət açım bir az da mən
Saraydakı Seyid Yəhya türbəsindən:
Hər zamanın öz tanrısı, öz Loğmanı,
Hər dövran da bir dühadan işıq almış.
Günəş kimi o seyr edib asimanı,
Min ürəyə, min vicdana şölə salmış.

Elmin böyük qüdrətilə Seyid Yəhya
Öz ömrünü kamal ilə vurdu başa.
Unutmamış o dühanı bu gün dünya,
Buyur, səyyah, türbəsini qıl tamaşa!

Bu türbəni bizim ellər ürəyində
Bir müqəddəs məbəd kimi bəsləmişdir.
Çünki o baş... hər ilahi diləyində
Ayı, günü, ulduzları səsləmişdir!

Deyirlər ki, o alimin xoş fitrəti
Çiçək açıb min bir qonça bağlayarmış
O gördükcə dövrandakı müsibəti
Zaman-zaman bulud kimi ağlayarmış...

Deyirlər ki, o, mehriban, pak əlilə
Təbib kimi məlhəm qoymuş yaralara.
"İnsan!" deyən, "həyat!" deyən əməlilə
İnsanlığı dəvət etmiş ilk bahara!

Dimağında, ürəyində qanad açmış
Yerin, göyün, bu varlığın min hikməti.
Qanun kimi dəyişdikcə baharla qış,
Günəş kimi o izləmiş təbiəti.

Onun aqil məsləhəti zaman-zaman
Yol göstərdi hökmdarlar dünyasına;
Ayıl, dedi, sən rəyasət yuxusundan
Sitayiş et həqiqətin mənasına!

O bəzən də yalqızlıqdan ilham aldı,
Zahid kimi könül verdi bir guşəyə...
Nəsiminin rübabını o da çaldı.
Bir Allah da, həqiqət də mənəm, deyə.

Qız qalası! Deyirlər ki, o zirvəndən
Seyid Yəhya seyrə dalmış ulduzları.
Kainatı Loğman kimi duyub qəlbən
O münəccim şərh eləmiş min əsrarı...

Ürəyində, məşəl kimi o yandırmış
Həqiqəti – həyat adlı təriqəti.
Yatanları cəhalətdən oyandırmış,
Qamçılamış hər uydurma şəriəti.

Qəlbi qara, fikri qara mürtəcelər
Bir oyunbaz, bir sehrkar demiş ona.
Vətən yurdu axşam-axşam, səhər-səhər
Məbəd kimi tanınmışdır öz oğluna.

Kükrədikcə zəmanənin küləkləri
O alimin zər yazılı şah əsəri
Hardansa da gedib çıxmış İstambula.
Satsalar da özü boyda qızıl pula,
Səyyar kitab öz yurduna gəlməlidir –
Bu, torpağın tələbidir, əməlidir!

* * *

Səyyah deyir: – Bu adətlər, əfsanələr
Qəlbimizə xoş görünür xəyal qədər.
Sulu qəlyan, acı tiryək nə oldu bəs?
Söylə, neçin yad etmədin onları sən?
Gizlədinmi bir səyyahın nəzərindən?

– Xeyr, dostum! Zənn etmə ki, mən onları
Birdəfəlik unutmuşam bu dünyada.
O zəhərlər neçə həyat vermiş bada...
Fəqət sənə hər torpağın öz baharı,
Öz varlığı, öz şərəfi, gülsün gərək...
Sən dediyin yaman-yaman o adətə,
Tiryək adlı, çarşab adlı fəlakətə
Mənim yurdum haqq-hesab verməyəcək!

O çarşab ki, üzü qara, qəlbi qışdır,
Ərəbistan torpağında yaranmışdır.
Bizim qızlar göz yaşları tökə-tökə
Zorla örtmüş öz başına o zülməti...
Hər könülə min qaranlıq çökə-çökə
Dustaq olmuş neçə qadın məhəbbəti!
Odur! Odur! Kəlağaylı o qıza bax!
Bizim yurdun kəlağaydır baş örpəyi,
Həşyələri neçə-neçə rəng çalaraq,
Şölə verir bu torpağın öz ipəyi.

Buyur, dostum, bu gözəllə gəl ol tanış,
Görürsənmi? O örpəyin ağdır üzü...
Avropanın qızlarına yaxşı danış
Bizim yurdu, bir də həyat zövqümüzü!

Sən danış ki, Azərbaycan gözəlləri
Tarix boyu azadlıqdan ilham almış.
Yaxşı gündə həmdəm olan hər bir pəri
Yaman gündə qalxan tutub, qılınc çalmış!

İndisə bax: nələr deyir dar dalanlar –
Bir çalağan ilan kimi burulmuşdur.
Bəzən bizə dar gəlsə də bu gün onlar
Elin geniş əllərilə qurulmuşdur...

Basqınçılar, qarətçilər birdən-birə
Quzğun kimi töküldükcə bizim yurda,
Ox tökülmüş, daş tökülmüş göydən yerə,
Neçə quldur öz başını qoymuş burda...

Toxunmasın bu yerlərə memar əli,
Bu döngələr, bu dalanlar yadigardır.
Hər dövranın öz sevdası, öz əməli,
Hər daşın da, kəsəyin də adı vardır...

Qoca səyyah, bir nəzər sal o eyvana,
Dünya görmüş o ağ saçlı qarıya bax!
Ah, o qadın nə gəlindir, nə də ana,
Bir az da gəl o könüldən söhbət açaq!

Xəzər! Xəzər! Fırtınalı, dəli Xəzər
Neçə yelkən qərq eləmiş, neçə qayıq.
Bizə qonaq gəlməsə də keçən günlər,
Əhvalını bəzən xəbər almalıyıq.

Mərd oğullar yelkən vurub gəmilərə,
"Bismillah"la atılarmış dalğalara.
Su üstündə göz açarmış yüz səhərə.
Gəmilərsə bu dənizi yara-yara –
Gözdən itib uzaqları salamlarmış,
Hər qəvvasın bir limanda dostu varmış...

Yüklənərmiş gəmilərə o vaxt tay-tay
Azərbaycan torpağının ipək malı,
Min xalçası, kəlağayı, tirmə şalı.
Ürək deyir, hər birini yerində say.

Bir də Quba bağlarının al-qırmızı,
Gah narıncı, gah da sarı almaları.
Andırarmış bir əbədi ilk baharı
Çox almayım bu saylarla vaxtınızı...

O tayların ziynətiymiş hər bir zaman
Bizim Bakı bağlarının zəfəranı.
Söylə, səyyah! Sən gəlmisən Avropadan,
Bu nemətin yer üzündə misli hanı?

Sonra, bizim gəmiçilər qayıdan baş,
Min sovqatla gələrlərmiş yar yanına...
Qızıl sırğa, gümüş kəmər, neçə daş-qaş
Düzülərmiş gözəllərin gərdanına.

Axışarmış Hindistanın bol şəkəri,
Məclislərə ziynət olmuş İran çayı;
Türkmənlərin bol "qaragül" dəriləri,
Ayrıcaymış dost-aşnanın adət payı...

Rusiyanın buğda unu, mis mədəni,
Top-tüfəngi, bol-bol xəzi, bir çox varı.
Hollandyanın qayçı kəsməz mahudları
Deyərmiş ki: sən məni tut, mən də səni!

Lakin dəniz, zümrüd səma, bir də ruzgar
Bir qəzəblə küsən zaman talelərə
Ağız açmış fil xortumlu göy dalğalar,
Ölüm demiş, insan demiş o mənzərə.

Nə göy, nə yer, nə bir işıq, nə də torpaq!
Göz bağlarmış o sıx duman, qatı çiskin

Qayıqlarsa ölüm ilə çarpışaraq,
Əlləşərmiş pəncəsilə fəlakətin.

O zamanlar hələ yoxmuş qiblənüma
Bilən yoxmuş elmin böyük qüdrətini.
İnsanların ürəyində xeyir-dua...
Bir Allaha bağlayarmış niyyətini...

Tufanlarda həlak olmuş qəhrəmanlar
Bir həsrətlə boylanaraq tutqun göyə,
Ölümə də "qismət" kimi baxmış onlar,
"Əcəl gəldi, ömür tamam oldu"– deyə!

Fəlakəti qanun kimi qarşılamaq,
İnsanlara soyuqluqdur, təsəllidir.
Bütün dərdlər bu qaydayla keçir ancaq...
Dərd əhlinə, qəm əhlinə bu bəllidir!

Gəlib keçir başımızdan fırtınalar,
Dilə düşür hər ruzgarın bir sevdası.
Xəzər! Xəzər! De nə qədər dastanın var?
Qəribədir: "İki qardaş" macərası.

* * *

Dəyişirəm vəzni qəsdən,
Yüngülləşsin yaman xəbər...
Döyünməsin qoy ürəklər,
Qıymayıram onlara mən!

İki qardaş, iki ürək
Balıqçıymış bu dənizdə.
Xatırlayıb köhnələr tək,
Rəhmət olsun! – deyək biz də!

Qoy, içərişəhərlilər
Oxuduqca bu dastanı,
Yada salsın səhər-səhər
O dənizi, o tufanı...

Bir yay günü, səhər erkən
İki qardaş düşdü yola.
Qanad açdı suda yelkən,
Sahil dedi: uğur ola!

Zümrüd göydə günəş yandı,
Parıldadı ayna dəniz.
Al şəfəqə yer boyandı,
Dedi: xoşdur səfəriniz!

Gözlər açıq... Ürəklər şad...
İki qardaş bəxtiyarmış,
Dəniz sakit... Yelkən azad...
O səhərin hüsnü varmış.

Gəmi süzür yavaş-yavaş,
Sonra yelkən itir gözdən.
Dəniz dostu iki qardaş,
İlham alır saf dənizdən.

Bir az sonra tor açılır,
İslandıqca batır suya.
Göydən yerə nur saçılır,
Tor rast gəlir bir orduya.

Balıqlarmı qoşun çəkən?
Hara sürür karvanını?
Fəsil-fəsil gəzir onlar
Bu dənizin dörd yanını...

Gəzir onlar bir nizamla,
Yuva qurub, kürü salır,
Yayı, qışı intizamla
Orda-burda qərar alır.

Qızıl balıq, azad mahı
Gümüş rəngli xalları var.

Balıqların odur şahı,
Kababından ləzzət apar!

Kütüm balıq təmiz, dadlı,
Plov üstdə məzəlidir –
Suyu şirin, zər qanadlı,
Əsil yurdu Ənzəlidir.

Sazan da var... mərifəti
Gönü qalın adamlar tək.
Bıçaq kəsməz olur əti,
Məclisinə qoyma görək!

Şamayısa az-az olur,
Yağda qızart, ye, nuşican!
Damaq duru, kef saz olur,
Yediyindən doymaz insan...

Kişmişlə qoz, axta, zoğal,
Soğan qızart onlara qat.
Qoy yığışsın əhli-əyal,
Badə götür, de "həzərat..."

Bir də xəşəm... Yağlı xəşəm,
Salyandadır bu nemətim.
Balıqçılıq deyil peşəm,
Uzanmasın bu söhbətim.

Doldu bayaq gedən gəmi,
O tərpəndi yavaş-yavaş.
Sükan tutan iki qardaş
Seyr edərək o aləmi.

Artıq evə yol aldılar,
Dəniz sakit, yelkən azad...
Hər könüldə bir saf murad...
Əsmə ruzgar! Əsmə ruzgar!

Fəqət kordur, kardır külək,
Nə qəlbi var, nə duyğusu.
İstədimi o əsəcək...
Nə eşqi var, nə arzusu.

Yaman qopdu o gün tufan,
Yaman əsdi külək birdən.
Dəniz coşdu fırtınadan,
Daş qopardı sahillərdən...

Endi suya duman, çiskin,
Gözlərə də bir qaranlıq.
Dənizdəki qəzəblə kin
Soyumadı bircə anlıq...

Köpüklənən ağ dalğalar
Sahilləri aşıb daşdı.
Fəlakət var! Fəlakət var!
Öz yolunu gəmi şaşdı...
Şaşdı sükan, şaşdı yelkən,
Heç tufana düşdünmü sən?..

Dəhşət! Suyun şiddətindən,
Dalğaların hiddətindən,
Təknə dəlik-deşik oldu,
Su gəmiyə axıb doldu.

İki qardaş qaldı darda,
Nə sahil var, nə qaraltı
Görünməyir dalğalarda
Nə göy üzü, nə yer altı!..

Yaralanmış qanad kimi,
Yazıq yelkən endi suya,
Qardaşlarsa həyat kimi,
Ölümünü duya-duya –

Saraldılar. Lakin yenə
Sığınaraq baxt deyənə,
Atıldılar bu dənizə,
Dalğalarda üzə-üzə.

Hansı səmtə! Deyin hara?
Deyin varmı istiqamət?
Xeyr! Xeyr! Bir qiyamət
Nəsib oldu qardaşlara...

Həyatda da beləyik biz.
Nə zaman ki, məqsədimiz,
Mənzilmiz deyil bəlli,
Çalışsaq da biz dörd əlli,
Kor-koranə bir zəhmətdən
Tez yorular başla bədən.

Lakin məqsəd dünyasına
Açıq gözlə baxan ərlər
Ömrün bütün mənasına
Şölə saçıb, şəfəq verər...

İşıq yolda göz yorulmaz,
Xəstə düşməz əsəblər də.
İnsan oğlu düçar olmaz,
Hər zülmətdən doğan dərdə...

Fəlsəfələr! Fəlsəfələr!
Bir əl çəkin yaxamdan siz!
Uzandıqca söhbətimiz
Şerin oxu daşa dəyər.

Üzür, üzür, iki qardaş,
Dəniz qara, axşam qara.
Döş vurduqca dalğalara
Kiçik qardaş yavaş-yavaş
Gücdən düşür... Gözü dolur...
Yarpaq kimi rəngi solur.

Ölüm! Ölüm! De qarşında
Kimin rəngi saralmamış?
O balıqçı gənc yaşında
Öz eşqindən kam almamış
Yemmi olsun balıqlara?
Dəniz qara... Axşam qara...

Böyük qardaş – kömək əli,
Yaman günün yarağıdır...
Qardaşlığın pak əməli
Ömrümüzün növrağıdır!

O, kiçikdən yapışaraq
Alır onu döşü üstə;
Arxa üzür asta-asta.
Lakin kiçik deyir: Burax!
Burax məni, yoxsa bu an
Sən özün də batacaqsan!..

Yarım saat! Yarım saat!
Onlar üzür bu minvalla.
Su üstündə iki həyat
Bir arzuyla, bir xəyalla
Öz-özünə axır, ancaq
Tale necə qurtaracaq?

Artıq, böyük də taqətdən
Düşdü, tamam bihuş oldu.
Bu dəm kiçik batdı birdən –
Gözdən itən bir quş oldu.

O, ah çəkib batdı suya,
Döşündə bir zərli Quran...
Son hicranı duya-duya
Köçüb getdi bu dünyadan,

Susdu külək! – Sevin ki, sən
Qaydasına düşdü dəniz.

Nə tufandan, nə gəmidən
Su üstündə qalmadı iz.

Yaslı-yaslı baxdıqca ay
Deyir: dünya kimə qaldı?
Parçalandı bulud lay-lay,
Hər ulduz da şəfəq saldı.

Yanma səma!.. Çox da yanma!..
İşini gör, çox dayanma!
Artıq min il ağlasan da,
Min il qara bağlasan da
Neyləyəcək bizə matəm?
Öz atını çapır aləm,
Dəyişməzdir çünki məna...
Bir də sənin, qoca dünya,
Qəribə bir gərdişin var,
Yaman-yaman vərdişin var.
Bir əlinlə sən qurursan,
O birilə uçurursan.
Sən qıyırsan naşı-naşı,
Ömrün əziz bir vaxtına...

Sonra töküb min göz yaşı,
Yas tutursan öz baxtına!
Tale, belə olsan da sən,
Doğrudan da gülməlisən!..

Böyük qardaş nə oldu bəs?
Harda qaldı o qəhrəman?
Nə bir səs var, nə də nəfəs –
Yoxsa uddu onu tufan?

Doğur günəş, doğur səhər.
Gör nə deyir bu mənzərə:
Şırıl-şırıl göy ləpələr
Yüz naz satır sahillərə.

Uzaq... Uzaq... Bizdən uzaq...
Bir sahildə qumlar üstdə,
Taqəti yox, bənizi ağ
Kim tərpənir asta-asta?

Aha! Qalxır o ayağa,
Bir səmadır, bir də dəniz.
Boylandıqca sola, sağa
O görməyir insandan iz.

Yerindədir hafizəsi –
Fəlakəti o andıqca
Haray salır ağlar səsi:
“Qardaş!..” deyib o yandıqca.

Lərzə düşür yerə, göyə...
Öz başına döyə-döyə
Məcnun kimi düşür çölə;
Arabir də gülə-gülə:
“Sənsən? Sənsən? Gəl öpüşək!”
Lakin xəyal bir kölgə tək
Axıb gedir bircə anda...
Ürək yoxmuş asimanda!

Dinməsə də yerin qəlbi
O qardaşın fəryadına,
Dünya görmüş səyyah kimi,
Ağıl yetir imdadına.
O ayılır xəyallardan
Nə qardaş var, nə də gəmi...
– Qurtarmadım onu dardan,
Görməyəydim bu aləmi.
Deyə, fikrə gedir yazıq
Nəfəs alır bir azacıq.
– Xeyr! Xeyr! Nə üzlə mən
Geri dönüm bu qürbətdən?
Hələ gəlin, ata, ana...

Qohum-qardaş, dost aşina...
Ah! Nə deyim mən onlara?
Qaydımmı üzü qara?

Oxucular! O zamandan
Gəlib keçmiş düz altmış il!
Bu günədək o insandan
Bir xəbər də məlum deyil!

O dözmədi bu möhnətə
Üz tutaraq bir qürbətə
Səyyah kimi mənzil aldı,
De öldümü, sağmı qaldı?

Bəs Zərnigar? Gəlin noldu?
Duvağını heç açmadan,
Öz ətrini o saçmadan
De, saralıb tezmi soldu?

Səhər, axşam bu eyvandan
O, dənizə azmı baxdı?
Qıfıllandı o zamandan
Zərnigarın gəlin baxtı...

Göz zillədi o min dəfə
Hər qayığa, hər gəmiyə.
Çox boylandı yar tərəfə,
“Bu gün sabah gələr” – deyə...

Arabir də hər gəmini
Bir gəmiyə çox oxşatdı...
O nə tapdı həmdəmini,
Nə bir şirin yuxu yatdı.

Ay dolandı, il dolandı.
Hicran odu alovlandı.
Dost-aşina, qohum-qardaş
Zərnigara çəkirdi baş.

“Gedən gəlməz bu dünyada,
Öz ömrünü vermə bada.
Üç il keçdi, daha bəsdir!
Gözləsən də bu əbəsdir.
Gözəl hüsnün, gözəl adın
Bir həftəylə dul olmadın!
Hələ qızlıq camalın var.
Əl işin var, kamalın var,
Sən də ev tik, bir yuva qur,
Qanun budur, qayda budur!”

Zərnigarsa xəstə təki
Susur...susur... sanki laldır;
Ah o dalğın gözlərdəki
Nə ümiddir? Nə xəyaldır?

Ürəyində deyir Nigar:
“O gələcək... O gələcək...
Saf ürəklər, saf arzular
Bir danışıb, bir güləcək!”

* * *

Bu minvalla keçdi aylar, keçdi illər,
Zərnigara yetişmədi bir şad xəbər.
Susdu səma, susdu dəniz, susdu torpaq,
Əsdi külək, soldu çiçək, düşdü yarpaq...
Puça çıxdı Zərnigarın ilk arzusu.
Gözlərindən süzüldükcə o qaynar su,
Lalə rəngli yanaqlara ləkə saldı.
Qoca dünya! Etibarın kimə qaldı?
Keçdi zaman, saç ağardı, bel büküldü,
Ömrü boyu bir yuxuda deyib güldü...
Bu gün belə onun qəlbi yana-yana,
Adət üzrə hər gün çıxır boş eyvana.
O, dənizi sakit görsə şad dolanır,
Tufan görsə dəniz kimi bərk bulanır.
Sifətində yuva salır dumanla çən –

Qələm ilə yazılarmı başdan keçən?
Ayırmayır gözlərini gəmilərdən,
Qoca vaxtı bir təsəlli tapır hərdən...
Bu ilahi intizarda min vüsal var.
Bəxtiyardır məhəbbətlə yaşayanlar!..

Səyyah dostum! İndi tanı Zərnigarı!
Bayaq sana göstərdiyim yalnız qarı
O gözəldir... Səyyah susur, sonra deyir:
– Sualın var? Mən deyirəm ona: – Xeyr!
Eşq əhlinə yabançıdır sorğu-sual,
Etiqadla keçən ömrə yoxdur zaval...

Qoca səyyah düşündükdə dalğalanır,
Elə bil ki, ürəyində odlar yanır –
Bu dastanın atəşidir o alovlar!
Gözəl dostum! İndi mənim bir arzum var –
Səyyah üçün dar görünən bu dalanlar
Görürsənmi nə ürəklər bəsləmişdir?
Qoy utansın iftiralar və yalanlar...
Hər yuvamız neçə şahin səsləmişdir!
Sən yenə də Avropaya dönən təki,
Yazdığımız bu İçərişəhərdəki
Dalanlardan, döngələrdən kənara qaç,
Mənim kimi ürəklərdən yüz söhbət aç!

*Beşinci nəğmə*

## BURUQLAR SƏLTƏNƏTİ

Ah, nə deyim, nə ad verim bu aləmdə mən sana?
Al, bu qələm, bu da kağız, öz hüsnünü yazsana!
Nə gülşənsən, bülbül olub dörd yanını dolanam,
Nə canansan, həsrətindən dərya kimi bulanam,
Nə sərvsən qumru kimi budağında dil açam,
Nə səhərsən günəş olub camalına nur saçam,

Nə insansan, məclisində aşıq kimi saz çalam.
Nə loğmansan, hüzurunda hikmətlərdən söz salam...
Nə dastansan, yavaş-yavaş varaqlayam səni mən,
Nə arifsən, bir duyasan nələr keçir sinəmdən...
Nə də axar bir çeşməsən süfrə açam başında,
Al günəşə sağlıq deyəm ömrün bahar yaşında,
Nə məbədsən, nə ocaqsan səcdə qılam tüstünə,
Nə zülmətsən, şimşək olub qılınc çəkəm üstünə!
Ah, nə deyim, nə ad verim bu aləmdə mən sana?
Al, bu qələm, bu da kağız, öz hüsnünü yazsana!
Söylə, nədir ürəyində alovlanıb yanan şam?
Başındakı nə xəyaldır, sahil boyu hər axşam
Nə zaman ki, şəfəq salır ayın solğun camalı
O mənadan ilham alır insanlığın kamalı...
Nə zaman ki, ulduzların karvan yolu açılır,
Sahil susur, mavi suya ipək nurlar saçılır,
Söylə, hansı ülviyyətə, şeriyyətə dalırsan?
Öz başından keçənlərə bəlkə heyran qalırsan?
Bəlkə min il bundan qabaq alovlanıb kül olmuş,
Eşqi kimi, baxtı kimi, ömrü məhkum doğulmuş
Bir pərinin nəfəsidir ürəyində alışan?
Hanı? hanı? De varmıdır, o dastandan bir nişan?
De, bəlkə də qucağında şölə çəkən min çıraq
Bir məhəbbət rəmzi kimi hər ürəkdə yanacaq...
De, bəlkə də alov saçan od püskürən nəfəsin
Parçalanmış varlığını zülmətli bir qəfəsin.
Sehrli bir xəyal kimi süzüldükcə o şölən...
Zənn etmə ki, soyuq baxıb, yadlar kimi görünən
Bir yolçuyam... Xeyr! Sənin hüsnündəki şəfəqlər
Dastanımın gərdəninə düzüldükcə hər səhər,
Bir nur kimi xəyalıma, vicdanıma süzülür,
Bir anlığa bu torpaqdan ayaqlarım üzülür...
Babaların xəyalında ölüb gedən o cənnət,
Bu torpağa dəfn olunmuş min talesiz məhəbbət,
Neçə iman, neçə məbəd, neçə aşiq, neçə yar
Neçə çovğun, neçə tufan... allı-güllü min bahar, –
Ümidlərin, arzuların o azadlıq şöləsi,

Dünyagörmüş, zaman görmüş bir millətin haqq səsi,
O nizələr, o mizraqlar, ox süzdürən o əllər,
Vaxtsız açıb, vaxtsız solan o müqəddəs əməllər
Ulduz kimi səpələnir xəyalıma bir anda,
Xatirə tək sönüb gedir o məkan da, zaman da...
Ah, nə deyim, nə ad verim bu aləmdə mən sana?
Al, bu qələm, bu da kağız, öz hüsnünü yazsana!
Bu xəyalla seyr edirdim buruqları bir axşam,
Lakin könlüm sarayında nə söz vardı, nə ilham...
Yorğun-arğın addımlarla dolaşırdım yenə mən,
Ürək dilsiz bir daş kimi asılmışdı sinəmdən,
Öz-özümə deyirdim ki, tuti təbim lal oldu!
Şeirlərim, dastanlarım bəlkə bir xəyal oldu!
Bəlkə məndən "Şeir qızı" küsüb getdi pəri tək...
Bəlkə ömrüm bundan sonra yaman günlər görəcək...
Bəlkə təbim çeşmə kimi qurumuşdur binadan,
Kaş ki, şair gəlməyəydim bu dünyaya anadan.
Hanı dünən baş götürüb dalğalanan axar su,
Hanı mənim sinəmdəki o yaratmaq arzusu?
De, hardasan, gözəl pəri! "İlham" adlı şux mələk?
Mən qumsala oturmuşam bir sahibsiz gəmi tək.
Gəl, amanın bir günüdür! Yenə də yelkənim ol!
Bu çarpaşıq dalğalarda özün göstər mana yol...
Özün dedim, çünki sənin gülüşündən yarandım,
Sənin kəlam qüdrətindir ilk mənzilim, son andım...
Sənsiz mənim nəfəsim də buz bağlar şaxta kimi,
Söylə, ilham həsrətinə dözüm nə vaxta kimi?..
Bu arzular nəfəs kimi baş qaldırdı sinəmdən,
Sahildəki bir buruğa yaxınlaşdım bu vaxt mən.
Onun taxta qəfəsində alnıaçıq, üzüağ
Bir ismətli gözəl kimi alışmışdı bir çırağ.
Onun sirli şöləsində nə duyurdum bilsəniz –
Bir mən idim, bir gecəydi, bir o çıraq, bir dəniz...

Bir dilə gəl, yanan məşəl, nə gözəldir surətin?
Nə sirsən? Nə sehrsən? Söylə, nədir hikmətin?
Nədir gülər şöləndəki açılmamış o məna?

Nə yazmışdır taleyinə əzəl başdan bu dünya?
Sən gecələr sahil boyu yanıb şölə çəkəndə,
Dənizdəki duman, çiskin göz yaşları tökəndə
De, gözündə hansı tarix varaq-varaq oxunur?
Hansı zülmət tilsiminə fikrin oxu toxunur?
De, bəlkə də bu torpağın əzəldən and içdiyi,
Unudulmuş şəhidlərin öz canından keçdiyi
Yerin, göyün qatlarını məşəl kimi gəzmisən!
Zəfər taclı bir muradın nur qanadlı rəmzisən...
De, başından çoxmu əsdi acı tufan, qara yel?
Xəncər kimi doğradımı ürəyini o tel-tel?
Qüdrətində nə sirr var, tufanlarda sönmədin,
Öz eşqinlə, vüqarınla ayaqlara enmədin?!
Bəlkə insan nəfəsi var bu şöləndə, ey çıraq!
Olmazmı ki, bu sirrindən kainata söz açaq?
Ah, nə deyim, nə ad verim bu aləmdə mən sana?
Al, bu qələm, bu da kağız, öz hüsnünü yazsana!

Gecəm keçdi bu fikirlə, qarşıladım ilk səhəri
Dinləyirdi addımımı Bibiheybət mədənləri.
Könlüm, gözüm heyran idi buruqların vüqarına,
Günəş salam gətirmişdi bizim Odlar diyarına.
Mənsə baxıb ana yurdun bu qüdsiyyət camalına,
Deyirdim ki, bir söz qoşum bu torpağın kamalına...
Yerin səsi gəldi birdən... O dil açdı məzəmmətlə:
– Ayaq saxla! Dayan! – dedi qulağıma o hiddətlə.
Öz yerimdə donub qaldım: – Buyur! – dedi, – əmrin nədir?

Səndən özgə nə varsa da, gəldi-gedər, əfsanədir,
Ana torpaq! Sən ilhamın, bir də şerin ilk səsisən,
Min duyğunun, min arzunun, min əməlin nəfəsisən.
– Düzdür, – dedi, – nəfəsimdir ilhamın da, sənətin də,
Lakin mənim camalımdan nişan varmı sənətində?
Azmı keçdi Ayın, günün, ulduzların məclisindən?
Neçə eşqin, neçə hüsnün gülüşündən söz açdın sən?
Söylə, neçə əfsanənin zülmətinə şəfəq saçdın?
Neçə gənclik duyğusundan məclis qurub söhbət açdın?
Neçə gülşən, neçə çəmən, neçə lalə, neçə çiçək

Dildən-dilə dastan oldu ilhamınla sevinərək?
Lakin mənim torpağım boz, nə çiçəyim, nə gülüm var,
Döyüşlərdən yadigardır alnımdakı qırışıqlar...
Onunçunmu şeir, sənət dünyasında yoxdur payım?
Görüm sana haram olsun boynundakı haqq-sayım!
De, yadından çıxmamş ki, otuz bahar bundan qabaq,
Dirəkləri his bağlamış, altı torpaq, üstü torpaq,
Yağış daman, külək döyən bir daxmada mən yanardım,
Atan fikrə qərq olanda mən alışıb odlanardım.
Bəzən məni söndürərdi qapımızdan girən külək;
"Çırağımız söndü!" – deyə, qoca nənən söylənərək,
Əllərilə ağ piltəmi qaranlıqda təmizlərdi,
Sənsə yetim bir uşaqdın, ürəyində ana dərdi...
Çox vaxt mənim işığımda nənən corab toxuyardı.
Sənə bənzər bir uşaq da təzə yazıb oxuyardı.
Yadındamı? Asılmışdım evin orta dirəyindən!
Şölə çəkib alışardım o zülmətlər içində mən
Ətrafıma dolaşaraq alışdıqca pərvanələr
Sən deyərdin öz-özünə: "neçin yanır divanələr?"
Nə dövranlar gəlib keçdi danışdığım vaxtdan bəri.
Ölüm gördü, həyat gördü bu torpağın nəsilləri...
sən o sulu daxmacıqdan çıxıb gəldin şəhərlərə,
Şeir, sənət göylərindən salam verdin səhərlərə.
Mənsə min bir ilham aldım alovlanmaq adətimdən,
Azərbaycan torpağına günəş doğdu qüdrətimdən.
Budur Bakı? Görürsənmi? Bu sənət qəlbinlə bax!
Yanır təzə gəlin kimi yanaqları çıraq-çıraq...
Bu torpağın tarixi var, o düşdükcə min zülmətə,
Bir işıqla, bir kamalla yol açmışdır ülviyyətə.
Bu hüsn ilə ziynətlənir bu gördüyün böyük şəhər.
Nə yazıq ki, qüdrətimi səyyah kimi seyr edənlər
Qoynumda bir qara tüstü, bir də tozlu külək gördü...
Nə başımda kamal şövqü, nə cismimdə ürək gördü...
Odur ki, mən yaranmadım şeir sənət dünyasında,
Bu hiss ilə boğuluram bəzən fikir dəryasında...
Hanı? Hanı? Ağız dolu Vətən deyən sənətkarlar?
Neçin şeir gülşənində nə şöhrətim, nə hüsnüm var?

* * *

Torpaq bu dəm nəfəs aldı,
Gah bozarıb, gah saraldı
Qəzəbli bir insan kimi
Ana qəlbi küssə əgər,
Hirslənsə də, yenə gülər
Günəşli bir vicdan kimi.
Çox keçmədən dindi torpaq,
O açıldı varaq-varaq
Bir müəbbəd dastan kimi.

İltifatla dedi bu dəm:
– Mən yenə də gözləyərəm.
Hirsim varsa, eşqim də var –
Ana səbri böyük olar...
Bu söz günəş kimi qəlbimə güldü,
Elə bil üstümə nurlar töküldü...
Yenə ana dedim, yenə də Vətən!
Oxudu eşqimi nəzərlərimdən...
Bir cəlal başladı sinəmdə ürək,
İlham pərisi də gülümsəyərək,
Özüm də bilmirəm hayandan uçdu,
Dövlət quşu kimi başıma düşdü...

* * *

İndi Bibiheybət mədənlərindən
Yerin şöhrətini öyrənirəm mən.
Nədir bu torpağın altındakı səs?
Kürəni qızdıran bu odlu nəfəs?
Nədir damar-damar dolaşan bu qan?
Yaranmış bəlkə də qasırğalardan?..
Bu qatlar altında ümmanmı vardır?
De, burda çarpışan nə dalğalardır?
Elə bil dağ gəlir bəzən baş-başa,
Sığmayır idraka, sığmayır başa.
Qulaqlar tutulur yerin səsindən,

  

Dəniz də tərpənir zəlzələsindən.
O bəlkə torpağın intiqamıdır?
Bəlkə də yurdumun eşqi, kamıdır.
Çıxıb yer altından öz hünərilə,
Qovuşmuş taleyin ilk səhərilə!
Yanır buruqlarda bir məşəl kimi,
Müqəddəs, ilahi bir əməl kimi!..

* * *

Sən ey yer altında gördüyüm dünya!
Sən ki, həqiqətsən, deyilsən röya.
Bir dil aç, söylə ki, ünvanın nədir?
Həqiqət olmasa, söz əfsanədir.
Həqiqət nur saçar elmə, ürfana,
Həqiqət eşqilə gəldik cahana...
Onun hökmüylə də gedərgiyik biz,
Var olsun gələcək, bir də nəslimiz!

* * *

Gedirəm... Buruqlar cərgələnmişdir
Misir torpağında ehramlar kimi,
Fələkdən başıma nur ələnmişdir,
Könül xuramandır ilk bahar kimi.
Bir çala-çuxur var hər addım başı,
Yerin bağrına min lağım atılmış,
Seyrə gəl burdakı torpağı, daşı,
Gör ki, insan kimi qaşı çatılmış
Düşünür, daşınır, qəlbi qaynardır,
Yerin nemətinə yeraltı dardır...
Avtolar, insanlar, yeraltı canlar,
Həyat nemətinə qapı açanlar,
Polad baltaların yeraltı səsi,
Alovlar yurdunun odlu nəfəsi,
Şax-şax buruqları titrədən külək,
Yerdəki ildırım sürətli şimşək,
Döyünən, çırpınan qayışlı çarxlar,

Sapsarı su axan xırdaca arxlar,
Gülüşlər, qəzəblər, yorğun baxışlar,
Könüldən-könülə keçən alqışlar,
O ağır matorlar, ağır biləklər,
Qabarmış sinələr, polad ürəklər.
Üzündə, alnında qat-qat qırışıq,
Fəqət gözlərində bir sönməz işıq
Qocalar, yelpazə ayaqlı gənclər,
Bəxtiyar gözlərdə azad bir səhər,
Alnında dünyanın iztirabları
Ağ saçlı, nurani bir fəhlə qarı,
Kiçik pəncərəli taxta otaqlar,
Kitablı, çantalı körpə uşaqlar,
Bir ovuc torpaqla xəyala gedən,
Dünyanın sirrini başla kəşf edən
Bir yaşlı mühəndis, bir təbib qadın,
Camalı ay kimi, gün kimi aydın
Sahili seyr edən gözəl bir pəri,
Dənizdə günəşin al şəfəqləri,
Buruqlar içində bir qarmon səsi,
Azəri yurdunun saz şikəstəsi,
Çiçəkli Lənkəran, ceyranlı Muğan,
Çörəkli Kürdəmir, şeirli Şirvan,
O yandan Qarabağ, bu yandan da Qax,
Bir yanı Kürbasar, bir yanı Qazax,
Ellərin bağrından qopub yüksələn,
Odlar ölkəsini salama gələn,
Bu böyük şəhərə paytaxtım deyən,
Öz haqqım, öz nəfsim, öz baxtım deyən,
Çəkicli, külünglü, sevdalı gənclər,
(Ləkəsiz alnında puçur-puçur tər)
Səs salır mədənə toy-bayram kimi!
Günəş salam verir bir ilham kimi!
Mənimsə qəlbimə doğur bir səhər,
Açılır qarşımda əngin üfüqlər...
Nədir bu səhnədə gördüyüm varlıq?
Al geyib, gəl deyən bu bəxtiyarlıq?

Bakı, mehribanım, əzizim Bakı!
Sənin bu müqəddəs qucağındakı
Xəyala hökm edən bir təntənədən
Şeir rübabımı dindirirəm mən...
Bakı! Bakı! – dedim, müqəddəs ana!
Sən şöhrət yarandın Azərbaycana!

Buruqlar dövrəmdə cərgələnmişdir,
Elə bil başıma nur ələnmişdir.
Elə bil ney tutur qəlbimdə aləm,
Çiynimə asta bir əl dəyir bu dəm;
– Xoş gördük! Sən hara, bu yerlər hara?
Yoxsa söz qoşursan bu buruqlara?

Xatırlayın siz İkinci nəğməmizi,
O nəğmədə ötərgi bir söhbətlə mən
Söz açmışdım bir dostumun surətindən;
Unutmadım nə vədimi, nə də sizi.
Qoy Beşinci nəğməmizin hər kəlməsi
Qismət olsun dost dediyim bu insana;
Bayramımdır təbimin də xoş gəlməsi,
Halal olsun bu ilhamım qəhrəmana.

Şaşma, qələm, bu ümmanda, gəl, amandır!
Könül mülkü eşqə gəlsin, sən də dilə!
Dost yanında rüsvay olmaq çox yamandır,
Bir zəfərlə çıxar məni bu sahilə!
– Usta Murad! Yadındamı, keçən dəfə
Demişdim ki, gələcəyəm hüzuruna!
Vaxtım çatdı, yolum düşdü siz tərəfə,
Söz qoşuram ana yurdun qüruruna!
Dünya görmüş, zaman görmüş bu ixtiyar
Nələr deyir hər addımda söz açaraq.
Sinəsində yazılmamış bir kitab var,
Mən açıram o dastanı varaq-varaq.
Dünya görmüş bu dostumun mərd əlini
Mən duyuram onun şirin söhbətində.

Çox aradım mədənlərin əməlini,
Axır, tapdım insanların surətində.
...Usta Murad! Səni doğan mərd anadır.
Saf dilində nə böhtan var, nə də riya...
Hər söhbətin, hər sözün də mərdanədir;
Ər oğlunu unutmamış qoca dünya,
Ürəyində nə həsəd var, nə rəyasət.
Şöhrətindir, mənsəbindir halal əmək...
Əllərindən şərbət içir min səadət.
Qara torpaq bir vicdana haqq verəcək!

Sən ömründə fitnə toru qurmamısan,
Min insanla bölüşmüsən qismətini.
Ağ üzlərə qəsdən ləkə vurmamısan,
Yaşatmısan bu torpağın ismətini.
O mis rəngli alnındakı sadə vüqar
Həqiqətlə keçən ömrün ziynətidir;
Gözlərindən aşıb-daşan o duyğular
Neçə nəslin bir-birilə söhbətidir?

Mən gördükcə saçlarını sənin dümağ,
Vəcdə gəlir boran görmüş dağlar başı.
Qəlbin gümrah, alnın açıq, üzünsə ağ...
Bu sənəti hiss eləməz hər bir naşı.

Əynindəki o mazutlu, hisli köynək
Səhər, axşam dəyişdikcə növbə-növbə,
Sinəndəki qocalmamış o saf ürək
Gənclik kimi dalğalanıb gəlir şövqə.
Bir zamanlar şığıdıqca sən quyuya,
Nəfəs boğdu, ürək sıxdı yerin altı...
Hər addımda bir fəlakət duya-duya,
Gözlərində ölüm oldu hər qaraltı.
Sən endikcə göz görməyən o zülmətə,
Yollarına nə gün düşdü, nə də ki, ay.
Bu torpağın qatlarını gəzib lay-lay,
Sən yol açdın insan adlı bir qüdrətə!..

Külüng ağır... Yer qayalıq... Hava boğuq...
Sümüklərin sızıldardı şamü-səhər,
Qadın – namus... Övlad – şirin... Daxma – soyuq...
Çörək yeyib ağlaşardı evdəkilər...

– Usta Murad! Aç ömrünü gəl bu dəfə –
Dastan neçin dayanmışdır? – deyir hamı.
Lakin usta göz gəzdirib sağ tərəfə,
Nişan verir bayraqlı bir izdihamı:
– Görürsənmi? Eldir gedən ziyarətə,
Gəl, şairim biz də gedək ona sarı...
Qara torpaq düşsə belə qiyamətə,
Unutmayır and içdiyi bir ilqarı...
O nədir? Seyr edin o izdihamı.
Yerəmi enmişdir göyün ilhamı?
Nədir əllərdki o al bayraqlar
Bu gün bayrammı var, təntənəmi var?
Neçin dəniz kimi qaynaşır insan,
Yer nələr oxuyur o baxışlardan.
Nə var addımların o sürətində?
Nədən ruhu gülür təbiətin də?..
Günəş saçlarını yaymış dənizə,
Əsir bahar yeli ürəyimizə...
De, nədən sevinir bu qara torpaq?
Daşlar baş qaldırıb dilmi açacaq?
Nədir gözlərdəki o hissi-hörmət,
De, neçə tayfa var, de, neçə millət?
Qocalar, qarılar, gənclər, gəlinlər –
Nədir bu izdiham, de, səhər-səhər?
Nə çoxdur əllərdə gül dəstələri?
Nə xoşbəxt görürəm mən bu səhəri.
Ey səhər aşiqi azad nəsillər!
Ey bahar gülüşlü, aylar, fəsillər!
Deyin, bu nə büsat, nə təmtəraqdır?
(Hər büsat bir sözlə yaşayacaqdır...)
Fəqət eşitmədən bu sualımı,
Bəlkə hiss etmədən mənim halımı

İzdiham çoxalır... İzdiham ağır...
Ayaqlar altından toz-duman qalxır.
(Dünya da böylədir əzəldən bəri –
O sevir zamanla yol gedənləri...)
Sürünün axsağı arxada qalar,
Ya çoban öldürər, ya qurd parçalar.
Dənizdən bir dalğa düşsə quruya,
Bir çuxur yer qazıb dönər quyuya,
Get-gedə üstünü toz-torpaq alar,
Onun şəffaf suyu solub saralar...
Günün şiddətindən dönüb buxara,
Yem olar ac gözlü ağ buludlara...
Qızılgül ayrılsa öz budağından,
Ürək ayrı düşsə can otağından,
Nə bir söz yaranar, nə də ki, sənət,
Nə həyat sevinər, nə də məhəbbət!
Ayaqlaş dövranın sürətilə sən,
Onun karvanından üzülməyəsən!
Özün yaratsan da bütün varlığı,
Özündə axtarma bəxtiyarlığı...
Elin məclisində ney tut, dilə gəl,
Beş günlük aləmə gülə-gülə gəl!
Doldur piyaləni haqq şərbətindən,
İlham al vətənin məhəbbətindən!
Sən el bağçasında şur tutub, səs sal,
Elin ciyərilə yalnız nəfəs al!
Nə dosta arxalan, nə də ki, yada,
Onların hamısın gördük dünyada...
“Dostlar minnətindən bu günə qaldım,
Görənlər deyir ki, vaxtsız qocaldım!..”
Artıq, yol gedirəm bu izdihamla,
Buruqlar dövrəmdə cərgələnmişdir.
Göydə günəş yanır bir ehtişamla,
Elə bil üstümə nur ələnmişdir!..

Çalır orkestro... Şaddır ürəklər,
Üzlərdə ismətli bir şəfəq oynar.
Hər isti yanaqda bir odlu ülkər,

Hər gözün, baxışın bir şəfqəti var...
O zümrüd səmada günəş yandıqca
Mən alqış deyirəm yerdə insana!
Bayaqkı izdiham dalğalandıqca,
Biz gəlib çıxırıq bir qəbristana...

* * *

Şıx kəndi, dağ döşü, bomboz qayalar,
Nə bir yaşıllıq var, nə bir axar su.
Əzəldən hayanda xoş keçsə ruzgar,
Orda yuva salır insan arzusu!
Qayalar! Qayalar! Bir deyin nədir
O sərt üzünüzdə gördüyüm hiddət?
Açın sirrinizi, öyrənək bir-bir,
Bəlkə qəsd eləmiş sizə təbiət.
Bir odlu vulkandan yadigarmıdır
O xəncər ağızlı daş çalpaları?
Deyin, haqqınızda tarix varmıdır?
Özünüz aləmə şərh edin barı!..
Qayalar! Qayalar! Verib baş-başa
Nədir daldığınız o sakit xəyal?
Həyat yaranmışdır ölümlə qoşa –
Bir zəfər sözü var, birdə ki zaval!

Neçin ot bitməyir daş sinənizdə ?
Yoxsa qəlbinizdə qəzəbmi yanır?
Deyin, qəsbkarlar hökmünü siz də
Andıqca, hirsiniz çoxmu odlanır?
Bilirəm, şahiddir göyün də qəlbi –
Topa tutuldunuz siz zaman-zaman...
Qəhrəman bir elin hünəri kimi
Müzəffər çıxdınız odlar ağzından.
İndi siz göylərə baxıb vüqarla,
Baş əyməyirsiniz sultana, şaha.
Bir könül, bir vicdan, bir ixtiyarla
İndi insan verir hökmü Allaha!
İndi min könülün təranəsilə





Ləpələr öpdükcə ayağınızı
Babəklər, yurdunun öz oğlu, qızı
Gəlir bu torpağa öz nəfəsilə...

* * *

İzdiham yetişir o qəbristana,
Burda təzim olur el adətinə.
O yanda ağlayan qoca bir ana
Gəlmiş öz oğlunun ziyarətinə
Yanında sarışın bir qız körpəsi
Ağlayır o yanda bir gənc gəlin də.
Gözündən süzülür odlu naləsi,
Qızsa daş oynadır tumbul əlində...
Dolama-dolama daş pilləkanlar
Bir türbə yanına qaldırır bizi.
Ömrü düşündükcə burda insanlar
Bir sükunət alır ürəyimizi.
Ölüm – bir zülmət ki, tilsimdir sonu,
Bircə bu sonsuzluq bizə bəllidir.
Ağıl kəşf etməmiş nə olduğunu,
Bəlkə cəhalət də bir təsəllidir!
Türbənin üstündə zərif naxışlı
Aypara şəklində bir daş ucalmış.
Onun ortasında səhər baxışlı
Bir insan surəti şəfəqlər salmış.
Gələnlər seyr edir onu diqqətlə,
Ölüm yaraşmayır, ah, o varlığa.
Sanki dil açıb da bir məhəbbətlə,
Gəlib qovuşacaq bəxtiyarlığa.
Nədir o gözlərdə alışan çıraq?
Elə bil doğrudan o hələ sağdır...
Elə bil əlində bir qızıl bayraq
O yenə zülmətlə çarpışacaqdır!
Donuram bu əksin qarşısında mən,
Qəlbimi bəlkə də bir xəncər biçir.
Dalğın xəyalımın üfüqlərindən
Qırx bahar əvvəlki bir səhnə keçir...

* * *

Budur, iğtişaş var Bibiheybətdə,
Gəlir dalğa-dalğa o qəhrəmanlar.
Dəniz də, torpaq da coşur hiddətlə,
Ədalət deyərək gəlir insanlar.
De, yerin qəlbində tufanmı vardır?
Neçin qaşlarını çatmış üfüqlər?
Könülmü dustaqdır! Havamı dardır?
Bir zülmət andırır hər tutqun nəzər...
Baxışlar pərişan, bənizlər sarı,
Qanunmu nankordur? Həyatmı zindan?
Söylə, görürsənmi al bayraqları,
Zamanın dəhşətli fırtınasından
Yarıb dalğaları keçir günəş tək,
Azadlıq eşqilə gülümsəyərək:
– Gəlin! Gəlin! – deyir o, nəsillərə.
De, nədən titrəyir vaxtın təməli?
Qılıncmı qurşamış zamanın əli
Günlərə, aylara, ötən illərə,
Gəlin! Gəlin, deyir o, nəsillərə!

* * *

Tətilmi? Üsyanmı? – Nədir o dalğa?
Nədir gözlərdəki o alovlu kin?
Bu ümman bəlkə də qasırğalarla
Yıxacaq taxtını mütləqiyyətin!
Bakı? Nə dərdin var, müqəddəs ana?
Nədir gövdəndəki o zəncir səsi?
Kimin heykəlini yıx deyir sana
Böyük bir millətin məhkum nəfəsi?
O qopan üsyanın zəlzələsindən
Baş-başa gəlmişdir böyük binalar.
Xanların: “Qardaşlar, qalxın!” – səsindən
Qırır qapıları həbsxanalar...
O cəllad baltalı qanunlar fəqət
Qılıncla kəsmişdir yolları, baxın!
Qanı qan coşdurar, şiddəti şiddət,





Gedir o dalğalı, o hirsli axın.
Dayanmış polislər bir qoşun kimi,
Nə top var, nə tüfəng bizimkilərdə.
Tökülür güllələr qurğuşun kimi,
Ölüm var! Qırğın var, yenə şəhərdə.
Ah... deyib yıxılsa bir Vətən oğlu
Onun bayrağını yoldaşı alır.
Əzəldən belədir qurtuluş yolu,
Zillətdə, zülmətdə acizlər qalır.
Xeyr! Dayanmayır qəzəbli Bakı,
Küçələr sıxılır, yenə darlıqla,
Əzəldən göy yerə qovuşmuş sanki,
Həyat pəncələşir bütün varlıqla...

Zəhərli qılınclar sıyrılır qından,
Əl-ələ, baş-başa gəlir insanlar.
Aman! Tüstü çıxır yerin ağzından.
Mədənmi alışdı? – Yan... – deyir Xanlar.

Alovlar içindən şiri-nər kimi
Mənim qəhrəmanım yol açır bizə...
Ürəklər açılır bir səhər kimi
Günəş salam verir iradəmizə!
Bakı! Bakı! – deyir bu qarlı Qafqaz,
Müsəlləh atlılar keçir dağlardan...
Azadlıq eşqilə axır Kür, Araz,
Şamilin, atına qalxır Dağıstan...

Coşur Qara dəniz, Batum səslənir.
Alagöz dumandan baş qaldırır, bax.
Göy gülür, yer gülür, can həvəslənir,
Hər könül mülkündə yanır bir çıraq...
Bakı! Bakı! – deyir Muğan da, Mil də,
Misri qılınc taxır Koroğlu nəsli.
İnqilab şərqisi ağızda, dildə,
Bir qüdrət dəyişir hər keçən fəsli...

İnsan nərəsindən yerin səsindən
Dalğalanır Bakı, çalxanır Xəzər.
Çaxnaşır Bakının zəlzələsindən
Böyük Petronun da qurduğu şəhər!
Çarın qış sarayı, mərmər salonlar
Bakı! Bakı! – deyib düşür lərzəyə...
Üstü qızıl sulu o zər paqonlar
Titrəyir “inqilab dalğası!” deyə.
Çatır qaşlarını cütbaşlı qartal,
Onun varlığına üşütmə düşür.
İnsan da, torpaq da deyir: istiqlal!
Günlər od içindən keçib ötüşür...

Aclığa, zindana, zülmə nifrətlə
Vicdanı haqq deyir şanlı bir elin,
Böyük bir ümidlə, bir məhəbbətlə
Bakı! Bakı! – deyir Sibirdə Lenin.
Çatır Qara dəniz qaşını birdən,
Odessa bəzənir bir al bayraqla...
Volqanın, Dneprin sahillərindən
Bakıya səs düşür bir təmtəraqla...
İyul günlərini xatırlayaraq,
Avqust Bebelin də ürəyi yanır...
Onu dinlədikcə köhnə Reyxstaq
Berlinin qəlbində səs dalğalanır...
Toplayıb başına fədailəri
Azadlıq eşqilə yanır Səttarxan.
O yarıb dağları keçir irəli,
Təbriz büsatdadır... Bağlıdır Tehran...

Bayraqmı götürdü Bombey fəhləsi?
Silahmı qurşadı – nə izdiham var?
Sürgündəmi gəlir Taylaqın səsi,
Keçir al bayraqlı barrikadalar...
Azad kamal deyir “zəncirsiz ürək”,
O qocaman Taqor, o böyük insan!
Onun rübabilə vəcdə gələrək,
İstiqlal eşqilə yanır Hindistan.

Qoy onun kiçicik bir şerini mən
Burdaca köçürüm öz dilimizə,
Hər böyük dühanın xəzinəsindən
Sadə bir inci də dövlətdir bizə:
“Bir aləm ki, nə zindan var, nə zəncir,
İnsan oğlu ömür sürür vüqarla...
Fikir azad... Ürək dustaq deyildir,
Bölünməmiş dünya minbir hasarla.
Həqiqətin ürəyindən söz gəlir.
Ağlın hüsnü şəfəqlənir günəş tək;
Şərəf sözü ülviyyətə yüksəlir,
Qaralmayır çirkablara düşərək,
Bu azadlıq göylərində, ya rəbbim!
Qoy göz açsın bir mənim də vətənim!”
Mətləb uzaqlaşdı... Qayıdaq yenə
Bizim qəhrəmanın ziyarətinə:
Onun türbəsinə baş əyir hamı
Gözlər dalğalanır hissi-hörmətlə:
Bu qəmli, kədərli bir ehtişamı
Mən görüb duyuram indi möhnətlə.
Onun surətində bir solğun bahar,
Bir aslan ürəyi çırpınır darda...
Xəyala hökm edən o baxışlarda
Nakam bir sevginin ilk şöləsi var...
Bayaq seyr etdiyin o bayraqdarın
Kama yetməmişdi haqqı, muradı.
Tarixi gəzdimsə, bizim Xanların
Nə kitabı qalmış, nə də övladı.

Sual edirsən ki, bəs nəyi vardır?
O ellər oğlundan nə yadigardır?
Götür məzarından bir ovuc torpaq,
Əlində duyduğun istiliyə bax...
Gör ki, soyumamış hələlik o qan,
Hələ ürək kimi istisi vardır.
O sənin uğrunda keçdi canından,
O nəfəs, o ürək bir yadigardır!

Bu dağ döşündəki yalnız məzarı
O vaxtdan bir dərin fikir almışdır.
Vətən göylərinin ağ buludları
O qəbrin üstünə kölgə salmışdır.

Günəşin altında məzar yandıqca,
Dənizdən əsmişdir sərin bir külək.
Zamanın xəyalı dalğalandıqca,
Könüllər mülkündə o açmış çiçək!

Bu dağ döşündəki cığırla gedən
Nəsillər nə qədər söz açmış ondan!
Yaxmış ürəkləri od kimi bəzən,
Xəyanət əlinin tökdüyü o qan...
Ah, yazıq analar, yazıq babalar!
Nə dağlar görürəm sinənizdə mən!
Siz ey zaman görmüş ellər, obalar,
Deyin, nələr keçdi ürəyinizdən?

Bu qəbrin önündə diz çöküb mən də
Ona and içirəm bir vətəndaş tək:
Böyük səadətdir vaxtı gələndə,
Vətənin eşqilə vətəndə ölmək!

Öz sadiq oğlunu torpaq unutmaz...
Elə zənn etmə ki, qayalar daşdır!
Ana övladını yad kimi tutmaz,
Bu daş da, qaya da qəlbə sirdaşdır...

Budur, bax, bu qəbrə hər kəs baş əyir,
Tökülür üstünə gül dəstələri.
Bu müqəddəs yerə nur səpələyir
Vətən göylərinin azad səhəri.

Pioner bir qız da gəlmişdir dilə,
(Daranmış saçları ənbər qoxuyur)
O, qəbrin üstündə, çocuq səsilə
Xanların eşqinə şeir oxuyur:

* * *

“Biz görmədik, söyləyirlər;
Hər danışıb güləndə sən,
Şəfəq kimi səhər-səhər
Nur yağarmış gülüşündən...

Yüz dastanla sinən dolu,
Sənin də öz eşqin varmış...
Nakam ölmüş Vətən oğlu!
Hər əməlin bir baharmış...

Sən çocuqkən Qarabağda
Bulaqlardan su içmisən.
Gah bu dağda, gah o dağda
Həmdəm bulub dost seçmisən.

Dolaylarda bu gün belə,
Ayaq izin yadigardır...
Atlı keçir eldən-elə
Dağlar qoynu ilk bahardır...

Orda qoca çobanlar var,
Xatirənlə tütək çalır...
Unutmamış səni dağlar,
El ilqarı eldə qalır...

Gülür dəniz, gülür Xəzər,
De, həsrətmi qaldın buna?
Oynadıqca göy ləpələr
Salam verir hüzuruna.

Ürəyində söndü bir şam...
Bir bayatı... Bir şikəstə...
Buruqlarda axşam-axşam
Min şam yanır qəbrin üstə...

Biz görmədik, söyləyirlər:
Hər danışıb güləndə sən,
Şəfəq kimi səhər-səhər
Nur yağarmış gülüşündən...”

* * *

Dindikcə qızcığın bu şeir sazı
Doğrayır qəlbləri acı bir külək.
Ötdükcə sənətin, şerin avazı
Köksün qəfəsinə sığmayır ürək...

Əzəldən belədir sözün hünəri:
O daşa dil verir, torpağa qanad...
Onunla ucalır xəyal şəhpəri,
Önündə diz çökür bütün kainat.

Yaşamaq, çarpışmaq gözəl olsa da,
Jurnal adamları həddi aşmasın...
Şairlər! Birləşək bütün dünyada,
Bir sənət, bir də söz ucuzlaşmasın!

Uzaqlaşma, qələm, yenə mətləbdən,
Başladığın sözü kamala yetir!
Bu böyük dastanı yaratdıqca sən
Barı bir kəlməsə təzə söz gətir!

* * *

İndi də siz qulaq asıb seyr edin bir qocanı,
Öz əlilə o qazmışdır bu müqəddəs məzarı.
Yoldaşını dəfn edirkən lənətləyib zamanı,
Fərhad kimi külüng çalıb dəlmiş idi dağları...
Asta, kasıb bir dil ilə danışdıqca bu qoca
Qəzəbindən dalğa kimi qalxıb enir sinəsi.
Başqasının sözlərilə bəzənsən də doyunca
Müqəddəsdir hər insanın öz nəfəsi, öz səsi...
Bu qayalıq, bu dağ döşü o natiqə tanışdır,
Otuz yeddi bahar keçmiş o dediyi zamandan,
Gördüyünün bir çoxu da yadında qalmamışdır.
Həyat böyük bir dastandır, əzbərləməz bir insan...
Lakin onun bu gün kimi yadındadır o matəm,
Dalğa-dalğa axıb gələn o qəzəbli izdiham.
Zülmətlərin pəncəsində "Günəş!" – deyən o aləm,
Ümid donlu o al səhər, vərəm üzlü o axşam...

Usta Murad danışdıqca yetirməyir nəfəsi,
Mən də ağır bir nəfəslə söhbətə dözürəm.
Dost qəlbindən axıb gələn sənət ruhlu o səsi
İnci kimi sözün, şerin gərdəninə düzürəm:

Yenə Bakı! Ümman kimi dalğalanır bu şəhər,
Yenə torpaq baş qaldırdı, küçələrdə təlaş var!
Qanunlara lənət deyir al bayraqlı dəstələr.
Pəncərədən baxıb qaçır ağ durbinli xanımlar...

Gəlir yenə mədən oğlu alay-alay ordu tək,
Baxışlarda bir qəzəb var, dodaqlarda bir sükut...
Zəncirli bir pələng kimi döyündükcə hər ürək,
Nələr deyir xəyal kimi qara geymiş o tabut?
O tabutun arxasınca addımlayır bir şəhər...
Bulud kimi qaralmışdır bayraqların kölgəsi...
Mən varammı? – Sual verir bu matəmi görənlər,
Vidalaşır öz oğluyla bizim Odlar ölkəsi!

Bibiheybət mədənilə gəlib keçir izdiham,
Söylə neçin əyilmişdir buruqların vüqarı?
Qara torpaq, de, söndümü günəş donlu o ilham?
Qılınclamı susduruldu azadlığın şüarı?

Qanunların şiddətimi öz həddini aşmışdır?
Xəyanətmi hər addımda evlər yıxır casus tək?
Baxışlarda bahar ağlar, ürəklərsə bir qışdır...
Ah, həyatı qamçılayır şaxta üzlü bir külək!..
Göy üzündə sarılıq var... Pərişandır, xəyallar.
Süzüb gedir əzan səsi... "Dözün!" – deyir şəriət...
O sehrkar "qüdsiyyətə" tapındıqca ruzigar
Dualarla pərdələnir yer üzündə cinayət.
Dəstə-dəstə dolandıqca o tabutun başına
Dalğa-dalğa keçən insan alovlanır qəzəbdən.
Varaqlayıb taleyini dünya görmüş bir Vətən,
Ana torpaq fikrə gedib dolur kamal yaşına...

Qara torpaq haray çəkir, göy də düşür lərzəyə,
“Üsyan” deyir zavodların tüstülənmiş nəfəsi.
Haray çəkir “Bakı” – deyə, “dur ayağa, qalx!” – deyə
Dənizdəki vaporların əzəmətli nərəsi!
Keçir tabut izdihamla, sanki dəniz yürüyür
Orkestro susur birdən... Qanunların əmridir...
Qəzəblənmiş ürəkləri yenə tufan bürüyür.
Dörd tərəfdə atlı kazak, göy fırlanır, yer gedir...

Fəqət minbir məhəbbətlə nəğmə tutur dodaqlar.
Bir pərdə də oxuyurlar “qurban verdik səni biz...
Neyləyək ki, əziz yoldaş, sabahın da dərdi var, –
Sən ölsən də, mən ölsəm də, yaşayacaq nəslimiz!”
Tabut yetir qəbristana... Dərya kimi bulanır
Qara torpaq... Mavi dəniz... Bir də sonsuz asiman...
Atlı kazak zəncir kimi məzarlığı dolanır,
İlanbaşlı qılıncların od parlayır ağzından.
Ürəklərdə tüstülənir bir intiqam atəşi,
Gözlərdəsə səhər doğur... Bir dan yeri sökülür.
“Doğacaqdır, doğacaqdır azadlığın günəşi!”
Bu ümidlə baxışlardan tabuta nur tökülür...

* * *

...Yel əsdikcə varaq-varaq
Dastan kimi açılaraq,
Nələr deyir, İzdihamı
Bir sükunət qaplamışdır.
Heykəl kimi durur hamı,
Bu gün keçdi, sabah!.. – deyə;
Acı dövran hər ürəyə
Neçə xəncər saplamışdır!

* * *

Tabut tapşırılır ana torpağa...
Əlvida! – deyərək dağılır hamı.
Bu daşlı, qayalı kiçicik dağa
Gərir qanadını payız axşamı.

*1944*

## ZƏNCİNİN ARZULARI

O, kürsüyə sinə gərdi. Danışmadı, susdu bir dəm,
Çatıb qara qaşlarını, fikrə getdi o bir anlıq;
(Bəzən dilsiz bir vüqarla qılınc çəkir qəhrəmanlıq.
Qarşısında boyun büküb, səcdə qılır bütün aləm...)

Salon heyrət içindədir... Sükut edir başdan-başa.
Qara zənci kürsüdədir, ona min göz baxır yerdən...
Bir şeriyyət tablosudur seyr etdiyim bu tamaşa,
Nə mənalar oxuyuram dalğın baxan o gözlərdən!..

Elə bil ki, bir dəfə də, yarandığı gündən bəri
Ağız açıb o gülməmiş... nəşələrə biganədir...
Dodağında səslənməmiş ürəyinin nəğmələri,
Talan olmuş şəhər könlü top dağıtmış viranədir...

Elə bil ki, qara zənci bu dünyaya gələn zaman
Bir daxmada matəm tutub ağlamışdır öz anası...
Fəqət yenə ana qəlbi ayrılmamış övladından,
Gecə-gündüz çörək yeyib, nalə çəkmiş hər laylası.

Onun tutqun baxışında bulud gəzir, şimşək çaxır,
Bir pəhləvan gücü də var onun canlı biləyində.
Dönə-dönə göz gəzdirib insanlara yenə baxır,
Açılmamış bir kitab var onun dolmuş ürəyində...
Dolan bulud boşalacaq! –
Bu hökmüdür təbiətin!
Qara zənci ağız açır:
– Mən zənciyəm, həm də rəssam!
Otuz ildən bir az da çox övladıyam bu sənətin,
Məni yalnız insan deyil, bir də şair doğmuş anam!
Amerika, Yeni dünya! Mənim doğma vətənimdir,
Babamın ağ sümükləri çürümüşdür bu torpaqda...
Dəniz mənim, hava mənim, torpaq mənim, göy mənimdir!
Arzularım yuva salmış hər budaqda, hər yarpaqda,
Mən sevirəm öz yurdumu bir müqəddəs məhəbbətlə.

Rəssam könlüm vurğunudur hər axşamın, hər səhərin,
Yaratdığım tablolarda hüsnü vardır, şəfəqlərin...
Vaxtınızı çox almayım!
                              Deyin, mənim bu sənətlə,
Bu hünərlə yaşamağa yer üzündə yerim varmı?
Heç evsiz də, eşiksiz də rəssam olan yaradarmı?
Onun qara gözlərindən bir ildırım çaxdı keçdi.
Ürəyinin qızıl qanı ürəyimdən axdı keçdi.
Zənci dalğın... Salon səssiz... Elə bil ki, bütün varlıq
Ona bu dəm qulaq asır. Gəl, oxucum, diqqətlə bax,
Görürsənmi, onun gözü şölələnir bircə anlıq,
Üzündəki qəm dastanı açılmışdır varaq-varaq;
– Bir səyahət günlərində mən ac qalsam, susuz qalsam,
Bir aşxana qapısını ötənlərdən xəbər alsam,
"Sən qarasan..." sözlərini oxuyuram nəzərlərdə,
Deyin görək, ömrüm boyu necə dözüm mən bu dərdə?
Qanunların qara hökmü belə yazır nə zamandır;
Şəhərlərə qonaq düşmək qaralara qadağandır.
Bəli! – dedi qara zənci, – vətən mənə bir qürbətdir,
Məni vaxtsız qocaldan da bu ayrılıq, bu möhnətdir!

Salondakı lal sükutun mənasını mən duyuram,
İnsanların gözlərində bir mərhəmət oxuyuram.
Baxışlardan dalğa-dalğa, bulud-bulud heyrət yağır,
Qara zənci acığından nəfəs alır ağır-ağır...
O çatılmış qaşlardakı mənaları duya bilsən!..
Artıq onun dişləri də kilidlənmiş qəzəbindən,
O yenə də sükut edir, danışmayır o bir anlıq,
(Bəzən dilsiz bir vüqarla qılınc çəkir qəhrəmanlıq...)
– Amerika, Yeni dünya! Vətənimdir, dedim bayaq.
Çox sevirəm ana yurdun axıb gedən çaylarını,
Onun qarlı qışlarını, bir də bahar aylarını.
Qızıl, gümüş mədənidir yarandığım qara torpaq.
Fəqət, mənim bu torpaqda yaşamağa haqqım varmı?
Vətənsiz də insan olan insan kimi yaşayarmı?
Bu alovlu, odlu sözlər yanğın salır ürəklərə,
Elə bu vaxt göz qoyuram sağımdakı bir nəfərə.

O, tərləmiş çeşməyini sol əlilə düzəldərək,
Kinayəli baxışlarla diş qıcayır bir iblis tək,
Ayırmayır gözlərini o, zəncinin dodağından,
Bir qurd kimi dişlərini şaqqıldadır zaman-zaman.
Gah bozarır, gah qızarır, üşütmələr var canında,
Kölgə kimi qara-qara əllər gəzir vicdanında...
O, kinindən büzüşdükcə bir yumağa dönür bəzən,
Elə bil ki, ilan kimi sıçrayacaq öz yerindən.
Qaraqabaq, yerəbaxan, gözü gömgöy, rəngi kürən...
O fitnələr övladının hiylə yağır sifətindən.
Cənab kimdir? – O, Teylerdir! Şlyapalı bir iblisdir!
Ürəyimdən səslər gəlir: – İngilisdir! İngilisdir!
Çaylar kimi dalğa-dalğa gözlərimə vurur qanım,
Xatirimdən gəlib keçir 26 qəhrəmanım!
Zənci qızır aslan kimi, qabarmışdır tunc sinəsi,
Elə bil ki, dalğalarla pəncələşən bir adadır.
Qulaqlara lərzə salır bu natiqin qadir səsi –
Xəyalından nə keçirsə, yumruqları havadadır...
O, gəmirir zəncirini qəfəsdəki pələng kimi,
Ayaqdadır qara zənci açılacaq tüfəng kimi...

* * *

– Yüz həvəslə, düşüb bəzən,
Səyahətə çıxıram mən.
Deyirəm ki, öz fırçama
Rəng toplayım çiçəklərdən.
Deyirəm ki, qarış-qarış
Gəzim vətən torpağını;
Payız düşüb saraltmamış
Ağacların yarpağını,
Seyr eləyim dağı, daşı;
Qayaların çatıq qaşı
Başım üstə kölgə salsın.
Könlüm quşu ilham alsın,
Qanad gərsin bir çəməndə;
Bir arzuyla, deyirəm mən
Buludların məməsindən

Dağlar başı süd əməndə,
Bu sevdalı təbiətdən,
Hər gördüyüm həqiqətdən
İlham alıb, yazım mən də
Bir tükənməz səadətlə!
Yaratdığım sənət qızı
Salamlasın baxtımızı
Bir müqəddəs məhəbbətlə:
Mən də baxıb bir şad olum;
Qəm mülkündən azad olum
Yaratdığım bir sənətlə!
Düşündükcə uzun-uzun
Deyirəm ki, yurdumuzun
Hər yayında, hər qışında
Həyat görüm, dünya görüm!
Hər insanın baxışında
Bir müqəddəs məna görüm!
Hər körpənin gülüşündən
Ürəyimə nur yayılsın.
Yatan günəş qalxıb erkən,
Yuxusundan tez ayılsın,
Üzündən nur yağa-yağa.
Nə qul görüm, nə də ağa,
Nə bir dustaq, nə bir zindan!
Cahangirlər dünyasından
Qalmasın bir yadigar da;
Qoy ağlar da, qaralar da
Səadətlə nəfəs alsın
Yaratdığım tablolarda
İnsan eşqi zəfər çalsın
Öz zəhməti, hünərilə;
Bu azadlıq günlərilə
Qoy ürəklər sirdaş olsun;
Alqışlayın bu niyyəti!
Bu müqəddəs şeriyyəti!
Qoy dünyanın min milləti
Bir and içib, qardaş olsun,
Bir bayrağa sirdaş olsun!

Bu saf arzularla yaşadıqca mən,
Bəzən özbaşına çıxıb evimdən,
Həftələr uzunu hey ac da qalsam,
Yavan bir çörəyə möhtac da qalsam,
Yuxusuz gecələr görsə də gözüm,
Qaranlıq keçsə də günüm-gündüzüm,
Piyada keçsəm də axar çayları,
Sinəmdə donsa da dağların qarı,
Daşlar qanatsa da ayaqlarımı,
Şaxtalar vursa da barmaqlarımı,
Vətən torpağına aşiq xəyalım
Yenə də zövq alır bu səyahətdən.
Qoy sadə gəlməsin sizə bu halım,
Ayrıla bilmərəm mən bu adətdən.
Gəzməsəm, görməsəm, duya bilməsəm,
Gözəllik eşqindən doya bilməsəm,
Sönər sənətimin eşqi, həvəsi,
Torpağa bağlıdır rəssam nəfəsi!
Lakin axşam olur, hava qaralır,
Əngin üfüqlərin alnı daralır.
Soyuyur gördüyüm o zümrüd sular.
Soyuyur sinəmdə yanan arzular...
Göz qoyub axşamın son havasına,
Qurd-quş da çəkilir öz yuvasına,
Nyu-York alışır, işıqlar yanır,
Salonlar al-əlvan rəngə boyanır.
İpək döşəməli xanimanlardan
Rəqqasə qızların səsi yüksəlir.
Mənimsə üstümə asimanlardan
Yağışlı, yağmurlu buludlar gəlir...
Yatmağa nə yerim, nə yurdum vardır,
Üzümə bağlıdır mehmanxanalar.
Orda xumarlanıb yatan ağlardır,
Çünki qara doğmuş bizi analar...
Bəli... Qara doğmuş məni öz anam,
Siz də yaxşı baxın, qaradır dərim...
Bir dəniz olsa da mənim hünərim,

Buyurun, neyləsin zənci bir rəssam?
Siz deyin, mənim də vətənim varmı?
İnsan da vətənsiz insan olarmı?

Rəssamın nəfəsi, de, nədən yanır?
Bıçaq iliyəmi yoxsa dayanır?
Yox, o susmayacaq, susmaz sənətkar?
Heyrət içindədir salondakılar.
Zənci davam edir, kövrəlir səsi,
Od tutub alışır onun nəfəsi,
Üzündə rəqs edir boranlı bir qış,
Gözündən süzülür qəlbinin kini,
O açıb tökdükcə qəlbindəkini.
Salonu titrədir sonsuz bir alqış.
– Bəli, mən zənciyəm! Zənci bir qadın
Mənə süd vermişdir öz döşlərindən.
O bədbəxt ananın övladıyam mən...
Eh, ana! Dünyada sən olmasaydın,
Bəlkə tanrıya da mən baş əyməzdim.
Bir sənin eşqinlə, bir öz adımla,
Südündən aldığım istedadımla
Ayağım tutduqca dünyanı gəzdim...
Azadlıq aşiqi oldusa adım,
Özüm bir gün belə azad olmadım?!
Yox! Məndən incimə, müqəddəs ana!
Nankor yaranmamış sənin övladın.
Bütün məbədlərdən ucadır adın,
Dünya bir yanadır, sənsə bir yana.
Ah, müqəddəs vətən, müqəddəs ana!
Yox, yox! Unutmadım mən öz əslimi,
Öz qara nəslimi, zənci nəslimi!
Köksüz bir ağacın meyvəsi varmı?
İnsan da əslini heç unudarmı?
Zənci bu sözləri dedi vüqarla,
Göylərə sığmayan bir iftixarla.
Bir günəş parladı onun üzündə,
Bir şimşək oynadı tutqun gözündə,

Əsdi yarpaq kimi dodaqları da.
Ağ saçlı, birçəkli zənci qarı da
Onun gözlərinə göründü bu an,
Nurlar tökülürdü ağ saçlarından...
Baxıb övladına deyirdi: "Var ol!
Mənim saf südümə sən minnətdar ol".

Salonu titrədən səslər, alqışlar
Dənizlər, ümmanlar, dağlar aşırdı.
Rəssam dayanmışdı alnında vüqar;
Bu vüqar göylərlə qucaqlaşırdı.
O silib yaylıqla alın tərini,
Yenə varaqladı can dəftərini:
– Təhqirə çox dözdü babalarım, ah!..
Onların üzünə gülmədi sabah.
Gülmədi səadət, o gözəl pəri.
Eşqin, məhəbbətin xoşbəxt günləri.
Gülmədi zəhmətin, hünərin üzü,
Qul kimi aldılar, satdılar bizi...
Qılıncdan keçirdi bizi bu ağlar,
Lalə tək qızardı Amazon çayı.
Ah!.. Qırıb tükətdi bizi alçaqlar,
Nə qədər azalmış zəncinin sayı!
Aclıq da bir yandan öldürür bizi,
Ehtiyac qul eylər qəhrəmanı da...
Candan çıxardılar ürəyimizi,
Gedir qəlbimizin isti qanı da,
Ehtiyac qul eylər qəhrəmanı da...
Bir torpaq övladı, bir rəssamam mən.
Gəlin, qanunları yazaq yenidən!..
Səsimə səs versin bütün ölkələr,
Qoy qılınc qurşasın müstəmləkələr.
Xəyallar, arzular şirin olsa da,
Bunların nəsibi yoxmuş dünyada.
Azadlıq istəsə torpaq bir anlıq,
Qoy qılınc qurşasın hər qəhrəmanlıq...
Bir yanğın olub da, insan hünəri

Yarıb parçalasın bu zülmətləri.
Yıxılsın ağalar, qullar dünyası,
Dəyişsin insanın, ömrün mənası!..
Bir torpaq övladı, bir rəssamam mən.
Gəlin, qanunları yazaq yenidən!..

O yenə də nəfəs aldı, danışmayıb susdu bir dəm.
Onun səyyar xəyalında açıldı bir gözəl aləm:
Moskvadan keçir fikri... Qızıl Meydan aşıb-daşır,
Uzaqlarda batan günəş şəhər ilə vidalaşır.
Yanır Kreml ulduzları, yaqut kimi şölələnir,
Mavzoleyin mərmərinə işıq düşür, nur ələnir...
Böyük şəhər izdihamla qaynadıqca ümman kimi,
Yerin köksü nəfəs alır, nəfəs verir insan kimi.
Zavodların qışqırığı bir-birinə qarışdıqca,
Qara torpaq baş qaldırıb, göylər ilə yarışdıqca,
İnsan oğlu iftixarla dönüb baxır qüdrətinə.
Min bir ilham ziynət verir şairlərin sənətinə.
Mənim də öz rübabımın tellərindən qopan səda
Gah Bakıda nəğmə deyir, gah da coşur Moskvada.
Əziz dostlar! Qurumamış sinəmdəki axar çaylar,
(El sazını, el sözünü yüz il keçsə el haraylar!)
Gecə keçir... Mürgüləyib rahatlanır böyük şəhər,
Sakit olur yerin, göyün qəlbindəki döyüntülər...
...Zəncininsə xəyalından gəlib keçir bu səhnələr,
Onun yanmış ürəyindən nələr keçir, bu dəm, nələr!
– Baxın, – deyir, – mən sürürəm öz azadlıq qatarımı,
Öz əlimlə yaradıram öz səadət baharımı.
Amerika, yaxşı dinlə bu qatarın ilk səsini!
Nəfəsimlə yandırmışam onun odlu nəfəsini...
Əfsanələr dünyasını unutduğum gündən bəri,
Tilsimləri yarıb keçir bu qatarın təkərləri.
Amerika, hər qərarı, hökmü verən zaman olur,
Bil ki, qullar dünyasının intiqamı yaman olur,
Dağlar, daşlar salam verir bu qatarın sürətinə,
Tanrıların gücü çatmaz inqilabın qüdrətinə!
Mən keçdikcə bu odların, alovların qucağından:

– Uğur olsun! – eşidirəm dünyanın hər bucağından...
Öz arzuma yetişməmiş yarı yolda ölsəm əgər,
Ağ birçəkli nənəmi də basıb keçsə bu təkərlər,
Dayandıran deyiləm mən bu qatarı bir an belə...
Vulkan olub od püskürsə dəniz belə, umman belə,
Tufanların qoynunda da mayağımız sönməyəcək,
Öz yayından çıxan oxlar bir də geri dönməyəcək!
Amerika, hər qərarı, hökmü verən zaman olur,
Bil ki, qullar dünyasının intiqamı yaman olur!
Artıq zənci tribunadan vüqar ilə düşüb enir,
Onun dolğun gözlərində min bir ümid şölələnir.
O, ölümə zəfər çalan bir xəstə tək ayılmışdır,
Onun səsi bu kürsüdən dünyalara yayılmışdır,

* * *

Mən görürəm! Qoca Şərqin övladları oyanmışdır,
Dəlik-deşik bayraqların rəngi qana boyanmışdır.
Cəlladlara baş əyməyir Misrin qədim ehramları,
Cırır matəm köynəyini göyün qərib axşamları.
Himalayın zirvəsini yaz günəşi dolandıqca,
Qarlı dağlar səsə düşüb, axar çaylar bulandıqca,
Top tüstüsü halqalanır sıx ormanlar arasından,
Bulaq kimi qan qaynayır igidlərin yarasından.
Buddaların kitabını parçalayıb varaq-varaq,
Dəmirlərdən, poladlardan köynək geyir qara torpaq.
Kommunizmin bayraqları cərgə-cərgə gəlib keçir,
Zülmətlərin daş qəlbini nizə kimi dəlib keçir...
Homindanın ordusu da qatır kimi dırnaq tökür,
Çan Kay-şinin gözlərinə ölüm gəlir, zülmət çökür...
Salam, yoldaş Çju-de! Uğur olsun zəfərinə,
Sən süngünlə yol açırsan bir qurtuluş səhərinə...
Salam sənə, əziz yoldaş! Bilməsəm də mən dilini,
Bilirəm ki, sən cəbhədə dəfn elədin sevgilini...
Əsgər kimi and da içdin, şəhid olmuş o qıza sən,
Damla-damla göz yaşları axıtmadın gözlərindən,
Bircə ovuc torpaq atdın o məzara öz əlinlə,
Günəş kimi şölə çəkib, alovlandı əməlinlə.

Qoca Roma! Günəş doğur göylərinə gecə yarı,
Gözün aydın, sağalmışdır Tolyattinin yaraları,
O yenə də meydan açır, qızıl bayraq əlindədir.
Axın-axın, qoşun-qoşun salamına gəlir hamı..
Qoca Roma! Mən görürəm qoynundakı izdihamı!
Mən baxıram dalğa-dalğa keçən qızıl bayraqlara,
Gedir zəfər orduları zülmətləri yara-yara!
Qəhrəmanlar qılıncını suya çəkir qızıl qanda,
Ağzındakı duaları şaşırmışdır Vatikan da...
Qoca Roma! Günəş doğur göylərinə gecə yarı,
Gözün aydın, sağalmışdır Tolyattinin yaraları!
Bu yandan da Paris yenə sığışmayır yerə-göyə,
İşçi qardaş ağ günlərin qapısını döyə-döyə,
Çəkicini yerə qoyub, qurşadıqca yarağını,
Öz başında tutur yenə kommunizmin bayrağını.
Satqınlara ölüm! – deyir mərd oğullar, igid qızlar,
Marat kimi bayraq alıb hücum çəkir fransızlar.
Gah olur ki, böyük şəhər dalğalanır ümman kimi.
Gah da nəbzi döyünməyir bir can verən insan kimi!
Qatar durur... Yollar susur... Yer tərpənir ağır-ağır,
Dilim-dilim alovlanan baxışlardan qəzəb yağır.
Təyyarələr uçuşmayır, vaporların odu sönür.
Hər saatın, dəqiqənin ağırlığı ilə dönür...
Odur! Odur! Al bayraqlar cərgə-cərgə gəlib keçir,
Zülmətlərin daş qəlbini nizə kimi dəlib keçir.
Avropanın oğulları qılıncını qoymur qına,
Yenə dollar dünyasının lərzə düşür varlığına...

*1948*

## MUĞAN

Qoy göyün ulduzu, göyə nur saçsın,
Yerin də arzusu yerdə gül açsın...

Yenə də yamyaşıl geyinir dağlar,
Göz kimi durulur qaynar bulaqlar.
Əriyir güneylər döşündəki qar,
Yağış da isladır o göy çəməni –
Təbiət ilhama çağırır məni!

Görürəm, dan yeri yenə sökülür,
Göydən yer üzünə nurlar tökülür.
Zəmilər, tarlalar üzümə gülür,
Saralır gözümdə sünbülün dəni,
Bu nemət ilhama çağırır məni!

Mən yaranmamışam göylər övladı,
Əzəl şöhrətimdir torpağın adı.
Bu eşqim çoxuna qismət olmadı...
Şairim, aç, payla söz xəzinəni!
Şeriyyət ilhama çağırır məni!

Ürək dil açır ki, – sönməmiş odum, –
Hücuma başlayır mənim söz ordum.
Könüllər mülkündə min yuva qurdum;
Unutmaz aləmdə sevən sevəni,
Məhəbbət ilhama çağırır məni!

O kimdir, külüngü dağ kimi vurur?
Keçici bayraq da yanında durur?
Görürəm, o yeni bir dünya qurur...
Loğmanlar yazacaq bu qərinəni;

Bu hikmət ilhama çağırır məni!
Muğana su gəlir, Milə su gəlir,
Axışıb öz eli-ulusu gəlir...

Torpağa insanın arzusu gəlir –
Bağrıma basıram ana vətəni;
Bu ülfət ilhama çağırır məni!

*Birinci nəğmə*

De, yolun düşdümü Muğan düzünə?
Piyada gəzdinmi çölləri sən də?
Söz qoşub ceyranın qara gözünə,
Dincini aldınmı bir göy çəməndə?

Yerdən ayağını quş kimi üzüb,
Yay kimi dartınıb, ox kimi süzüb,
Yenə öz sürünü nizamla düzüb,
Baş alıb gedirsən hayana, ceyran?

Əzəldən meylini salıb çöllərə,
Bəxtini tapşırdın bizim ellərə,
O qara gözlərin düşdü dillərə.
Dişlərin oxşayır mərcana, ceyran!

Bir məsəl qalmışdır ata-babadan:
Uçarda turacdır, qaçarda ceyran
Bir mən deyiləm ki, hüsnünə heyran,
Şöhrətin yayılıb hər yana, ceyran!

Sükuta qərq olmuş ürəyimlə mən
Keçirəm yenə də Muğan çölündən.
Yanında balası, yağış gölündən
Əyilib su içir bir ana ceyran!

Elə ki, son bahar min büsat qurur,
Kolları-kosları yıxıb uçurur,
Sıxlaşıb bir yerə baş-başa durur
Düşəndə çovğuna, borana ceyran.

On addım kənarda yatmayır təkə,
Gəzinir, oylağa baş çəkə-çəkə.
Gələn qaraltıdır, yoxsa təhlükə?
Bir özünə baxır, bir ona ceyran!

Ovçu, insaf elə, keçmə bu düzdən!
O çöllər qızını ayırma bizdən!
Qoyma ağrı keçə ürəyimizdən, –
Qıyma öz qanına boyana ceyran!
Nə gözəl yaraşır Muğana ceyran!

*İkinci nəğmə*

Muğandan keçirəm, meyxoşdur bahar...
Ömrü az olsa da burdakı yazın,
Vətən sevdasına düşən sənətkar,
De, indi nə çalır sədəfli sazın?

Gündoğan al geyir, xoşbəxtdir səhər,
Gözlə ölçülməyir sonsuz yamaclar.
Nədir dinlədiyim bu xoş nəğmələr?
Baharın eşqilə ötür turaclar!

Hər kolun dibinə diqqətlə baxsan,
Bir yaşıl süfrə var, duy o neməti.
Tutub bu dünyanı qalmayacaqsan...
Duy ömür adlanan bir şeriyyəti!

Muğandan keçirəm, göydən od yağır...
Bir buxar istisi gətirir külək.
Mən addım atdıqca hey ağır-ağır,
Tərləyib islanır əynimdə köynək.

Muğanın ciyəri su istəyir, su!
Susuz dodaq kimi çatlayır torpaq.
Bahardır! Bahardır, yerin arzusu,
O, insan əlilə şəfa tapacaq!

Muğandan keçirəm, daralır hava,
Boz üzmü göstərir ellərə şoran?
Elə bil, boğulub qaralır hava,
Cırır köynəyini bürküdən aran...

Odlamı qovuşur yerlə asiman?
Alışıb yanırmı ellər, obalar?
Gözümdən od çıxır, başımdan duman,
Qəlbimdə deyirəm: – Yazıq babalar!

Ah! Yazıq babalar, dözüb min dərdə,
Vaxtsız öldünüzsə, durur adınız.
Əsrlər boyunca bu boz çöllərdə
Bir vətən eşqilə siz yaşadınız!

Bir vətən eşqilə Mildə, Muğanda
Min bir oba qurub, qışlaq saldınız;
Günəşlər yurdunu zülmət boğanda
At sürüb, ox atıb, qılınc çaldınız!

Bir vətən eşqilə ərlər, ərənlər
Muğan çöllərində çadırlar qurdu.
Torpaqlı damlarda ömür sürənlər
Xosrov ordusunun döşündən vurdu.

O cəllad at çapdı bir vaxt Muğanda,
Talamaq istədi ana yurdumu.
O həris gözləri oynadı qanda,
Qan boğa bilmədi zəfər ordumu...

Tomris o cəlladdan qisas alaraq,
– Hökmdar! Tacından daha keç! – dedi.
Başını bir tuluq qana salaraq,
– Diriykən doymadın, indi iç! – dedi.
Tarix inciməsin, qayıdaq yenə
Muğan səhrasının axşam seyrinə.

*Üçüncü nəğmə*

Axşamdır... Günəşin rəngi qırmızı,
Buludlar çəhrayı, üfüqlər laldır.
Yerlə vidalaşır o göylər qızı,
Səyyar buludların rəngi xal-xaldır.

Sükuta qərq olmuş sonsuz yamaclar,
Şəhərlər uzaqdır, kəndlər də seyrək.
Arxların üstündə tək-tək ağaclar,
Yalqızlıq içində sıxılır ürək.

Atını dördnala çapdırır külək,
Qopur kötüyündən tikanlı kollar.
Gah sağa, gah sola üz döndərərək,
Bizi çox çaşdırır dolaşıq yollar.

Bu lal səhralara səs salır hərdən
Uzaqdan qışqıran bir qatar səsi.
Bir xoş arzu kimi keçir qəlbimdən
Qaynar şəhərlərin isti nəfəsi...

Bu zaman xəyala gedirəm bir an,
Sağımda, solumda işıqlar yanır;
Şəfəqlər içində sayrışır Muğan,
Səhralar al-əlvan rəngə boyanır...

Uzanmış şəhərin polad əlləri,
Qatarlar, avtolar gəlir Muğana.
Kəndlər, qəsəbələr tutmuş çölləri,
Sükunət ölümdür... Düşmənəm ona!

Gülür yolçuların üzünə, budur,
Hər addım başında kiçik bir şəhər...
Tənhalıq dərdini çöllər unudur,
Dənizə bənzəyir yaşıl zəmilər.

Göydə mator səsi, yerdə təmtəraq,
İnsanlar qaynaşır bir ümman kimi.
Baxıb cəlalına sevinir torpaq;
Xəstəlikdən durmuş bir insan kimi...

Bir qızıl qan olub axar sular da,
Can verir torpağın damarlarına;
Günəş salam verir bu arzularda
Muğan torpağının hər baharına.

Könül, xəyalatdan ayrıl bir anlıq,
Gələcək günlərin öz şairi var.
Axşamdır, uzanır alaqaranlıq,
Qorx ki, təsvirimiz yarımçıq qalar!

*Dördüncü nəğmə*

Maşını sür görək, Anatoli, sür!
Bu yaxın komada dincələk bir az.
Qoyun sürüləri nə çox görünür?
Bir dələmə tapıb içsək pis olmaz.

Çıxır qarşımıza qoca bir çoban,
Çiyni yapıncılı, boyu çinar tək.
Azacıq çal düşmüş qaşlar altından
Qırğı baxışları gülümsəyərək,

Yerindən quş kimi qalxır ayağa.
Hələ bükülməmiş onun qaməti;
Açıq bir alınla gəlir qabağa,
Belədir ellərin gözəl adəti.

Qabarıq sinəsi sürmüş irəli,
Baxıram qocanın boyuna bir dəm.
Gözündə qaynayır gənclik illəri,
O çöllər oğluna salam verirəm.

Çoban qarşılayır bizi xoşsifət,
Tuluqdan süd tökür: – Buyurun, – deyə,
Atüstü olsa da, qısa bir söhbət
Dönür unudulmaz bir xatirəyə:

– Kimsən, haralısan? Danış, ay çoban!
– Dağıstan əhliyəm, ləzgiyəm, qardaş!
Qışlaq yerimizdir qədimdən Muğan,
Biz ona həmdəmik, o bizə sirdaş.

– Yaxşı, nə verəcək sənə bu qışlaq?
Yoxsa bir qoyunun iki olacaq? –
Çoban gülümsəyir, bilmirəm nədən,
Verir cavabını fikirləşmədən:

– Muğan, Muğan olsa, biri üç elər.
Muğan tufan olsa, üçü heç elər...

Oxucum! Belədir aqil babalar,
Bir dastan yaradır ikicə sözlə;
Bu kamal dünyası gülər bir üzlə
Nəsildən-nəsilə keçir yadigar...

Bizsə vaxt itirib qafiyələrə,
Deyirik, sözlərin sayı çoxalsın.
Dinləyən əl çalsın bizə bir kərə,
Sonra nə düşünsün, nə də zövq alsın!

Sən ey başladığım bu uzun şeir!
Yadda qalacaqmı barı bir sözün?
Sənət dünyasına eşqin nə deyir?
De ağmı, qaramı çıxacaq üzün?

Bəlkə, bir sətrim də, bircə bəndim də
Ellərin yadında qalmayacaqdır?
Bəlkə, bir şerimi doğma kəndimdə
Aşıqlar sazında çalmayacaqdır?

Taleyim beləsə... Kor olsun gözü!
Bu dərdi bir şair daşıyacaqdır.
Lakin o qocanın bayaqkı sözü
Nəsildən-nəsilə yaşayacaqdır:

“Muğan, Muğan olsa, biri üç elər,
Muğan tufan olsa, üçü heç elər...”

*Beşinci nəğmə*

## MUĞAN GECƏLƏRİ

Göy üzündə lopa-lopa ulduzlar yanır,
Bənzəri var şairlərin söz dünyasına.
Bircə anda göylər neçə rəngə boyanır,
Mən heyranam təbiətin bu mənasına.

Qoca Muğan fikrə getmiş bir loğman kimi
Sinəsinə nəqş eləyir bu ülviyyəti...
Səhra duyur, səhra duyur, bir insan kimi,
Saf gecənin qəlbindəki bir şeriyyəti...

Açıldıqca kitab kimi o, varaq-varaq
Min bir gecə dastanından şirin oxunur.
Yer üzünə şölə saçır neçə min çıraq,
Şəfəqlərin ağ sütunu ərşə toxunur.

Muğan sakit, ağlım çaşır, fikrim dolaşır,
Hey baxıram, nə gələn var, nə də bir gedən.
Külək əsir, dörd yanımda qurdlar ulaşır.
Tük ürpərir lal gecənin vahiməsindən.

Mənsə kiçik bir komada fikrə dalmışam,
Qoca çoban kol-kos yığıb ocaq yandırır.
İki gözlə seyr etdiyim bu sakit axşam,
Bilsən, nələr düşündürür, nələr andırır!..

Ay işığı süfrə açır Muğan düzünə,
Göz doymayır şeriyyətin bu qismətindən.
Muğan çölü ayna tutmuş göyün üzünə;
Elə bil ki, nur tökülür qız ismətindən...

Ana torpaq! Ana torpaq! Sənin bu hüsnün
Şerimizin ürəyində nəqş olunmadı.
Heç olmasa, vətənimin eşqinə bu gün,
Bircə tablo yaradaydı hər söz ustadı.

Ay aydınlıq, göy süd kimi, gülür hər tərəf.
Başım üstə qah-qah ötən durna qatarı
Ordu çəkib, nizam qurub, düzülüb səf-səf,
Bir ox kimi enib gəlir səhraya sarı...

Gəlin! Gəlin! Muğan sizə çoxdan tanışdır.
Od ələnir, qan çilənir yenə Bağdada...
Yazıq quşlar, orda sizə yer qalmamışdır;
Başınızdan qoy keçməsin min qan, min qada!

Utanmayın! Acsınızmı? Tökülün düzə,
Sizin yerdə nə yonca var, nə tarla, nə dən,
Ağır toplar divan tutdu, yazıqlar, sizə!
Yenə varmı öz yurdunu atıb tərk edən?

Heyrət ilə göy üzünə baxıram hərdən;
Səyyar fikrim ulduzlarla durur yanaşı.
Şəfəqlərin qucağında baxır göylərdən
Səyyarələr dünyasının əzəl sirdaşı...

Qoca Zərdüşt! Qoca Zərdüşt! Üç min il qabaq
Sən də Muğan səhrasını gəzib dolandın!
Min ölümlə, fəlakətlə qarşılaşaraq,
Araz kimi gah durulub, gah da bulandın!

Ötərgi də olsa, bu gün söhbət açım mən
Torpaq olmuş o Loğmanın əməllərindən

“Üç min bahar keçəcəkdir bu əfsanədən,
Qara geyib matəm tutan xain Əhrimən
Təslim olub baş əyəcək ulu Hürmüz.

Öz taxtını tapşıracaq gecə gündüzə;
Qadir günəş əridəcək o vaxt zülməti,
Yer oğlunu boğmayacaq yerin möhnəti.

Göy üzünə çəkiləcək soyuq və azar;
Səhralarda çiçək açıb gülən arzular
Dodaqlarda şərqi kimi səslənəcəkdir...

Nə cananlar, neçə canlar bəslənəcəkdir
Zaman görmüş, dünya görmüş Muğan düzündə;
Yer görəcək öz hüsnünü insan üzündə...

O vaxt aşıb-daşacaqdır bağlar, bağatlar,
Ömür kimi uzanacaq günlər, saatlar;
Tarixlərə şərəfli bir vaxt gələcəkdir.

Ölümlərin ömrü, günü gödələcəkdir,
Yaşıl məxmər geyinəcək susuz yamaclar;
Boy atacaq yetim kimi boysuz ağaclar.

Ağ sulara əks edəcək ulduzlar, aylar,
Yer üzündə qalmayacaq körpüsüz çaylar
İnsan oğlu güvənəcək öz qüdrətinə.

Tanrıların yaratdığı can möhnətinə
O vaxt qəbir qazacaqdır insan əlləri;
Sevinəcək məhəbbətin saf əməlləri...

Bu ilanlar, bu çiyanlar, mələşən çöllər,
Daxmalarda ömür sürən obalar, ellər
Daş saraylar yaradacaq öz hünərilə;

Öpüşdükcə səadətin ağ günlərilə
Hər ocaqda ney tutulub, toy başlanacaq...
İnsan ömrü min büsatla alqışlanacaq...

Öz ətrindən məst olacaq güllər-çiçəklər;
Yerə həsrət çəkəcəkdir göydə mələklər...
Yer üzünün şan-şöhrəti olacaq insan;
Nə bir azar qalacaqdır, nə ölüm, nə qan..."

Qoca Zərdüşt! Gecə keçir, yol üstəyəm mən;
Qoy hələlik ayrı düşsün dost əllərimiz.
Yeni dünya gəlib keçir indi gözümdən,
Bəlkə bir də görüşmədik bu dünyada biz...

Sən də sağ ol, qoca çoban! Vaxt ötür daha.
Azmı qalır, çoxmu qalır, görən sabaha?
Ancaq bizə bir yol salğa, hayandadır Kür? –
Çoban baxır bir səhraya, bir bizə sarı:
– Gedin! – deyir, – şimaldakı ulduza sarı,
O həmişə Kür çayının üstdə görünür...

*Yeddinci nəğmə*

## KÜR

Boz dağların arasından axan Kür
"Yandım!" deyən səhraları dolaşır.
Onun qəlbi qəlbim kimi döyünür,
Dağlar yarıb öz eşqinə yol açır.

Əzəl gündən min arzuyla bu ürək
Çox qışqırıb haray salır gecələr.
Sübhə kimi nərə çəkən o pələng
Qollarına baş söykəyir hər səhər...

Ağ at kimi sıçradıqca dalğalar,
Qolundakı zəncirləri Kür qırır.

Boğulduqca dara düşmüş o şikar,
Maral kimi dil çıxarıb hayqırır.

Şair, onun qüdrətini duya bil!
Əngin!.. – deyir, o da qartal kimidir.
Məcrasına sığışmayan Kür deyil,
Zaman görmüş bir torpağın qəlbidir...

Kür üstündə at oynadar sərt külək;
Bulud gələr, şimşək oynar, od çaxar.
O, bəzən də bir şairin ruhu tək
Qəmli-qəmli fikrə gedib lal axar...

Yaşılbaşlar qanad çırpar suyuna,
Gah durular, gah da dönüb bulanar.
Arabir də səhraların boynuna
Acıqlı Kür ilan kimi dolanar.

Qırqovullar qaqqıldaşıb uçanda
Sıx ormanlar səsə düşür hər axşam.
Maral ürküb talalardan qaçanda
Arxasınca yüz xəyala dalmışam...

Kür qırağı... Qarayazı... göy çəmən...
Qoşa palıd... Tüstülənən od-ocaq!..
Saç ağardı, unutmadım sizi mən.
Hansı şair sizi bir də yazacaq?

Yarğan üstü... Bulaq başı... Mis səhəng...
Üç gəlinin bir ağızdan gülməyi,
Kəhər atın qanlı Kürü keçərək,
Baş sallayıb ağır-ağır gəlməyi...

Mən o qızın əlindən su içəndə,
Min arzuyla bu dünyaya baxmışam.
Dəli Kürü at belində keçəndə
Az qalmışdı axıb gedəm bir axşam...

Zaman keçir... Təzələşir fəsillər;
Görüşürük, ayrılırıq baharla.
Biz köçürük, gəlir yeni nəsillər;
Kür yenə də axıb gedirvüqarla...

Axır, axır... O dayanmaz bir an da.
O axdıqca qanad açır, qol açır.
Axar Kürüm kükrədiyi zamanda
Dağlar yarıb öz eşqinə yol açır.

Şair, onun qüdrətini duya bil!
Əngin!.. – deyir, o da qartal kimidir.
Məcrasına sığışmayan Kür deyil,
Zaman görmüş bir torpağın qəlbidir...

*Səkkizinci nəğmə*

İndi yavaş-yavaş addımlayaraq,
Təklənib gedirəm Kür qırağına.
Bir söyüd altında fikrə dalaraq,
Baxıram hüzn ilə "Qız bulağı"na

Bir yanım Kür çayı, bir yanım çəmən,
Sahillər döyünüb titrəyir zağ-zağ.
İndi söhbət açım on beş il qabaq
Kür üstdə baş verən bir faciədən:

Fəlakət, fəlakət! Yenə Kür daşır;
Suya qərq olacaq yenə zəmilər.
Dəli Kür qızışıb həddini aşır,
Baş-başa gəlmişdir ölümlə hünər!

Yox, o amansızdır, o dayanmayır,
Uçurub dağıdır yenə bəndləri;
O, insan eşqilə hələ yanmayır,
Ağzına götürür yaxın kəndləri.

Gecədir... Qaranlıq çökmüş Muğana.
Qığılcım kimidir seyrək ulduzlar...
Qaçır Kür boyunca bir bədbəxt ana,
Yerdənmi, göydənmi təmənnası var?

Axır qıjıltıyla qanlı Kür, axır...
Səsindən səhralar titrəyir zağ-zağ.
Bəzən buludlarda şimşək də çaxır,
Kürsə qılınc kimi parlayır dümağ...

Uçduqca yarğanlar, köklü ağaclar,
Kür udur onları bir əjdaha tək.
Sellərə qərq olur çöllər, yamaclar,
Şair, bir rəssam tək bu lövhəni çək!

Sanma ki, atlanan göy dalğalardır;
Kür öz qalxanını qaldırır göyə.
Ananın başına gen dünya dardır;
Yalvarır sulara göz döyə-döyə...

Divanə qadının o ağ saçları
Dağılıb çiyninə səpələnmişdir,
Elə bil, zülmətə nur ələnmişdir;
Zəif bir səs ilə qışqırır qarı.

Cırır yaxasını əllərilə, ah!
– Tanrım, eşit – deyir, – mənim dərdimi! –
Ana! Sığındığın o “böyük Allah”
Heç sənə dar gündə yol göstərdimi?

Yox! yox! Danışmayır, dinməyir göylər...
Kürsə yavaş-yavaş yatıb lal axır.
Gecə çox uzanır, doğmayır səhər;
Dalğalar qoynunda bir xəyal axır...

O bəzən qışqırır, haray çəkərək,
Sahilə çatmayır fəqət səs-küyü.

Axır... Bir nazənin, bir gözəl mələk;
Axır, barmağında nişan üzüyü...

Gözlərin dolmasın, ey nazlı pəri,
Boş yerə yapışma o dalğalardan;
Nahaq qucaqlama sərt ləpələri.
Qurtaran yoxdurmu səni bu dardan?

Odur, bax, şir kimi atılır suya
Sənin and içdiyin o gənc qəhrəman.
Nə ölümə baxır, nə də qorxuya,
Qurtarmaq istəyir səni bu dardan.

Yox... Yox! Yorulmayır onun qolları,
Sular parçalanır tunc sinəsində.
O səni axtarır bu gecə yarı
Qanlı dalğaların qorxunc səsində!

O gəlir... O sənə yaxınlaşır, bax!
Az qalır əlinə yetişsin əli...
Səbr elə, sevgilin gəlib çatacaq,
Bir az da səbr elə, Muğan gözəli!

Qız yenə qışqırır haray çəkərək,
Sahilə çatmayır onun səs-küyü.
Axır o nazəndə, o gözəl mələk;
Axır, barmağında nişan üzüyü...

Gün keçir, dolanır həftələr, aylar;
İllər yaşa dolur, zamansa dona.
Kürün sahilində bir göy çəmən var,
Ellər zaman-zaman baş çəkir ona.

Nədir çəməndəki o qoşa məzar?
O baş daşlarına yazılan nədir?
Kölgəmi salmışdır ona ağaclar?
Sən elə bilmə ki, bu əfsanədir!

Ay yanır gecələr, bağrı qan kimi,
Bu qoşa məzara eşq olsun deyə.
Kür də tutduğuna peşiman kimi,
Çəkilmiş sahildən bir az geriyə...

Ağ saçlı çobanlar, odunçular da
Bu qoşa məzara salama gəlir.
Bir qoşa bülbül də hər ilk baharda
Aşiqlər eşqilə ilhama gəlir...

Burda... Bu qoşacıq məzar yanında
Bir söyüd altında bulaq da qaynar;
Günəş tellərini yayan zamanda
Şəffaf sularında kölgələr oynar.

Yerdə çiçək açır qəbrin arzusu,
Ulduzlar bu yerin sirdaşlarıdır.
Deyirlər çeşmədə parlayan bu su
Nakam aşiqlərin göz yaşlarıdır...

"Məhəbbət" adlanan bu gülüstana
Bəzən ovçular da axışıb gəlir.
Hər kəs tüfəngini atıb bir yana,
Söyüd kölgəsində yatıb dincəlir.

Məni də yorduqca arabir şəhər,
Muğanın seyrinə çıxıram tək-tək.
Gün bir az qalxanda od tutub çöllər,
Birdən ağırlaşır çiynimdə tüfəng.

Günorta çağları çox dincəlmişəm
Sizə söylədiyim o göy çəməndə;
O söyüd altına qonaq gəlmişəm;
O müqəddəs sudan içmişəm mən də,
Sizə söylədiyim o göy çəməndə...

Oxucum! Qəmləndi ürəyin bir az;
Saraldın, deyəsən, qış günəşi tək...

Eləsə, mətləbi, sözü dəyişək,
Bir başqa söhbətə indi qulaq as!

İndi yanımca gəl, yapış əlimdən,
Bir Muğan qızına müsafir gedək.
Gözəl bir aləmi ziyarət edək,
Unut, o bayaqkı faciəni sən...

*Doqquzuncu nəğmə*

## MUĞAN QIZI

### I

Kürün qırağında, Muğan düzündə,
Zəmisi, tarlası suyun gözündə,
Salmanlı adlanan bir kəndciyəz var.
Onun dörd yanında yaşıl tarlalar.
Seyrək ağaclar, qamışlıqlar da
Yamyaşıl görünür lap son baharda.

Üz-üzə durmuşdur suvaqlı damlar,
Hay verib, hay alır gümrah adamlar;
Qızlar su götürür lilli arxlardan.

Kür üstə qurulmuş dəmir çarxlardan,
Polad motorlardan dağılan səda
Göy gurultusu tək gəzir havada...

Yerdə car çəksə də çarxların səsi,
Od tutub yansa da göyün nəfəsi,
Ceyranlar düzdədir... quşlar yuvada.

### II

Bir azdan doğacaq göydə ulduzlar;
Tarladan qayıdır gəlinlər, qızlar.
Elə bil, səs gəlir yerin qəlbindən:
“Getməyin! Sükuta qərq olur düzlər!”

Uzanır axşamın əli çöllərə,
Tarlalar qaralır buludlar kimi.
Üfüqdən ay doğub baxır ellərə,
Qəlbində bir sirri, sözü var kimi.

Bir böyük tarlaya qərq olmuşam mən;
Pambıq şaxlarının arasındayam.
Yollar, elə bil ki, qaçmış gözümdən,
Bilmirəm dünyanın harasındayam...

Birdən dayanıram... Dünya bir anlıq
Mənə xəyal kimi görünür bu dəm.
Tarla boş, ortada alaqaranlıq,
Fəqət, gözlərimə baxır bir sənəm.

Bu nədir? Yerdə də mehrabmı yanır?
Yoxsa gözlərimmi alacalanır?
Yox, yox, doğrudan da gördüyüm qızdır;
Hürkmüş maral kimi diksinir birdən
Bəs niyə tarlada bu vaxt yalqızdır?
Baxır... Tərpənməyir durduğu yerdən...

Ağarır başında bir ipək çalma,
Dönüb sual verir: – Kimsən, ay əmi?
– Qızım, kimliyimi tez xəbər alma;
Deyəsən, bir azca qorxdun, eləmi?

– Yox, niyə qorxuram, uşağam, nəyəm?
Deyəsən, ovçusan, bəs ovun hanı?
Quşla doludur ki, kəndin hər yanı
– Yox, ovçu deyiləm...
                                        Qızcığaz gülür;
Üzündən-gözündən nurlar tökülür.
Rəng alıb, rəng verir al yanaqları,
Bir öpüş görməmiş saf dodaqları.
Hələ solmamışdır qızılgül kimi,
Daranmış saçları bir sünbül kimi

Başını qaldırıb baxsa bir anlıq,
Dönüb şölələnər alaqaranlıq...
– Qızım, mən gəzirəm səhərdən bəri
Sizin kənd yerini, bu zəmiləri.
Nə yaxşı gümrahdır burda adamlar?
Üzlərdə nə nisgil, nə sarılıq var...
Qızdırma yoxdur ki?
 – Əvvəllər vardı.
Soyuqlar düşəndə lap çoxalardı.
– Bəs indi?
 – Kəndimiz çox dəyişmişdir.
Bizi gümrah tutan havadır, işdir!
– Çoxmu qalırsınız açıq havada?
– Hələ oyanmamış quşlar yuvada,
Hələ gün doğmamış oyanır ellər,
Gəl, deyə çağırır bizi bu çöllər.
Kişilər arx çəkir kürdən hər yana,
Gedir bir çoxu da şuma, kotana.
Gəlinlər, qızlar da dağılıb düzə,
Pambıq toplayırıq durub üz-üzə;
Bəzən işləyirik ay batanadək.
Müftə yaranmayır torpaqdan çörək...
Hələ qış vaxtı da qırovda, qarda
Biz pambıq yığırıq bu tarlalarda
Şaxta da görürük, ayaz da, gün də,
Hərə zəhmət çəkir bir iş üstündə.
Odur ki, canımız-başımız sağdır,
Elin yanında da üzümüz ağdır.
Ancaq ipəklərin yaxşısını siz
Şəhər qızlarına geydirirsiniz... –
Deyib, gülümsədi, susdu bir anlıq,
Üzündə oynadı bir mehribanlıq.
– Bəs sənin heç yoxdur ipək paltarın?
Elə, əynindəki bu çitdir arın?
– Bıy, elə mən dedim, inandın sən də?
Elə geyirəm ki, yeri gələndə!
Bəs necə gedirəm toya-mağara?

Bəzən şal geyirəm, bəzən də xara!
Qızcığaz bunları dediyi zaman,
Ağ günlər boylanır baxışlarından.
Bilirəm, görməmiş bu məsum pəri
Anamın çəkdiyi qara günləri.
Beşikdə tapmamış onu ehtiyac,
Od tutub yanmamış bu çöl, bu yamac.
– Mən qıza baxdıqca, duyuram bunu!
Duyuram toxluğun nə olduğunu...
Duyuram vətənin cəlalını mən.
Dünyalar əyilib keçir qəlbimdən...
– Deyirlər kəndə bir maşın gələcək,
Bilirsən, yalandır, yoxsa da, gerçək?
– Nə maşın? Traktor?
– Yox ey... – deyirlər
Bir maşın çıxıb ki, o, pambıq dərir!
– Bilirəm, elə bir maşın var, bəli.
– Onun da insan tək işləyir əli?
– İşləyir, özü də yorulmayır heç,
Sizin bu kəndə də gələcək tez-gec...
– Bəs maşın seçirmi yığdığı zaman
Açılan pambığı açılmamışdan?
– Seçir, açılmışı çox açıq seçir,
Bağlı qozanın da üstündən keçir...
O da insan kimi hiss edib duyur,
Yaxşını, yamanı üzdən oxuyur...

Bu dəm qəh-qəh çəkib qız birdən gülür,
Elə bil, ayağı yerdən üzülür.
Az qalır uğuna səadətindən.
Duyuram qəlbindən keçənləri mən...
– Ay əmi, o maşın tez gəlsə əgər,
Nə qədər sevinər bizim bu çöllər!
İş görər, tər tökər bir yandan o da.
Vaxtımız çox qalar elmə, savada.
Ev tikib, bağ salıb, yollar çəkərik,
Yollar kənarında güllər əkərik.

Özün bir fikr elə, gəl, bir anlığa,
Hərə bir əl qoysa abadanlığa,
Kəndimiz böyüyüb bir şəhər olar!
Hər gözəl axşamı bir səhər olar!
Birdən, o üzümə baxdı diqqətlə,
Qaşları çatıldı qızın heyrətlə:
– Tanıdım... Kitabda görmüşəm sizi,
Divardan asmışam bir şəklinizi.
Nə olar, bizə də bir şeir yazsan,
Bizim bu pambığa bir söz qoşmazsan?

**III**

Ay keçdi, il keçdi, ikinci dəfə
Yolum yenə düşdü o kənd tərəfə.
Dan yeri yenicə sökülən zaman
Mən yenə keçirdim o göy tarladan.
Üfüq yavaş-yavaş ağarışırdı,
Tarlada üç dəstə qız yarışırdı.
Tərpənib əsdikcə səhərin mehi,
Axır damla-damla şaxların şehi.
"Qış gəlir, qar gəlir, tez olun görək,
Çöldə bir qoza da qalmasın gərək!" –
Dedikcə qızların uçur əlləri,
Elə bil, sevinir pambıq çölləri;
Sinələr tövşüyür, yanaqlar yanır,
Qızlar nə dincəlir, nə də dayanır.
Buğlanır onların isti nəfəsi,
Qaynayır gəncliyin eşqi, həvəsi.

Günorta yetişdi, hava açıldı,
Günəşin üzündən nurlar saçıldı.
Yamyaşıl göründü yenə də tarla;
Yer göyə boylanıb baxdı vüqarla...
Bir söyüd altına yığışdı qızlar,
Şairi görməyən o "vəfasızlar".
– Nə olar, siz məni saymasanız da,
Sözümə bir məhəl qoymasanız da,

Sizi unutmayıb ömrümdə bir dəm,
Yenə də mən sizi deyib gəlmişəm.
Alın salamımı! –
Qızlar quş kimi,
Sıçrayıb qalxırlar məni görən tək.
O Muğan qızı da gülümsəyərək,
Böyük bir həsrətdən qurtulmuş kimi:
– Nə yaxşı, nə yaxşı gəldiniz, – deyir,
Qəlbimdə yurd salır canlı bir şeir...
– Sənə göndərdiyim şeri aldınmı?
Oxuyub heç məni yada saldınmı?
– Almışam. Əzbərdən bilirəm bütün,
Qızlar şərqi kimi oxuyur hər gün...
– Eləsə, bir söylə, qulaq asım mən,
Bir yeni ilham da alım səsindən ! –
Qız ayaq üstündə, sadə bir səslə
Oxuyur şerimi bir xoş nəfəslə:

"Muğanın pambığı faraş gələndə,
Qozalar gül açıb, üzə güləndə,
Qızlar iş gününə ipək böləndə,
Könüllər mülkündə ilk bahar olur.

Uğurlu yaranmış onun ayağı,
Mehri, ülfəti var insan sayağı.
Zərdüştlər yurdunun ana torpağı
Günəşin eşqilə çəmənzar olur.

Yaya tapşıranda öz yerini yaz,
Gündüzlər gün istər, gecələr ayaz.
Suyunun vaxtı da ötəndə bir az
Qaşqabaq sallayıb pürqübar olur.
Yamanca şıltaqdır bu nazlı sənəm,
Gərək göz olasan üstündə hər dəm.
Xoş sifət görəndə bu telli həmdəm,
O da öz əhdinə düz ilqar olur.

Quraqlıq keçəndə tez solur gülü,
Durur yetim kimi boynu bükülü.
Başlanır ellərin kasadlıq ili,
Muğanın başına dünya dar olur.

Yox, dil açır Muğan, o qızmış pələng:
– Bir qarış dəmyə də qalmasın gərək! –
Gəlir Mingəçevir, haray çəkərək,
Səhralar eşidib xəbərdar olur.

Odur, dəstə-dəstə komsomol gəlir,
De, Kürdən, Arazdan neçə qol gəlir?
Ay ellər, Muğanın ili bol gəlir,
Dost baxıb sevinir, düşmən xar olur.

Ah, nələr duyuram onun səsində,
Bu ellər qızının xoş nəfəsində.
Xurmayı saçları qatar-qatardır;
Bir az da Humaya bənzəri vardır.
Gözündə qaynayır eşqim, qüdrətim,
O əzəl ilhamım, əzəl sənətim...
Xəyalım yol gedir, uğurlar deyə,
Günəşli-gündüzlü bir gələcəyə...
Qızlar işə gedir, ayrılırıq biz,
Lakin ayrılmayır ürəklərimiz...

*Onuncu nəğmə*

## KÜRÜN BAYRAMI

Kiçicik bir sudur yer üzündə Kür.
Baxsan bu dünyanın xəritəsinə;
Bəs niyə qəlbimdə ümman döyünür,
Mən qulaq asdıqca Kürün səsinə?!

Təslim ol, dəli Kür! İnadı burax!
İndi sürməyirəm yerimi xışla...

Min illik yuxudan oyanır torpaq;
Bu insan eşqini sən də alqışla!

Dəvə karvanları deyil şöhrətim,
Dəmirlər əsrinin övladıyam mən!
Artıq azad olmuş ilk məhəbbətim
Sehirli göylərin təvəkkülündən...

Yaxandan yapışıb, soruşur insan
Vaxtsız ölümlərin intiqamını...
İndi bayram kimi ucaldır zaman
Vətən torpağının ehtişamını!

Zamandır, qanlı Kür, qaçma meydandan,
Çıxar qılıncını: bu mən, bu da sən!
Qoy sənin arxanda dursun "yaradan",
Mənsə qüvvət alım ellər gücündən!

Üstünə gəldikcə külünglər, bellər,
Açma öz ağzını bir əjdaha tək.
"Qanlı Kür" demişdir adına ellər,
Hirsli sularınla pəncələşərək!

De, kimsən? Bəlkə dost, bəlkə də yadsan?
De, nədir aləmdə fikrin, diləyin?
De, neçin bu qədər qəmdən azadsan,
Mərhəmət bilməyir soyuq ürəyin?

Xeyr! Sən nə yadsan, nə də ki düşmən;
Yerin övladıdır, məncə qüdrətin.
Yazıqlar olsun ki, insan deyilsən,
Sənin nə qəlbin var, nə məhəbbətin.

Bizsə insanlarıq, öz gücümüz var,
Bizik dənizləri baş-başa çatan.
Mərhəmət ummasın bizdən "tanrılar..."
Bizik şimşəklərə min kəmənd atan.

Adəmin, Həvvanın vaxtından bəri
Tilsimi dolaşıq, girdabı dərin,
O dilsiz-ağızsız qərinələri
Dəyişdi qüdrəti bolşeviklərin!..

Qullar dünyasını kökdən uçurub,
Şahların tacını ayağa saldıq.
Qəbirlər üstündə saraylar qurub,
Vaxtsız ölümlərdən intiqam aldıq...

Dedik ki, torpaqda nə səfil, nə ac,
Nə də bir kimsəsiz görünsün gərək.
Dedik ki, yerlərə batsın ehtiyac,
Nəsildən-nəsilə bol olsun çörək...

Dedik ki, şairlər Vətən mülkünə
Baxdıqca ürəyi, könlü şad olsun.
Hər gələn sabaha, hər keçən günə
İnsanın hünəri, eşqi ad olsun...

Ayları, illəri bir yerə qatdıq,
Zamanın nəbzini duyduq təbib tək...
Aclığı ölümün ağzına atdıq,
Yaşadıq, zülmətə qılınc çəkərək!

Gülşənə döndərib boz səhraları,
Üşütmə, qızdırma olmasın dedik.
Növrəstə qızların al yanaqları,
O gül dodaqları solmasın dedik.

Biz sirdaş yarandıq hər gözəlliyə,
Baş əydik hər yerdə ona hörmətlə...
Məhəbbət insana şöhrətdir deyə,
Yaşadıq müqəddəs bir məhəbbətlə...

Hər insan qəlbinin öz dünyasından
Hüsnə, səadətə yollar açıldı.

Eşqin, məhəbbətin saf mənasından
Könüllər mülkünə nurlar saçıldı...

Biz açdıq torpağın altında qalmış
Gün üzü görməmiş dəfinələri
Köhnə kağızların üstdə saralmış
Ağlın yaratdığı xəzinələri...

Açıb tarixlərin qol-qanadını,
Dahilər qəbrini hörmətlə qazdıq.
Onların şərəfli, şanlı adını
Mərmər abidələr üstündə yazdıq!

Sənə də biz dostuq, sirdaşıq, ey Kür,
Sənsə, üz döndərib, gəl qaçma bizdən.
Bil ki, qəlbimizdə qəlbin döyünür,
Qopara bilməzsən ürəyimizdən.

Südünü insana gəl halal elə,
Ondan içəcəkdir ellər, obalar.
Yenə axacaqsan sən cəlal ilə,
Qoymarıq pozula əzəlki ilqar...

Yenə dalğaların, ağ ləpələrin
Sakit gecələrdə pıçıldaşacaq...
Yayda da, qışda da buz kimi sərin
Ürəyin qüvvətlə aşıb-daşacaq...

Sağında, solunda meşələr yenə
Yamyaşıl geyəcək fəsli-baharda.
Gözəllər çıxacaq yenə seyrinə,
Gəlin tək bəzənən min laləzarda...

Saz sözlə dinəcək, tar şikəstəylə,
Ömrümüz yenə də xoş keçəcəkdir.
Marallar üstünə çıxıb dəstəylə,
Əyib buynuzunu su içəcəkdir.

Yenə səxavətlə aşıb-daşacaq
Qəlbi dağlar kimi böyük analar;
Yenə ovçu görüb qaqqıldaşacaq
Suyuna baş vurub çimən sonalar...

Sən elə bilmə ki, ömrün qocalır,
Biz sənin arxanıq, dostunuq, ey Kür!
Sənin də şöhrətin, şənin ucalır,
Bil ki, qəlbimizdə qəlbin döyünür!..

Biz qurudan zaman bataqlıqları
Dörd yanın çiçəklər, güllər açacaq.
O zaman qoynuna hər gecə yarı
İliç lampaları işıq saçacaq...

Sağında, solunda yeni şəhərlər
Səs-səsə verəcək min bir büsatla,
Sevdalı axşamlar, xoşbəxt səhərlər
Yüz nağıl olacaq min xatiratla.

Şəhərlər car çəkib yarışan zaman,
Dilsiz sükunəti sən udacaqsan...
Çöllər bir-birilə danışan zaman,
Tənhalıq dərdini unudacaqsan...

O günlər nə qədər yaxın görünür!
O günlər eşqinə yazıram mən.
Biz sənin arxanıq, dostunuq, ey Kür!
Bizim eşqimizi alqışla sən də!

Ey könül, Kür ilə söhbəti qurtar,
Uzundur onsuz da bu dastanımız;
Sabah da Bozdağa səfərimiz var,
Orda külüng vurur qəhrəmanımız...

*On birinci nəğmə*

## MİNGƏÇEVİR QƏHRƏMANI

Car çəkir, çarxların çaxnaşıq səsi,
Car çəkir qışqırır nəhəng motorlar.
Qızır baltaların polad pəncəsi,
İldırım, ildırım vurur Bozdağı,
O daşlı, qumsallı, gilli torpağı
Udur, lay-lay udur ekskavatorlar,
Hay salır, qışqırır nəhəng motorlar.

İnsanlar qaynaşır... Meydan darısqal.
Ürəklər, nəbzlər sürətlə vurur...
Qatarlar, avtolar gəlir dalbadal,
Keçici bayraqlar yan-yana durur;
Ürəklər, nəbzlər sürətlə vurur.

Od tökür, od tökür günəş ağzından;
Torpağın nəfəsi təngiyir hərdən.
Yanğınlar yağsa da yerə göylərdən,
Əl işdən soyumaz, ürək arzudan...

Dağlarla, daşlarla pəncələşərək,
İnsan istiqbalı salama gəlir...
Ayların, illərin ömrü gödəlir:
Saatlar dolanır saniyələr tək...

Şair! Bu fəlsəfən qalsın bir yana,
Yaxın get, salam ver o qəhrəmana.
Sən onun əlini tut öz əlinlə;
Bir Loğman kimi də qəlbini dinlə...

Görürsən? Səssizcə, başı aşağı,
Onun açıq alnı, qaşı-qabağı,
O qəmsiz, qüssəsiz, o xoşbəxt üzü
Mənim ilhamıma yaxındır, düzü...

(İnsan var, bir dəfə görsən də onu,
Ürək unutmayır ömrü uzunu.
Sənin ürəyində o yuva salır,
Ölüm gününədək yadında qalır;
Günəşli-gündüzlü bir xatirə tək,
Ondan ayrılmayır bir an da ürək...
Deyirsən, onu bir görəydim yenə,
Ya qonaq gələydi bir gün evinə,
Duz-çörək kəsəydi səninlə o da,
Ya da öz canını onun yolunda
Odlara ataydın!)
                    Xoşbəxtəm ki, mən
Belə bir insanın tutub əlindən,
– Buyur gəl,– deyirəm, – söz gülşənimə,
Mənim öz bağıma, öz gülşənimə!
Onunsa öz qəlbi, öz dünyası var;
Başında bambaşqa bir sevdası var.
O da Fərhad kimi dağ uçurur, bax!
Fərhad əfsanədir, xəyaldır ancaq...
Xəyallar nə qədər şirin olsa da,
İnsanın nəfəsi xoşdur dünyada...
Bəs kimdir, nəçidir bizim qəhrəman?
Söhbəti burdaca başlayaq ondan:

Ekskavator sözü yoxdur Sarvanımın öz dilində,
Ancaq ona həmdəm oldu öz yurdunda, öz elində...
O gündən ki, bizim Sarvan Kür üstünə ayaq basdı,
Bu sehrkar maşınların dillərinə qulaq asdı,
Dinlədikcə bu çarxların, dəmirlərin sərt səsini,
O udduqca motorların odlu, hisli, nəfəsini,
Bir az qorxdu... Bir az çaşdı...
Gözlərindən yuxu qaçdı,
Arabir də anıb yenə qalın "Topçu meşəsini",
Yada saldı həsrət ilə maralların nərəsini.
Yada düşdü nişanlısı, nazlı sular sonası da,
Öz oğlunu yola salmış ağ birçəkli anası da...
Ancaq geri qayıtmadı... Dedi: – Yolum irəlidir!..

O duydu ki, düşündü ki, bu yüksəliş illəridir.
O dedi ki: – Ellər məni gül-çiçəklə saldı yola,
Mən gələndə vədə verdim, and da içdim komsomola!
Bu minvalla dost oldular kiçik Sarvan, kiçik şəhər;
Nəhəng-nəhəng motorların qəlbindəki döyüntülər,
İnsanların, maşınların iş üstündə çaxnaşması,
Gecə vaxtı dəli Kürün gah qışqırıb, gah daşması
Nağıl kimi yuva saldı Sarvanımın ürəyində;
İqlim-iqlim gəzməyi var
Hər havaya dözməyi var,
insanın da, ürəyin də...
Ömürlük yol yoldaşıdır, doğrudan da bizə adət,
Vərdişləri övladıdır ömür adlı bu səadət...
Əzəl gündən insan oğlu əkdiyini harda biçsə,
Ömrü-günü alovların qucağında belə keçsə,
Sərin bahar nəsimi tək udur Vətən havasını;
Kim dəyişər yer üzünə öz yurdunu, yuvasını?!
(Kosmopolit tənqidçilər ömrü boyu dandı məni
Dedi: "Əsil şairlərin nə yurdu var, nə vətəni".
Dedi: "Bütün yer üzüdür sənətkarın ana yurdu,
Bizim çoban şairi də saz üstündə şeri qurdu..."
– Bəli, – dedim, – saz üstündə!.. Lakin onun mənasını,
Vətənimin, millətimin qəhrəmanlıq dünyasını
Simfonyalar lisanilə öz evimdə ötmüşəm mən,
Vaşinqton salonları keçməmişdir ürəyimdən.
Sizin kimi nökər olub yad ocağı qalamadım,
Vətənimin vüqarı tək vüqarlıdır mənim adım...
Nizaminin, Füzulinin söhbətinə qulaq asdım,
Puşkinin söz rübabını öz sinəmin üstə basdım...
Sarvanımın qəlbində də bu arzular dünyası var,
Bizim eldə qələm ilə külüngün bir mənası var...
Bu səbəbdən o gənc ilə mən bu qədər sirdaş oldum,
Sirdaş nədir, qardaş oldum!
Odur... Odur... Qəhrəmanım toz içində nəfəs alır,
Ekskavator boz dağlara haray çəkir, nərə salır.
Bir yay kimi çatılmışdır Sarvanımın qaşqabağı,
Bir-birinə qovuşdurur ayrı düşmüş iki dağı...

O torpağın qatlarına işlədikcə dərin-dərin,
Torpaq tökür, qum dağıdır kor gözünə zülmətlərin.
– Sement verin!
          Beton tökün!
                    – Qaçırmayın Kürü gözdən,
Bir an belə buraxmayaq cilovunu əlimizdən!
Etibarsız dostlar kimi oynamasın bizimlə Kür,
Görürsənmi? O bulanır... O hirslidir, o döyünür...
              Sellər, sular qudurmasın!
              Qurğumuzu uçurmasın!
              Qayaları sökün! Sökün!
              Sement verin! Beton tökün!
              Qəlbi daşdır, nədir yerin?
              Sement verin! Sement verin!
              Baltaları ehtiyatla!..
              Yola getməz dəmirlə daş...
              Tez ol, yoldaş!
                              Çoxalt toku!
              Tez ol, getdi günün çoxu.
              Axşam olub, qaralmamış
              Üfüqlərin çatıq qaşı,
              Şaxta düşüb, qar almamış
                              Dağı, daşı,
              Qayaları sökün! Sökün!
              Sement verin! Beton tökün!..
              Sellər, sular qudurmasın,
              Qurğumuzu uçurmasın!..
Bu səs mənim Sarvanımın, Sarvanımın səsidir, bax!
O nəfəsi səndən aldı, ana torpaq, ana torpaq!

*On ikinci nəğmə*

“Əridəcək Sarvan dağı,
İldırımdır əl-ayağı,
Nə yorulur, nə dincəlir,
Nə gözünə yuxu gəlir.

Yaxınlaşıb gəlir qış da...
Bağladığım bu yarışda
Mən Sarvanı keçəm gərək!
Yox, sürəyi mən yarmasam,
Al bayrağı aparmasam,
Kəndimizdən köçəm gərək!
Açıl, açıl, qol-qanadım!
Qız olsa da mənim adım,
Qoy baş əysin mənə çöllər...
Qoy arxamca bütün ellər
Alqış desin hünərimə,
Mənim zəfər günlərimə!...”
Deyən Manya Kərimova,
Saatları qova-qova
Tarladadır ilk səhərdən.
Ürəyini sıxır hərdən
Bu il qışın tez gəlməsi,
Qozaların seyrəlməsi...
Boşa çıxır bəzən əli,
Bu el qızı, el gözəli
Öz qəlbinin yüz səsilə,
Öz eşqilə, həvəsilə
Gah durulur, gah bulanır
Axar sular ellər kimi;
Gözlərində yer dolanır
Ağır aylar, illər kimi.
Arabir də o durulur,
Qüvvət duyur biləyində.
Elə bil ki, ürəyində
Saz tutulub, toy qurulur.
Yayıldıqca saf nəfəsi
Yenə pambıq düzlərinə,
– Gəlin! – deyir onun səsi
Kəndimizin qızlarına.
Sərin-sərin əsən külək
Nəğmə tutur kamança tək.
Manya! Manya! Çöllərə sən

Yenə meydan oxuyursan!
Nələr keçir ürəyindən?
Bəlkə, şeir oxuyursan
Öz qəlbində, qəhrəman qız?
Şöhrətini ağız-ağız.
Oymaq-oymaq eşitdik biz,
Dağa döndü ürəyimiz...

“Əridəcək Sarvan dağı,
İldırımdır əl-ayağı...”
Deyir Manya düşünərək.
Sinəsində çarpan ürək
Qan dağıdır əllərinə.
Cumur pambıq çöllərinə
Bu qəhrəman ellər qızı,
Yaşıl donlu çöllər qızı.
Bizsə baxıb alqış deyək
Bu cəlala, bu dövrana.
Öz əsrinin sürətilə
Ayaqlaşan hər insana.

*On üçüncü nəğmə*

Gecə keçmiş, göy qaranlıq, yuxudadır qara torpaq;
Mingəçevir işıqları şölə verir çıraq-çıraq.
Minib kəhər ürgəsini gəlməmişdir hələ səhər,
Bir otaqda şirin-şirin söhbətdədir iki nəfər:
“Oğul, Sarvan! Soruşursan axtardığım şeylər nədir? –
Bu yeraltı Mingəçevir bir tükənməz dəfinədir,

Üstünü toz-torpaq almış
Bu pas tutmuş qılınca bax!
Neçə min il bundan qabaq
At belində qılınc çalmış
Sənin şanlı babaların,
Öz ellərin, obaların
Bu torpaqda şəhər salmış.

Bu gördüyün qalaq-qalaq
Sümüklərə baxdıqca mən,
Ürəyimdən varaq-varaq
Nə dastanlar keçir, bilsən!

Bu günlərin qucağında dəfn edilmiş qəhrəmanlar,
Qurşaq tutub, at oynadıb, ox süzdürmüş pəhləvanlar,
Bu nizələr, bu qalxanlar, bu şeypurlar soruş nədir?
Zənn etmə ki, əfsanədir...
Bütün bunlar babalardan bizə qalmış yadigardır,
Batıb getmiş hər axşamın,
Hər qaralıb sönmüş şamın
Öz hüsnü var, adı vardır...
Köhlən atlar kişnədikcə ərənlərin nərəsinə,
Ağır göylər, asimanlar dilə gəlmiş yer səsinə...
Burda Pompey ordusuna sinə gərmiş bizim ellər,
Yanğınların arasında nəfəs almış aylar, illər;
Vətən oğlu qılınc çəkmiş qəsbkarlar dünyasına,
Tunc sinələr hasar olmuş ürəklərin sevdasına.
Görürsənmi? Türbəsindən baş qaldıran bu gəlin də,
Öz döşünə qalxan çəkib, qılınc tutmuş sağ əlində.
Amazonka dediyiniz bu qəhrəman qadın nəsli
Qədim Muğan çöllərində çadır qurub bahar fəsli:
Yurdumuzun şöhrətinə min bir cəlal yaradarmış,
Hər ürəyin bir alovu, hər ocağın odu varmış...
Yazıqlar ki, bir nişan da, qalmamışdır ondan barı,
Yer altında batıb getmiş o dövranın dastanları”.

Qoca alim danışdıqca od parlayır nəfəsində,
Elə bil ki, mən gülür bir Loğmanın xoş səsində.
Sarvan ona qulaq asır... Qulaq asır lap doyunca,
Günəş doğur... Onlar çıxıb qoşa gəzir Kür boyunca...
“Oğul, Sarvan! Bu gördüyün ot bitməyən boz dağların
Ətəkləri məskəniymiş durna gözlü bulaqların;
Bu dağların sinəsində neçə min il bundan qabaq,
Bulud kimi qalaq-qalaq
Sıx meşələr öz-özünə heyran olub boy atarmış,
Təbiəti yuxusundan orman səsi oyadarmış,

Qoca şirlər pəncəsini yerə basıb asta-asta,
Sarı xallı pələnglər də sıçrayarmış şikar üstə.
Tüstü çıxıb, səs qoparmış daş hasarlı qalalardan,
Sürü-sürü marallar da yol salarmış talalardan.
Çiçəklərin bahar ətri Kür üstünə yayılarmış,
Axşamdan tez yatan insan səhərdən tez ayılarmış...

İndi düşün, oğul, Sarvan!
Xəyalına gətir bir an
Bu boz dağlar qucağında –
Ata-baba ocağında
Qurduğumuz bir dənizi...
Oğlum! Elm deyir bunu:
Neçə yüz il keçəcəkdir,
Bu dənizin saf suyunu
Bu boz dağlar içəcəkdir...
Torpağın can yanğıları
Soyuduqca zaman-zaman,
Yaşıl donlu neçə orman
Salamlayıb ilk baharı,
Sarmaşacaq boz dağlara..."
Sarvanımın fikri bu dəm
Uçub gedir uzaqlara...
Gözlərindən bir xoş aləm
Gəlib keçir varaq-varaq
Çinarlar baş qaldıraraq,
Sərvlər göz vurur göyə.
Bölük-bölük sıx meşələr
Ətəyində bənövşələr
Ətir yayır səhərlərə,
Kür üstdəki şəhərlərə.
Sarvanımın rəngi gülür
İlk baharın laləsi tək;
Gözlərindən nur tökülür
Qucaq-qucaq, ətək-ətək...

Ekskavator təpələri lay-lay açıb, lay-lay qazır,
Qoca alim saxsı yığıb yer altında tarix yazır...

“Oğul, Sarvan! Dərinə get, heç çəkinmə, qorxma məndən,
Yol aç, oğlum, yol aç elmin, düşüncənin gözünə sən;
Keçir məni yer altına iyirminci təbəqədən,
Yuxarıdan işıq da sal! İşıq da sal günəş kimi,
Babaların taleyi tək qaranlıqdır yerin dibi...”
Külək əsir, qum sovrulur, gözə girir toz-tozanaq,
Qoca alim yer altından ayrılmayır hələ, ancaq.
Gah tər basır vücudunu, gah büdrəyir, gah yıxılır,
Yer darısqal, hava tozlu, nəfəs durur, can sıxılır.
Alim yenə qucaq-qucaq yığır qədim saxsıları,
Yer altdakı hər kərpicin üstündəki yazıları.
O qabların-qacaqların rəngi hələ solmamışdır.
Arçan ağac daşa dönmüş, fəqət torpaq olmamışdır...
Çovğun vurur, qum sovrulur, külək əsir,
Neçin bizim qoca alim çox tələsir?
Sarvan Kürü döndərməmiş, su basmamış bu yerləri,
Can atır ki, tamamlasın başladığı bir əsəri,
Bizsə baxıb, alqış deyək bu cəlala, bu dövrana,
Öz əsrinin sürətilə ayaqlaşan hər insana.
Bir-birini qova-qova gəlib keçir aylar, illər,
Şoranlıqda bağ salınır, bataqlıqda qızılgüllər.
Bir tərəfdə insan əli daş daşıyır, saray qurur,
Bir tərəfdə qoca memar divarlara naxış vurur,
Lal çölləri yuxusundan dik qaldırır zavod səsi...
Üzə gülür, ürək açır küçələrin səliqəsi;
Kür üstünün hər axşamı günəşli bir səhər olur;
Gözümüzün qabağında Mingəçevir şəhər olur...

*On dördüncü nəğmə*

## QƏHRƏMANIN ZƏFƏRİ

Mədəniyyət sarayının geniş səhnəsi
Gül-çiçəklə bəzənmişdir, buyurun, baxın!
Dil açmışdır orkestrin ahəngdar səsi.
Böyük-kiçik, dalğa-dalğa hey axın-axın

Gəlib keçir qapılardan sellər gücilə,
Ellər gəlir, doğrudan da, ellər gücilə...
Salon böyük, gələnlərin sayısa min-min,
Divar boyu ayaq üstdə duranlar da var;
Bayırdadır gecikənlər, geri qalanlar...
Qocaların, cavanların, südəmərlərin
Üz-gözündən səhər kimi nurlar tökülür.
Elə bil ki, səma gülür, torpaq da gülür
Seyr etdiyim bu təntənə, bu təmtəraqla.
Hava qızır insanların tünd nəfəsindən,
Qızlar açır başındakı ağ örpəyini,
Gəlinlər də əlindəki üz yelpiyini,
Salon gülür gözlərdəki min bir maraqla.
Alqışların, şüarların odlu səsindən
Zağ-zağ əsir aynabəndlər, gen pəncərələr,
Xışıldayır dəniz kimi sıx-sıx cərgələr.
Divarlarda ad çıxarmış qəhrəmanların
Qatar-qatar əksi durur, bax! iftixarla!
Döşlərində neçə orden vardır onların!
Gah Suvorov, gah Kutuzov baxır vüqarla...
Gah da düşür Leninqrad göyləri yada –
Hüseynbala şahin kimi süzür havada...
Yanğınlarda nəfəs alır göylə yer altı.
Bayraq alıb hücum çəkir "416..."
Cavanşirin surəti də baxır divardan,
Zəfər çalır, qalib çıxır vuruşmalardan...
Yavaş-yavaş pərdə qalxır, səhnə görünür,
Oturmuşdur Sarvan ilə Manya yanaşı, –
Bizim zəhmət dünyasının iki yoldaşı...
(Nə Manyanın uzun saçı yerlə sürünür,
Nə də Sarvan eşqə düşüb çöllər dolanır,
Nə də süzüb yaşılbaşlar göllər dolanır.)
Zəng çalınır, hamı susur, üzlərdə diqqət!..
Qoca fəhlə iki sözlə iclası açır,
İri gözlü projektorlar hey işıq saçır...
(Bu sözlərdə nə şeir var, nə də ki, hikmət!)
Fotoqraflar "hücum çəkir" dörd bir tərəfdən,

Bu dostların “hücumunu” çox görmüşəm mən...
Bu haşiyəm qoy hələlik qalsın bir yana.
Sədr baxır gah Manyaya, gah da Sarvana,
Sonra birdən qaşlarını sıx-sıx çataraq,
Deyir: – Sarvan öz vaxtında bir ay da qabaq...
Gur alqışlar kəsir sədrin sözünü bu an,
Kür boyuna lərzə düşür səs dalğasından...
Alqış deyir qəhrəmana odlu ürəklər,
Bütün salon ehtiramla qalxır ayağa;
Sarvanımın ürəyisə, dönür bir dağa...
Gözlərində yuva salır gözəl diləklər.
Manyanın da ürəyində bir günəş yanır,
Onun da can otağında səhər oyanır...
Bizim günlər belə keçir. İş ilə hünər
Şöhrət olur bu torpağın hər övladına;
Alqışlayır, salamlayır onu ürəklər,
Vətən mülkü heykəl qoyur onun adına.
İnsan ömrü yaşa dolub, keçdikcə illər,
Hörmət ilə yad eləyir bizi nəsillər.
Nə Otello, nə Faustdur bizim, qəhrəman,
Nə də tərki-vətən olmuş Harolda bənzər.
Nə Peçorin, nə Məcnundur bizim bu insan,
Nə də xəyal dünyasında səadət gəzər.
Öz əlilə o yaratdı səadətini –
Gözəl ömrün, gözəl eşqin hər nemətini.

O kimdir? Kürsüyə gəlir vüqarla,
Nə qədər sevinir, nə qədər şəndir.
Elə bil, gün doğub gəlir baharla,
Hüsnünün şöləsi çəmən-çəməndir.
Yox, yox! Nə günəşdir, nə də ki, çəmən,
Manyadır, Manyadır o gözəl pəri.
Onu tarlalarda çoxmu görmüsən?
Ayazda, şaxtada donan əlləri
Nə boya görmüşdü, nə də bir əlcək...
O indi qonaqdır Mingəçevirdə,
Danışır kürsüyə sinə gərərək.

Siz onu seyr edin, seyr edin bir də:
“Yoldaşlar!
Yarışdıq Sarvan ilə mən.
Sizin yanınızda şərt bağladıq biz;
Boyun qaçırmadıq öz vədimizdən,
İşdə yorulmadı ürəklərimiz.
Sarvan tez əritdi yıxdığı dağı,
Çünki ildırımmış əli, ayağı...
Mən də çox əlləşdim, çarpışdım, ancaq
Şadam, sevinirəm ürəkdən buna,
Eşq olsun vətənin igid oğluna!”
Manya bu sözləri dediyi zaman
Şəfəqlər tökülür qaşqabağından,
Onun üzü, gözü gülürdü bu dəm,
Gülürdü qəlbində, doğrudan, aləm.
(Ah, müqəddəs qadın, müqəddəs ana!)
O sonra bayrağı verdi Sarvana.
Dostlar əl tutuşub gülümsədilər:
Sevindi yazdığım bu kiçik əsər.
Qışqırdı salonun sıx izdihamı:
“Qız deyil, pələngdir”, – söylədi hamı...
O axşam ağzını açmadı Sarvan,
Bütün iclas boyu o heç dinmədi.
Manyanın üzünə baxdığı zaman,
Çaldığı zəfərlə çox sevinmədi...
Qartal öz gücünü duyar yuvada,
Uçub cövlan elər sonra havada.
Yarar tufanları düşdükcə dara,
Qıy vurub şığıyar ağ buludlara,
Uçar, o uçduqca üfüq boyunca,
Hökmünü göstərib göyə doyunca...
Hünərlə qovuşar can sirdaşına...
Lakin enən zaman qaya başına,
Nə qanad şaqqıldar, nə də qıy vurar,
Büküb öz boynunu sakitcə durar...
Pələng nərə çəkər hücumdan qabaq,
Bir an da bir yerdə dayanmayaraq...

Dağlar dilə gələr onun səsindən,
Ağaclar titrəyər hər nərəsindən...
Ancaq, şikarını aldımı pələng,
Hayqırmaz bir daha nərə çəkərək;
Hay vurub, qıy vurub qışqırmaz yenə,
Sakitcə baş qoyar öz pəncəsinə...
Oxucum, bu surət sizə bəllidir,
Onun ilk avtoru Sarıvəllidir.

Dağlara rast gələn axar sular da
Qəzəblə qışqırar hər ilk baharda.
Boz üzlü daşlarla pəncələşərək,
O hər dalğasını vurar pəncə tək;
Köksünü dağlara hey döyə-döyə,
Sinəsi üstündə qaldırar göyə
Ağır qayaları... daşları dələr,
Özünə yol açıb səhraya gələr,
Dərib nəfəsini sonra dinc axar...
Xilqətin nə gözəl bir mənası var!

De, hansı qəhrəman, hansı komandan
Şir kimi cəbhələr yardığı zaman
Qəşş edib ayağı yerdən üzüldü?
Arxada qalanın üstünə güldü?
Hansı qızıl əsgər zəfər günündə
Öz döşünə döyüb ellər önündə,
Başını dik tutub bir “mənəm” dedi,
Odlara düşsəm də, ölmərəm, dedi?

Əsrlər boyunca ərlər, ərənlər,
İşıqlı günlərə yol göstərənlər,
Aləmə idrakla salam verənlər,
Hünər dünyasından doymadı, getdi...

Hər zaman, hər yerdə “mənəm” deyənlər,
Dostun ağ günündə qara geyənlər,
Qəlbini qurd kimi söküb yeyənlər
Daş üstə bir daş da qoymadı, getdi!

Kimin ki, ürəyi eldən üzüldü,
Bəxtinə nə Günəş, nə də Ay güldü,
Özü xəzəl olub vaxtsız töküldü,
Ömrün baharını duymadı, getdi...

Yeridir, bir məsəl desəm yadigar,
Deməsəm ürəyim sıxılacaqdır:
Birinci addımda lovğalananlar
İkinci addımda yıxılacaqdır!..

İndi bil, oxucum, düşün ki, Sarvan
O günkü iclasda niyə dinmədi,
Düşün ki, nə üçün bizim qəhrəman
Çaldığı zəfərə çox sevinmədi...

*On beşinci nəğmə*

## QƏHRƏMANIN ARZULARI

Deyirlər ki, şirin yuxu gözəl nemətdir,
Ağır keçən yuxularda ürək dincəlir;
Hər sabaha bir müqəddəs arzuyla gəlir...
Bu vərdiş də insan üçün bir səadətdir!
Axşam! Axşam! Bu qaraqaş, qaragöz pəri
Lay-lay çalıb, qucağında yatırdır bizi;
Ulduz-ulduz alışdıqca onun gözləri,
Məşəl tutub, seyrə çıxır ürəyimizi.
Gecə bütün kainatı bağrına basır,
Xəyala da o qərq olur bir insan kimi;
Daşların da nəfəsinə o qulaq asır,
Açıqürək, qaraqabaq bir Loğman kimi...
Gecə boylu bir qadındır... ağrı çəkərək,
Xoşüzlü bir uşaq kimi doğur səhəri...
Bu ananın sevincidir göydəki rəng-rəng
Sevdiyimiz al günəşin ilk şəfəqləri...
Şairanə bir gecədir Kür qırağında,

Ağ ulduzlar çiçək-çiçək, göy üzü çəmən...
Təbiətin bu mənalı, gözəl çağında
Yatmamışıq, düşünürük Sarvan ilə mən.
Uzanmamış qəhrəmanım hələ yataqda,
Şair kimi min zövq alır Kürün səsindən.
Ayaq üstdə fikirləşir, gəzir otaqda...
Mənsə ona göz qoyuram pəncərəsindən.
Bəzən onun kaman kimi çatılır qaşı,
Bəzən də bir gülüş gəzir dodaqlarında;
Gəlir gözü qarşısına ürək sirdaşı:
Dağ laləsi açılmışdır yanaqlarında...
Odur!Odur! Kənd yerində açılır səhər...
İndi bulaq başındadır onun dildarı:
Ürəyindən nələr keçir o qızın, nələr!
Həsrət ilə salamlayır uzaq yolları...
Elə bu dəm xəyalında uçur qəhrəman,
Qartal kimi gəlib qonur bulaq başına;
Nur tökülür bu vaxt qızın baxışlarından,
Səhəngini söykəyərək bulaq daşına,
Gülər üzlə qarşılayır gələn qonağı;
Sevgililər həsrət ilə qucaqlaşırlar.
Bir od kimi yanır qızın bir cüt yanağı;
Təpə üstdən yavaş-yavaş kəndə aşırlar...

Nə xoşbəxtdir bu aləmdə sevən ürəklər!
Məhəbbətin meyvəsidir müqəddəs insan!
Saf arzular, saf əməllər, təmiz diləklər
Yaranmışdır məhəbbətin ilk mənasından...
Oğlum, oğlum! Kimə yoldaş olsan əzəldən,
Ömrün boyu eşqə can ver, yaşa vüqarla.
Öz oğlunun, öz qızının sifətinə sən
Şərəfli bir ata kimi bax iftixarla!

Sən də, qızım, gözəl balam, sevsən ürəklə
Yaman gündə ayrı düşmə öz peymanından!..
Ömrün boyu yaşasan da yavan çörəklə,
Başqasının şöhrətini düşünmə bir an!..

Gecə keçmiş, Sarvan yenə düşünür yalqız;
Əlindəki məktubunu oxuyur bir də:
“Gözlə məni, gözlə məni, ey vəfalı qız!
İlk işıqlar yanan zaman Mingəçevirdə
Sən də bizim bu şəhərə gəlin gələrsən!
Əllərimlə yaratdığım, tikib qurduğum,
Keşiyində əsgər kimi ayıq durduğum
Bu şəhərdə səadətlə deyib gülərsən.
Elektrik lampaların şöləsi rəng-rəng
Yayıldıqca bizim geniş, yaşıl eyvana,
Aylar, illər səadətlə gəlib keçəcək,
Mən bir ata olacağam, sən də bir ana!
Üçotaqlı bir evim var Kür kənarında,
Sarmaşıqlar boy atmışdır eyvana sarı.
Axar Kürün silsiləli dalğalarında
Min rəng alıb, min rəng verir yer ulduzları...
Yerin məlum!.. Bilsən necə, necə yaraşar
Gəzişinə, duruşuna bizim bu şəhər.
Lap yadımdan çıxmışdı ki, necə deyərlər,
Hər intizar acısının bir şirnisi var...”
Gecə keçmiş, Sarvan yenə düşünür yalqız:
“Gözlə məni, gözlə məni, ey vəfalı qız!”
Sarvanımın bir arzusu şirin olsa da,
Birdən fikri uçub gedir lap uzaqlara...
Hər xəyalın min oylağı vardır dünyada,
İqlim-iqlim seyrə çıxar dağ yara-yara...
İnsan fikri səyyar olar, bir yerdə durmaz.
Yer oğlunun ziynətidir, məncə, bu nemət.
Tısbağalar şahin kimi çolpa uçurmaz;
Öküzlərdə nə qanad var, nə də ki, sürət!..
Hara keçir ürəyindən, Sarvanın, hara?
O yerləri görmüşdümü barı bir dəfə?
Xeyr, xeyr, getməmişdir o uzaqlara,
Heç yolu da düşməmişdir şimal tərəfə...

Ürəyindən keçən yeri kinolarda görmüş, ancaq
İndi fikri şimşək kimi yarıb keçir göy havanı;

Qızıl Meydan üstündəki insanlara qarışaraq,
O müqəddəs bir ürəklə salamlayır Moskvanı...
O, əvvəlcə ürəyində, vicdanında "Lenin" deyə,
Papağını başdan alıb daxil olur Mavzoleyə...
Addım-addım, asta-asta o türbəyə ayaq basır;
Ziyarətə gələnlərin ağzı qıfıl, dili laldır,
Bu sükutun mənasına öz qəlbində qulaq asır...
Ürəklərdən-ürəklərə keçən hansı həsbi-haldır?
Aynabəndli bir tabutun qabağında o dayanır,
Milyonların ürəyi tək, o da yanır, o da yanır...
Lenin yumub gözlərini, elə bil ki, yuxu yatır...
Sarvan baxır, gözü dolur, qaşlarını sıx-sıx çatır,
Min sızıltı gəlib keçir ürəyindən onun bu an...
Qucaqlayıb öpüm, deyir, qoy Leninin ağ alnından.
Baxır... baxır... O, Leninin sifətinə, baxır yenə
Döşündəki bir ordenə, bir də kiçik əllərinə.
Qoca dünya! Qoca dünya! Sən Lenini bir də tanı!
Bu əllərlə o yazmışdır kommunizmin dastanını!
Bu əllərlə bizim Lenin zülm evinə balta vurdu,
Bu əllərlə bizim Lenin yetimlərə yuva qurdu...
Bu əllərlə o uçurdu qəsbkarlar dünyasını;
Azadlığın, qurtuluşun, qardaşlığın mənasını
Bu əllərdə o gəzdirdi məşəl kimi diyar-diyar
Dünya böyük, Lenininsə hər ürəkdə bir evi var.
... Gələcəyə yol göstərən bu əllərlə salamladı;
İnsanlığa ziynət oldu bu aləmdə Lenin adı!
Aylar, illər gəlib keçir öz ömrünü saya-saya,
Bir türbəyə sığan Lenin sığışmayır bir dünyaya...

Sarvan çıxır Mavzoleydən, rəngi saralmış;
Bulud kimi tutulmuşdur qara gözləri...
Moskvanın axşamıdır, hava qaralmış,
Hələ Sarvan doymamışdır, gəzir şəhəri...

Saatları xəbər verir Kremlin zəng səsi;
Şəhər üstə qanad gərir bir yaz axşamı.
Qədim-qədim kilsələrin xaçlı qülləsi

Varaqlayır kitab kimi keçmiş əyyamı.
Sarvan hara baxır indi? – Yanır vüqarla,
Yanır Kremlin beşbucaqlı yaqut ulduzu.
Gör nə qədər ucalmışdır o iftixarla,
Ucalmasaq bizi görməz bütün yer üzü...

Sarvan baxır ulduzlara, baxır hörmətlə;
Elə bil ki, ürəyində səhər oyanır,
Uçur fikri, kainatı gəzir sürətlə,
Gözlərində bütün cahan nura boyanır...
... Rəssam gərək bu səhnəni yazıb-yarada!
Xəyalatdan ayrılmışdır Sarvanım, bu dəm
Onun xoşbəxt ürəyində saz tutur aləm...
Sarvan, Sarvan, çoxmu qalır, söylə, sabaha?
Uzan, qardaş, yuxuya get, bir azca dincəl!
Mən də bu gün çox yazmışam, yorğunam, daha;
Sən yenə də oyanaraq quşlardan əvvəl,
Tunc sinəni verməlisən bizim Bozdağa.
Mən də, qardaş, sənin kimi dağ aşmalıyam,
Sabah sənin əlindəki qızıl bayrağa
Ayrıca bir fəsil açıb söz qoşmalıyam...
Artıq, gecən xeyrə qalsın, bir az dincələk,
Sabaha da bu gün kimi zəfərlə gələk!

*On altıncı nəğmə*

## QƏHRƏMANIN BAYRAĞI

Bu dünyada bayraqların hədsizdir sayı,
Yer üzünün xəritəsi gör neçə rəngdir!?
Yüz xətt bölür hər ümmanı, hər kiçik çayı;
İranın da bayrağı var, rəmzi "pələngdir"...

O, qulların, zəiflərin üstünə hər an
Qızıb coşar, hücum çəkir "şiri-nər" kimi;
Mərd oğullar dilə gəlib, qızanda meydan

Şahın şiri quyruq qısar tülkülər kimi...
Eh, onunla nə işim var, cəhənnəmə ki!
İran, Turan, nə olsa da, yad torpağıdır.
Söz açdığım, Sarvanımın əllərindəki
Vətənimin, dövlətimin al bayrağıdır.

Bu gün tez açıldı səhər vaxtından;
Üfüqlər donunu geydi qırmızı.
Günəş – təbiətin xeyirxah qızı
Yerlərə düşmədi kəhər atından –
Gah düzə səyirtdi, gah dağa çıxdı;
Naxırlar, sürülər yaylağa çıxdı.

Meşələr səslənib, çöllər sevindi;
Lalələr açıldı Muğanda, Mildə.
Ötən qumruların rübabı dindi;
Sular şərbət oldu ağızda, dildə.

Ağaclar suyunu içdi yağışdan;
Doyunca islandı göy biçənəklər.
Quşlar yaxasını qurtardı qışdan;
Uçuşdu arılar, ağ kəpənəklər.

Gül açdı, ot bitdi qaya döşündə;
Baharın eşqilə göyərdi qumlar.
Dünya yerindədir, insan işində;
Buğlandı səhralar, qaraldı şumlar...

Çıxdı traktorlar Muğan düzünə,
İnsanı "gəl!" – deyə torpaq səslədi.
Kolxozçu baxdıqca yerin üzünə,
Hər kiçik sünbülə ümid bəslədi...

Qocalar dən səpdi xeyirxah əllə,
Dedilər: bərəkət çox olar şəksiz.
Ürək qan dağıdar cana əməllə.
Yer susuz yaşamaz, insan çörəksiz...

Qızlar, gəlinlər də çiynində kətmən,
Deyib gülə-gülə dağıldı çölə.
Elə bil, axışıb sonalar göydən
Uçub bölük-bölük töküldü gölə...

Duydu nəfəsini yer insanların;
El axıb düzlərə, çöllərə gəldi.
Şairi olduğum qəhrəmanların
Şöhrəti aylara, illərə gəldi.

Bəs bu iş zamanı, bu səhər çağı
Bizim Sarvanımız, deyin, hardadır?
Yanında keçici qızıl bayrağı,
Yenə öz yerində, boz dağlardadır.

Bir təpə üstündə sancmışdır onu;
Meh əsir, astaca yellənir bayraq,
Yer bilir Sarvanın kim olduğunu;
Elə bil, dil açıb danışır torpaq.

Ekskavator açır nəhəng ağzını;
Dağlara səs düşür səsindən yenə.
Yer sevir, yer sevir hər saf arzunu;
Yol verir qəlbinin dərinliyinə...

"Təslim ol, dəli Kür, inadı burax!
İndi sürməyirəm yerimi xışla;
Min illik yuxudan oyanır torpaq...
Bu insan eşqini sən də alqışla!" –

Dedikcə Sarvanın coşur ürəyi,
Önündə diz çökür boz qaya, Bozdağ;
Bayrağı yelləyir səhər küləyi;
Kürün ürəyisə titrəyir zağ-zağ.

Sarvanın alnından sel axır, bir sel,
İslanıb su olur əynində köynək.

Qəlbi qanadlanır, açılır tel-tel,
Yanan gözlərində rəqs edir şimşək.

İradə! İradə yaşadır bizi,
Onun nəfəsidir dağları yaran...
Odur məşəl tutan ürəyimizi,
Gələcək günlərə salam aparan...

Odur öz qüvvəti, öz qüdrətilə
Yalçın qayaları mum tək əridən;
İnsan xəyalının şeriyyətilə
Suları başqa bir səmtə yeridən...

Yüz min sətirdən çox söz sənətini
İradə əlilə yazdı Nizami...
Onunla göstərdi öz sənətini
Böyük dahilərin hər bir kəlamı.

Onsuz hünər evi gülşad olmazdı;
Gülüb sevinməzdi nə göy, nə də yer.
Firdovsi otuz il "Şahnamə" yazdı;
Bir də "İlliada"nı yaratdı Homer.

Marks da öz sonsuz iradəsilə
Yazdı "Kapital"ı fikrə nur saçdı;
O, fəhlə sinfinin həyat səsilə
Bir yeni aləmə qapılar açdı.

Lenin – o möhtəşəm dağlar qartalı
Uçuşda yorulub durmadı bir an;
Günəşli-gündüzlü bir istiqbalı
Qurtardı quzğunun caynaqlarından...

Bu dünya belədir, dərs olsun bizə,
Səbr ilə yaranar hər böyük zəfər...
Barı yüz addımlıq bir mənzil isə
Başa vurmamışdır iradəsizlər...

Az qalır, az qalır işin ömrünə;
Kür öz məcrasını dəyişəcəkdir...
El axıb, el gəlir bu böyük günə,
Sən elə bilmə ki, Sarvanım təkdir.

Qoy Sarvan işləsin, dağın üstdəki
Qızıl bayrağı da yelləsin külək.
Bizsə o bayraqla bir səyyah təki
Bir az yer üzünü gəzib seyr edək.

Xəzər dənizindən başlayaq sözü:
Dəniz buruqları qatar-qatardır.
Burda olmasa da Sarvanın özü,
Hər buruq üstündə bayrağı vardır...

May bayramı, Bakı böyük; parad keçir, bax,
Şəhər axır qoşun-qoşun sıx dalğalarla;
Sarvanımın əlindəki o qızıl bayraq
Bayram günü yüz-yüz olub keçir qatarla.

İndi fikrim Ural üstdə gəzdirir məni:
Neçə yerdə sancılmışdır bu qızıl bayraq.
Üzə çıxır yer altının qızıl mədəni.
Bir bəxtiyar ana kimi sevinir torpaq.

Yerə girib göz qoyuram şaxtalara mən;
İnsan oğlu yer altda da uçurur dağı.
Məşəl ilə yol açıram yüz təbəqədən,
Yer altda da seyr edirəm bu al bayrağı.

Uzaq toplar dilə gəlib dinəndə ruzgar,
Mərd oğullar bu bayraqla qalxdı ayağa.
Ömrü boyu tanrı deyən dindar qocalar
Baxıb xeyir-dua verdi bu al bayrağa.

Reyxstaqı seyr elədim iki il qabaq,
Meyit kimi tökülmüşdü qaşı-qabağı...

Onun üstdə dalğalanıb, Avropaya, bax,
Salam verdi vətənimin bu al bayrağı...

Niyə düşmən xofa düşüb rəngi saraldı?
Niyə çatdı qaşlarını iblis sayağı?
Çünki dünən Çin ordusu Nankini aldı;
Qırmızıdır bu ordunun zəfər bayrağı!

Jan Alezar saralmadı, ölümdən əvvəl:
– Kommunizmin əsgəriyəm, – dedi, – qardaşlar!
Mən ölsəm də, ölməyəcək sevdiyim əməl,
Yaşadacaq yer üzündə bizi, yoldaşlar!

Bir il qabaq bir faciə eşitmişəm, ah!..
Bir qəhrəman fədaidən söhbət açım mən.
O bilmiş ki, asacaqlar onu da sabah,
Bir al bayraq istəmişdir rəfiqəsindən...

Bu bayraqla o gəlmişdir dar ayağına;
Cəlladlara baş əyməmiş o iftixarla.
Kommunizmin bu müqəddəs al bayrağına
Ölüm vaxtı dönə-dönə baxmış vüqarla...

Bütün bunlar Sarvanımın gözündən keçir,
Vüqarından sinəsinə sığmayır ürək.
Boz dağlara, qayalara yeni don biçir,
Bayrağımın şöhrətilə o fəxr edərək!

Külək əsir, təpə üstdə yellənir bayraq;
Sarvanınsa tunc əlləri hələ işdədir.
Qoca Kürün qabağında dağ olur torpaq;
Yer də, göy də hər zamankı bir gərdişdədir...

Artıq, əl ver, vidalaşaq, ey qəhrəmanım!
Öz yerində, öz işində qoyuram səni.
Aylar ötür, yarımçıqdır hələ dastanım,
Səhraların sabahı da gözləyir məni.

*On yeddinci nəğmə*

## MUĞANIN SABAHI

Tarixlər şahidi Mingəçevirdə,
Bozdağın döşündə, quru bir yerdə
Dayanmış ağ saçlı mühəndisə bax!
Ayağı altında od tutur torpaq...
Nə bir kölgəlik var, nə də bir ağac,
Təngnəfəs olub yanır yal-yamac...
Osa qaşlarını sıx-sıx çataraq,
Baxır səhralara, baxır diqqətlə...
O neçin bu qədər xəyala dalır?
Nədən şair kimi o ilham alır?
Hara qanadlanır fikri sürətlə?
Baxır səhralara, baxır diqqətlə!

Qardaş! Üzündəki təbəssüm nədir?
Nədir qəlbindəki o döyüntülər?
Nədir alnındakı o aydın səhər?
Gələcək günlərə bəlkə müjdədir?
Söylə, üzündəki təbəssüm nədir?

Görürəm: qabarmış sinən vüqarla
Gözündə nur kimi rəqs edir hünər.
Qardaş! Yaşadığın saf arzularla
Yarandı yazdığım bu kiçik əsər.

De, yayın istisi alov tökdükcə
Neçin şimşək olub birdən çaxırsan?
Motorlar Bozdağı yarıb sökdükcə
Toz-duman içindən hara baxırsan?

Bir yeni aləmmi keçir gözündən?
Qonaqmı çağırır səni istiqbal?
O nə əfsanədir, nə də ki, xəyal...

Gələcək günlərə boylandıqca sən,
Bir yeni aləmmi keçir gözündən?

Yox, yox, uzaq deyil bizdən o aləm,
Ovcumda tutmuşam onun əlini.
Qoy sənin adından danışsın qələm
Vətən torpağının gəlhagəlini.

## YENİ ŞƏHƏR

Bozdağın qoynunda bir dəniz vardır;
Çinarlar sahildə qatar-qatardır.
Həmdəmim ləpələr, göy dalğalardır;
Uçur qayıqların ipək yelkəni,
Elə bil, Göy göldə gəzdirir məni.

Burda nəfəs alır böyük bir şəhər,
Şəhər, sığmayır geniş küçələr...
Hər evin surəti canlı bir əsər,
Var olsun, deyirəm hər memar əli,
Var olsun insanın eşqi, əməli!

Aynabənd evlərin eyvanı sərin,
Yuyunur qoynunda al şəfəqlərin;
Hər batan axşamın, doğan səhərin
Hüsnü salamlayır pəncərələri!
Günlər baş götürüb gedir irəli...

Ətrindən məst olur yüz bağça, yüz bağ,
Açır piyalə tək ağzını zanbaq...
İnsan əllərini duyduqca torpaq,
Göz açır xəstə tək gülümsəyərək,
Yerin sinəsində çarpır min ürək...

Gecələr car çəkir göyə zavodlar,
Qalxır bağçalardan alovlar, odlar...

Yerin varlığında bir yanğınmı var?
Yox, yox, səhv elədim, ürəkdir yanan...
Ürəkdir əməli ərşə dayanan...
Mənim romantikam!
                    Sən də qanadlan!
Yan, yan, bu gördüyün məşəllər kimi!
Sən də o daş qıran, saraylar quran,
Polad sinəsilə dağlar uçuran,
Ekskavator tutan o əllər kimi
Sən də hər şaxtaya, soyuğa qatlan,
Mənim romantikam, sən də qanadlan!
Odur, cərgə-cərgə sahil boyunca
Alışan çıraqlar bizə nə deyir?
Yerin cəlalını seyr et doyunca,
Yollara işıq sal... İşıqdır şeir...
İşıqdır zülməti əridən qüdrət;
İliç lampaları nə gözəl yanır!
Səhralar al-əlvan rəngə boyanır...
Toy libası geyən ana təbiət
İnsanın üzünə gülür hörmətlə...
Açır qucağını min məhəbbətlə
Hər addım başında bir yeni nemət...
Bir nübar yetirir ana təbiət.

*On səkkizinci nəğmə*

## BAKI–MİNGƏÇEVİR

– Allo! Mingəçevir!!
                    Bakıyam! Mənəm!
Bir az işıq göndər!
                    – Verə bilmərəm!..
Şirvan, Gəncəbasar, Qarabağ, Muğan –
Məndən işıq alır bütün gündoğan.
Məndən işıq alır min kənd, min şəhər,

Gündə yüz zəng olur: göndərhagöndər!
Hələ zavodlarım qalsın bir yana,
Şəkiyə, Şirvana, Milə, Muğana
Qatarlar işıqla salınır yola;
Dağlar dilə gəlir: – Uğurlar ola!
Bir də, mən işıqla əkib-biçirəm
Sünbülü süzülən bu zəmiləri...
İşıqla zülməti yarıb keçirəm
Açmamış Muğanın, Milin səhəri.
İşıqla çöllərə su göndərirəm,
Susuz səhralara can gəlsin deyə.
İşıqla düzlərdə pambıq dərirəm,
İnsanın əlləri dincəlsin deyə...
Elə ki, quraqlıq od çaxır, gəlir.
Özüm yağış olub göydən yağıram.
Hər axşam qapıma min naxır gəlir.
İşıqla at tutub, inək sağıram.
İşıqla axıdıb yerin altına,
Yuyub şoranları yonca əkirəm.
Baş vurub torpağın yeddi qatına,
Qayalar dağıdıb, yollar çəkirəm.
İşıqla açılır gecəm, gündüzüm,
İşıq sürətilə qurur əllərim?
İşıqla oyanır hər dağım, düzüm,
Aranlı, yaylaqlı ağır ellərim.
– Yaxşı, lovğalanma, bildik, gücün var!
Bizə minnət qoyma, borcunu qaytar!
– Nə borcdur? Ha vaxtdan?
                              – Bəs on il qabaq!..
Döşündə sarı gil, dizində batlaq,
Əlində bir hisli, bir qırıq fanar,
Kor kimi dolaşıb hey diyar-diyar,
Zülmətlər içində göz döydükcə sən,
Gecənin qoynuna nur saçmadımmı?
O vaxt anan kimi tutub əlindən,
Bağlı tilsimləri mən açmadımmı?

Yadından çıxdımı o uğurlu gün?
Qolundan yapışdı dövlətim, varım...
O vaxt küçələrim, meydançalarım
İşıqdan kasadlıq çəkdi səninçün...
Şirvan dağlarının üstdən aşaraq,
Bakıdan Xaldana qatarlaşaraq,
Gedən dirəkləri, dəmir telləri,
İşıq xətlərini mən qurmadımmı?
Günlərə, aylara qatıb illəri,
Bozdağı əridib uçurmadımmı?
Bakı bu sözləri dedi vüqarla,
Daha səs gəlmədi Mingəçevirdən;
Axıb Xəzər kimi göy dalğalarla,
İşıq karvanları göründü birdən...

*On doqquzuncu nəğmə*

## MUĞAN MEŞƏLƏRİ

Gün keçir, ay keçir, dolanır illər,
İnsan yaşa dolur, dünya qocalır.
Dəyişir hüsnünü aylar, fəsillər;
Keçən gün uzaqda qaralıb qalır...
Yüz illik bir palıd uçur kökündən,
Şitillər yayılıb bir orman olur,
Biz ayrı düşdükcə dünənki gündən,
Varaqlar qopduqca insan ömründən,
Sətirlər yığışıb bir dastan olur;
Şitillər yayılıb bir orman olur.

Dəyişir hər yerin axar-baxarı,
Sular da dəyişir öz məcrasını.
İnsanın hünəri, eşqi, vüqarı,
Öz əli, öz hüsnü, öz ixtiyarı
Dəyişir dünyanın ilk mənasını!

Yastığa baş qoyub yatırsan axşam,
Səhərsə yanında yeni bir nəfəs...
Gözündə min arzu, qəlbində min kam
Səni arxasınca aparır ilham –
Sonsuz bir məhəbbət, sonsuz bir həvəs,
İdraka sığmayan sonsuz bir dilək,
Mən, yenə var olsun, deyirəm, ürək!
Görürsən, yüz illik torpaqlı bir dam
Aynabənd bir saray olur bir ayda...
Baxır, gözlərinə inanmır adam,
Şəfəqlər sayrışır o evdə müdam,
Ona həsəd çəkir ulduz da, ay da...

(Məqsədim fəlsəfə deyildir, dostlar!
Nə yazsam, görürəm öz gözüm ilə.
Məndən də bu üslub qalsın yadigar –
Mənim də öz dilim, öz lisanım var.
Deyirəm öz sazım, öz sözüm ilə,
Nə yazsam, görürəm öz gözüm ilə.)

Budur, bax, Muğandan keçirəm yenə,
İndi olmasa da ötən gəncliyim,
Yataqda keçməyir qulaq dincliyim:
Əlimdə bir əsa, gözümdə çeşmək,
Loğman tək gəzirəm vətən mülkünü.

Yüz illər keçsə də unutmaz ürək
Vətənin ilkini, andın ilkini...
De, hanı, de, hanı otuz il qabaq
Gördüyüm Muğanın boz şoranları?
Gəzirəm, gəzirəm alqışlayaraq,
Muğanı yenidən yaradanları!

Sayım gördüyümü bir-bir, qulaq as.
Aç şair sözünün düyünlərini...
Sən də ana kimi öz bağrına bas
Muğan torpağının ağ günlərini:

Muğanda sayrışır bağlar-bağatlar,
Oynaşır ilxılar, kişnəşir atlar.
Axır qoşun-qoşun ellər-elatlar,
Hər addım başında bir kənd, bir şəhər.

Axır dəniz kimi yaşıl zəmilər,
Gül gülü çağırır, sünbül sünbülü.
O bir vaxt gördüyüm beli bükülü,
Yerliyi darısqal, içi bürkülü
O qamış komalar bəs indi hanı?

Aynabənd evlərin yaşıl eyvanı
Cənub göyləri tək üzə güldükcə,
Muğan səhrasına dan söküldükcə,
Evlərin üzündən nur töküldükcə,
Geniş pəncərələr açılır tay-tay.

Qınına qoymuşdur qılıncını yay...
Açmış çadırını boylu çinarlar,
Əyir budağını gülöyşə narlar.
Hər təmiz süfrədə neçə nemət var,
Xonçalar bəzənir rəngbərəng şamla.

Evlər ordu kimi durur nizamla,
Qızlar susəpənlə küçə suvarır,
Sərvlər baş əyib xəyala varır...
Göymü aşiq olub yerə yalvarır?
Yermi göyə gülür bu ehtişamla?

Baş əyib keçirəm bir ehtiramla
Burda rast gəldiyim insanlara mən.
Torpağın istisi keçir qəlbimdən...
Bir al bayraq kimi ucalır vətən;
Ucalır başımın üstdə vüqarla...

Baxıram yollara mən iftixarla:
Çöllərə məxmər tək döşənmiş yonca,

Kürün məməsini sorur doyunca;
Solmayır o aylar, illər boyunca;
Həşyəsi yamyaşıl bir xalı kimi....
Bir saf məhəbbətin vüsalı kimi,

Nə xoşbəxt açılır Muğanda sabah!
Nizami görmədi bu günləri, ah!..
Tapmadı qəlbinə bir istinadgah,
Getdi, ürəyində vətən möhnəti...

Uzundur Muğanın sözü, söhbəti,
Ondan ayrılmayaq, ömür yarıdır...
İndisə qəlbimi çəkib aparan,
Yorğun ayağımı yerdən qoparan
Muğan səhrasının ormanlarıdır:
Sərvlər görürəm ehramlar kimi...

Yaz günü, xoş mehli axşamlar kimi,
Xoşdur ağacların sərin kölgəsi.
Quşlar bölük-bölük meşəyə gəlir;
Yolçular arxların üstdə dincəlir;
Sərniyir anamız Odlar ölkəsi.
Soyuyur torpağın can yanğıları...
Budur, cərgə-cərgə cənuba sarı
Dayanmış nizamlı ordular kimi
Qovaqlar, ardıclar, söyüdlər, narlar,
Bir də qatar-qatar boylu çinarlar
Danışır arzusu, dili var kimi.
Onların qəlbini duya bilsəniz!
Meşələr! Meşələr! Doğrudan da siz
Yayda da, qışda da bir baharsınız.
İrandan Muğana taun tək əsən,
Yelin qabağını dağ kimi kəsən
Sizsiniz!.. Nə qədər lütfkarsınız!
Elə ki od tutub yanır gündoğan,
Bürküdən darıxır, boğulur Muğan,

Elə ki, ağzını açır gilavar,
Bir ölüm istisi duyur səhralar,
Yenə bir fəlakət olmasın deyə,
Zəmilər saralıb solmasın deyə,
Sinə gərirsiniz ölümə siz də.
Od-alov püskürən hərcayı yellər
Əsib parçalanır tunc sinənizdə...
Sizə taleyini tapşıran ellər
Şair xəyalı tək hüdudsuz çöllər
Kasadlıq çəkməyir, qalmayır darda!
Meşələr! Solmayın fırtınalarda!
Ana örpəyini boranda, qarda
Doğma balasının üstə sərən tək, –
Əsdikcə boz üzlü amansız külək,
Muğanın üstünə şal salırsınız...
Ellərin qeydinə siz qalırsınız...
Gecə də, gündüz də keşik çəkərək!
Şaxtalar vurmayır bağçanı-bağı,
Vaxtsız tökülməyir güllər, çiçəklər.
Saralıb solmayır göy biçənəklər,
Vaxtsız qocalmayır vətən torpağı...
Baxıb tarlaların yanmış üzünə,
Qocalar, qarılar döymür dizinə, –
Ömrü yazıq keçən balalarım tək.
Bu xoşbəxt sabahı duyduqca ürək,
Yaşamaq istəyir daima insan.
Qələm dilə gəlir, coşur arzular,
Ancaq sabahın da öz şairi var!
Gələcək günlərin simfoniyasından
O öz rübabilə söz açan zaman,
Bilirəm, məni də yad edəcəkdir!..
Onun da xeyirxah dilində ellər,
Onun da qəlbində sönməz əməllər,
Açdığım cığırla yol gedəcəkdir,
Bilirəm, məni də yad edəcəkdir...

**Epiloq**

Günəş salamlasın, a dostlar, sizi!
Gəlin vidalaşaq bu əsərimlə.
Hörmətlə sıxıram əllərinizi,
Vidalaşmayırıq əməllərimlə...

“Muğan” dastanını iki il qabaq
Bir səyahət günü başlamışam mən.
O öz vədəsinə gecikdi, ancaq,
Nə məndən inciyin, nə də qələmdən...

Yazdıqca “Muğan”ın hər nəğməsini
Gecələr şam kimi mən də yanmışam...
Duyduqca çöllərin xoş nəfəsini
Vaxtından gec yatıb, tez oyanmışam...

Nə qədər doğmadır burda hər nəfəs,
Bir də hər insanın, hər şeyin adı...
Bir ovuc torpağı göyə dəyişməz
Bir həyat şairi, bir yer övladı...

Mən indi hər sözün üstündə bəzən
Saatlar uzunu fikrə gedirəm.
Ayrılıb qocalmış qərinələrdən,
İndi öz əmrimi təsvir edirəm.

Desəm doğrusunu, Muğan düzündə
Açıldım neçə yol bir səhər kimi...
Yenə də gözlərim qaldı üzündə,
Doymadım, yarımçıq qitələr kimi...

Bəlkə də yazdığım bu gözəl pəri
Kamala yetməmiş bir gözəldir, ah!..
(Ancaq, o doğmadır, həm də xeyirxah...
Bir də lütfkardır onun gözləri!)

Sənin də ürəyin olsa lütfkar,
Bu canlı sənəti öz bağrına bas.
Hər kiçik sözün də öz dünyası var:
Yarımçıq olsa da, mənasız olmaz...

Gördüyün, seçdiyin nöqsanları sən
Bağışla, oxucum... mümkünsə, əgər...
Buyur, köməkçim ol, yapış əlimdən;
Mənim yaratdığım bu sadə əsər
Sənin şöhrətinlə bir dastan olsun...
Bir zəmiyə dönsün hər kiçik sünbül;
Muğanda əkdiyim bu xırdaca gül
Qoy sənin əlinlə gülüstan olsun!..

*1948–1949*

## AYGÜN

### I

Aygün hələ soyunmamış toy paltarını,
Hələ şaddır, bəxtiyardır dünyalar qədər;
Salamlayıb gözəl ömrün xoş baharını
Günəş ilə bir oyanır evdə hər səhər.

Əmirxanı oyatmayır, dincəlsin deyə,
Bəzən onun nəfəsinə qulaq da asır.
Şadlığından sığışmayıb yer ilə göyə,
Öz eşqini övlad kimi bağrına basır.

Qartal gözlü Əmirxanın baxışlarında
Bir kişilik, bir də vüqar oxuyur gəlin.
Onun geniş sinəsində, sıx qaşlarında
Deyirlər ki, gözü varmış neçə gözəlin.

Bir də ağır oturmağı, ağır durmağı,
Polad kimi cingildəyən nüfuzlu səsi,
Səxavəti, dostlar ilə məclis qurmağı,
Gözlərindən aşıb-daşan həyat həvəsi.

Hətta onun hər tərsliyi, hər inadı da,
Öz sözündən, dediyindən dönməməyi də,
Min insandan seçilməyən sadə adı da
Xoş görünür, şirin gəlir Aygünə hələ.

Bəzən ayna qabağında dayanıb gəlin
Öz hüsnünə dönə-dönə baxır vüqarla.
O duyduqca mənasını ilk məhəbbətin,
Xəyalında məclis qurur saf arzularla.

Arabir də pianonun ağ dillərini
Danışdırır, min zövq alır onun səsindən.
Göyərçin tək uçan görüb öz əllərini
Vəcdə gəlir ürəyinin titrəməsindən.

Əmirxan da, Əmirxan da çox sevir onu,
Bir-birinə hey can deyib, can eşidirlər.
Bayramlara, şənliklərə qoşa gedirlər.
(İlki kimi şirin keçə hər eşqin sonu).

Atasını görməmişdi körpə Əmirxan,
Anasısa bir ağ saçlı müəlliməydi.
Nə oğlunun "hə" sözünə "yox" dedi bir an,
Nə də onun bircə dəfə qəlbinə dəydi.

"Varım-yoxum bir oğuldur", – deyərək ana,
Əmirxanı danlamadı bircə kərə də.
Həddən artıq səxavətlər göstərib ona
Yerli-yersiz izin verdi məclislərə də.

Hələ onun on beş yaşı tamam olmamış
Öz yaşından böyüklərlə durub-oturdu.
Çiyinləri böyüməmiş, ətə dolmamış
Anasilə sözə gəlib, üzə də durdu.

Gah kaverkot, gah da şevyot paltar geyindi,
Sol qoluna hələ qızıl saat da taxdı.
Arabir də pul üstündə evdə deyindi,
Öz gündəlik dərslərinə ötərgi baxdı.

Ancaq onun yaranmadan bir zehni vardı –
Alıcı bir tərlan kimi tutardı sözü.
Məncə, bütün fənlərdən o, beş alardı,
Yazıqlar ki, öz qədrini bilmədi özü.

Bir də yalan danışmazdı: taqsırlarından
Heç vaxt boyun qaçırmazdı mərdi-mərdana;
Bununçun da Əmirxanı sevib hər zaman,
"Atasına oxşamışdır", – deyərdi ana.

Vaxt yetişdi, anası da rəhmətə getdi,
Bu həsrətin ağrısını duydu Əmirxan.

O bir müddət ayrılmayıb el qaydasından,
Tez-tez ana məzarını ziyarət etdi.

Ağ mərmərdən yondurduğu məzar daşında
Öz əlilə anasının əksini çəkdi.
Ot bitməyən, su çıxmayan bir dağ başında
Hələ qəbrin ətrafına ağac da əkdi.

Bir il sonra institutu dördlə bitirdi,
Dostlar ilə öpüşdü də öz şadlığından.
(Soyumamış subaylığın azadlığından)
Elə o yaz Aygünü də gəlin gətirdi.

Gözü qaldı ziyafətlər təntənəsində...
Yorulmadı məclislərin qeylü-qalından.
O, Aygünü, öz evini sevdisə, yenə
Subaylığı çıxarmadı öz xəyalından.

Darıxdısa... tək qoymadı evdə yarını,
Ona yalan deməyə də dili gəlmədi.
Gizli tutdu hərcayilik xəyallarını,
Ancaq ürək sinəsində heç dincəlmədi...

**II**

Elə o yay institutu bitirənləri
Nazir özü danışığa dəvət elədi.
Ata kimi danışdırıb hər bir nəfəri,
“Səadət də, gələcək də sizindir” dedi.

Sonra açıb Azərbaycan xəritəsini,
Göy dağları, boz çölləri göstərdi bir-bir;
Araz ilə Kür çayının birləşməsini
Nişan verib: – Baxın, – dedi, necə qəşəngdir!

Barmağını xəritədə o gəzdirərək,
Gəlib Muğan səhrasının üstdə dayandı.

Sinəsində təəssüflə döyündü ürək,
Gözlərində ulduz-ulduz arzular yandı...

“Baxın, – dedi, – yaxşı baxın qədim Muğana!
Min ildir ki, bu yerlərin qəlbi kövrəkdir...
“Həyat” deyir, su istəyir o yana-yana,
Hələ kəndlər, şəhərlər də burda seyrəkdir.

Hələ tamam qurumamış yağış gölləri,
Üzərində bulud-bulud uçur milçəklər.
Gün altında quruduqca vətən çölləri
Öz vaxtından tez saralır güllər, çiçəklər.

Göy zəmilər, göy bağlar da hələ tək-təkdir,
Çox tərəfdə nə kölgəlik, nə sərinlik var.
Cənubdan da əsən külək isti küləkdir,
Yarpaq töküb çılpaq qalır boysuz ağaclar.

Gedin, dostlar! Təbiətdən intiqam alın,
Bağ yaradın, bağça salın şoran yerində.
Zolaq-zolaq, yaşıl-yaşıl meşələr salın,
İnsan ömrü uzun olsun aran yerində.

Gedin, dostlar! Uğur olsun yollarınıza!
Yalnız insan əlləridir şöhrəti yerin.
İş üstündə qüvvə gəlsin qollarınıza,
Qəhrəmanlar dünyasilə səs-səsə verin!..”

Dinlədikcə bu sözləri gənc aqronomlar,
Alqışladı bu niyyəti hamı bir səslə.
Bir əməllə, bir arzuyla alışıb onlar,
Bir məqsədin yollarına düşdü həvəslə.

Təəssüf ki, bu səfərə çox sevinmədi.
Şad olmadı ürəyində yoldaş Əmirxan.
Söhbət vaxtı danışmadı, heç də dinmədi.
Etiraz da eləmədi utandığından...

### III

– Aygün, daha yığış, yetişdi zaman...
Yoldaşlarım kimi mən də Muğana
Aqronom gedirəm, – deyib Əmirxan,
Nazirin əmrini göstərdi ona.

Aygün imzalanmış əmrə baxaraq,
Özü də bilmədən xəyala getdi.
Bir anlıq sifəti ağardı dümağ,
Elə bil ruh uçub canı tərk etdi...

"Ayrılıq günləri gəldi" – deyərək,
Baxdı Əmirxana, baxdı həsrətlə.
Onun sinəsində çırpınan ürək
Yanırdı müqəddəs bir məhəbbətlə.

– Keçib... fikirləşmə, yığışın, gedək!
Hər halda Muğan da faydasız olmaz.
Xoşumuza gəlsə yaşarıq bir az,
Biz də çalışarıq başqaları tək.

Nə fikirləşirsən, nə düşünürsən? –
Aygün, ehtiyatla gülümsəyərək
– Yaxşı, institutu qurtarmayım mən?
– Onsuz da tapılar bir parça çörək...
Darıxma, dünyada nə qədər sağam
Arxanda dağ kimi dayanacağam.
Kasadlıq sözünü bilməyəcəksən...
– Bəs mənim taleyim, sənətim?.. Bəs sən
Olmazmı Muğana yalnız gedəsən?
– Olmaz!
                    Bir ay deyil evlənəli biz,
Ayrılıqmı çəksin ürəklərimiz?
Aygün fikrə getdi.
                    Ayrılıq... həsrət...
Əmirxan... çöl yeri, vəhşi təbiət...

Bəlkə xəstələndi o çöldə birdən,
Bir içim su verən olmasınmı bəs?
Bəlkə mən özüm də darıxdım hərdən.
Əmirxan düz deyir, tək gedə bilməz...

Bəs məktəb? Oxumaq? Gözəl arzular?..
Tayımdan, tuşumdan gerimi qalım?
Meylimi mətbəxə, evəmi salım?
Sinəmə sığmayan gözəl duyğular?...

Ağardı Aygünün sifəti dümağ,
Dondu ağ sinəsi dağda qar kimi.
Qələm qaşlarını sıx-sıx çataraq,
Düşündü bir ağır dərdi var kimi.

Ancaq danışmadı, dinmədi yenə,
Qəmli baxışları su kimi axdı.
"Bəlkə öz fikrindən Əmirxan dönə?"
Aygün bu niyyətlə ərinə baxdı...

Ancaq o gözlərdən, o baxışlardan
Axan şeriyyəti duymadı əri.
Aygün bulud kimi tutuldu bir an,
Azacıq islandı sıx kirpikləri...

Əmirxan özü də hiss etdi bunu,
O da fikrə getdi, düşündü bir az;
Görüncə Aygünün tutulduğunu:
– Sevgilim, sevənlər pərişan olmaz!..

Deyərək bir eyham vurdu gəlinə...
Aygün tez ayrıldı düşüncələrdən.
Onun saçlarını oxşayıb hərdən,
Əmirxan eşqdən söz açdı yenə:

– Bu nə eşqdir ki, sən qalasan tək,
Mənim də qəlbimi intizar üzə.
Neçin oturmayaq hər gün üz-üzə,
Beş günlük dünyada dövran sürməyək?

De, niyə tək gedim sənsiz Muğana?
Nə var ki... Məktəb var... Nə bilim nə var...
Sən bu gün qadınsan, sabahsa ana.
Sən kimi düşünsə bütün qadınlar,
Gündə min ev uçar, min ev yıxılar.
Evsiz, ailəsiz məhəbbətmi var?
Nə fikirləşirsən?
                    – Sənin fəlsəfən
Səmimi olsa da,
                    bir az köhnədir.
– De görək, sözünün mənası nədir?
– Tutaq ki, sən deyən tək yaşadım mən,
Tutaq ki, izlədim səni kölgə tək.
Daima dörd divar içində qaldım,
Nə sənət öyrəndim, nə də elm aldım.
Bəs tay-tuş üstümə gülüşməyəcək?
– Gülən güləcəkdir... Cəhənnəmə ki...
– Məncə... başqa şeydir ürəyindəki...
Açıq deməyirsən! –
                    Bu vaxt Əmirxan
Otura bilməyib ayağa durdu,
Tutuldu Aygünün bu sualından,
Bir az gəzinərək yenə oturdu.
O bir də oynadı durduğu yerdən
Aygünün üstünə açıldı birdən:
– Ömrümdə üzümə bir söz gəlməmiş,
Mənim "hə" sözümə "yox" deməmişlər.
Ərköyün yaşardım anam ölməmiş,
Ölərdi mən ona öl desəm əgər...
Çünki o doğrudan sevirdi məni,
Budur, fədakarlıq, əsil bir insan!
İndidən boş qoyub sən öz çənəni,
Mənə yerli-yersiz söz qaytarırsan.

Aygün danışmadı... Alındı, ancaq,
Bir qızartı gəldi yanaqlarına...
O təzə toyludur, həm də utancaq,
Ağır söz gəlməyir dodaqlarına.

Bir də o çox sevir, sevir ərini,
Odur ki, hər zaman söz qaytarmayır.
Əmirxan uzadır dediklərini,
Mətləbi bir yolluq o qurtarmayır:

– Məni doğrudan da sevirsənsə sən,
Öz eşqin uğrunda, qəlbin uğrunda
Nə oddan, nə sudan çəkinməlisən,
Qanuna zidd olan nə var ki, bunda?

Ər harda, arvad da orda olmalı,
Sən özün bunları bir yaxşı düşün –
Nə mənsəb qalacaq, nə dünya malı,
Kişinin şöhrəti namusdur, Aygün!

Aygün ehtiramla gülümsəyərək:
– Əmirxan, sən mənə inanmayırsan?
Bu dediyin nədir, utanmayırsan?
Məncə, öz eşqinə sadiq bir ürək
İllər həsrətilə oda yansa da,
Bir qığılcım kimi alışıb sönməz...
Yalqızlıq qəm ilə alovlansa da,
Eşqindən soyuyub, sözündən dönməz...
Nə olub, bir günlük yoldur ki, Muğan,
Ayda bir dəfə də gələ bilməzsən? –
Aygünün üzündən öpüb Əmirxan:
– Yox, – dedi, – başqa bir təbiətəm mən...
– Necə təbiətsən?
                    – Onda qulaq as:
Ömrümdə mən yalan deməmişəm heç.
Yalan danışanda vicdan da olmaz,
Dost-düşmən yanında xar olar tez-gec...

Səndən nə gizlədim, qısqancam yaman.
Sən məni sevsən də dünyalar qədər,
Yanımda görməsəm səni bircə an,
Gözümün yuxusu çəkilib gedər...

Demirəm böyükdür bu təbiətim,
Bəlkə də, bəlkə də bu bir azardır.
Qəlbinə dəyməsin sözüm, söhbətim,
Səndə məhəbbət də, namus da vardır.

Sənin vəfana da inanıram mən,
Ancaq, nə olsun ki, böyükdür şəhər...
Özün də həddindən artıq gözəlsən...
Didib parçalayar məni şübhələr... –

Aygün eşitdikcə bu etirafı
Ürəyi kövrəldi, yumşaldı bir az.
Qadın mərhəməti, qadın insafı
Qadın inadından heç də az olmaz...

Sonra öz ağlında ölçüb biçdi ki,
Əmirxan doğrudan tək gedə bilməz.
Bir də xəyalından gəlib keçdi ki,
O da Əmirxansız şad olub gülməz.

– Yaxşı, gedək, – deyə dilləndi gəlin,
Döndü Əmirxanın ürəyi dağa.
Qərarı bir oldu sevgililərin,
Sonra öpüşdülər dodaq-dodağa.

Aygün demədisə bir dərdi açıq,
Susdusa qırılmış bir rübab kimi,
O, elmi, məktəbi qoydu yarımçıq
Tamam yazılmamış bir kitab kimi...

## IV

Tarixlər şahidi Muğan düzündə,
Araz kənarında, suyun gözündə
Təzəcə bir sovxoz şəhəri vardır;
Burda üzə gülür təmiz küçələr,

Günəşli gündüzlər, aylı gecələr;
Kölgəli çinarlar qatar-qatardır.

Ortada salınmış böyük bir bağ da
Muğanda birinci Lenin bağıdır.
Baxıb seyr etdiyim o al bayraq da
Leninin müqəddəs al bayrağıdır.

Dalıb düşünürəm bayaqdan bəri
Lenin heykəlinin qarşısında mən.
Elə bil seyr edir Lenin çölləri,
Dünyalar, dünyalar keçir qəlbindən.

O baxır Muğana, göz işlədikcə
Yel əsir, tərpənir gömgöy zəmilər.
Muğanda neçə min əl işlədikcə
Hər gün tez açılır vaxtından səhər...

Hər saat dolanır bir dəqiqə tək,
Səssiz gecələrin ömrü gödəlir...
Hər axşam insanlar işdən dönərək
Lenin heykəlini salama gəlir.

Ey dost, Muğandakı bu xoş baharı
Yaradan insanın mərd əlləridir.
Gecələr alışan yer ulduzları
Atamız Leninin əməlləridir.

Yaxşı bax, nə qədər parlaqdır onlar!
Demə ki, sadəcə bir yaraşıqdır.
Düşün, gör nə böyük bir mənası var –
Bu dünya durduqca Lenin işıqdır.

Hər evdə, hər insan qəlbində yanan
Leninin eşqidir, ölməz adıdır.
Əsrlər keçsə də, Lenin hər zaman
Bəşərin ən böyük istedadıdır.

## V

Sovxoz direktoru oyandı səhər,
Başında fikirlər çıxdı eyvana.
Ayağı altında bu kiçik şəhər,
Baxdı səhra boyu, baxdı hər yana.

Düşündü, düşündü bizim qəhrəman,
Qurduğu şəhərə baxdı vüqarla;
Elə bil nur yağdı baxışlarından,
Sabahı düşündü, o, iftixarla...

Hər ev qabağında kiçik bir bağ da
Yazın oğlan vaxtı gül açdı rəng-rəng
Dünən qamış bitən qara torpaqda
Bu gün şəfəq kimi sayrışdı çiçək.

Hopduqca səhranın gövdəsinə su
Tərlədi qaxsımış bir bədən kimi...
Yerdə çiçək açdı yerin arzusu,
Sevindin, oxucum, sən də mən kimi.

Gürzələr, şahmarlar Araz boyunca
Paslı qılınc kimi çəkildi qına.
Yaşıl məxmər kimi döşəndi yonca
Vətən qızlarının ayaq altına.

Muğanda qarağat, yovşan yerinə
Çinarlar boy atdı cərgələnərək;
Ağaclar bənzədi bir-birinə
Bir ana südünün övladları tək.

Sabahı seyr etdi öz nəzərilə,
Bir anda fikrindən yüz illər keçdi;
Bu kiçik şəhərin küçələrilə
Nəsillər dalınca nəsillər keçdi...

Mən bu qəhrəmanı neçə il qabaq
Cəbhədə görmüşdüm bir axşam üstü;

Uçurdu göylərdə parçalanaraq,
Topların ağzından yayılan tüstü.
Şimaldan bir soyuq külək əsirdə,
Ayaz xəncər kimi yeri kəsirdi.

Hücuma keçmişdi o gün ordumuz
Ölən düşmənlərin meyiti üstdən.
Qulaq tutulurdu cəbhədə səsdən.
Ancaq, sevinirdi ana yurdumuz –
Ordumuz hər yandan atəş açırdı,
Alman saldatları geri qaçırdı.

Göy darısqal idi, üfüqlər qara,
Kainat cırırdı dar paltarını...
Bu məşhur topçu da öz toplarını
Atıb yol açırdı piyadalara.
Onun səngəriydi xırdaca bir dağ,
Ayağı altında bərk idi torpaq...

İndi nə top atır, nə düşmən vurur,
Hələlik susmuşdur topların səsi.
Divardan asılı yadigar durur
O topçu zabitin cib xəritəsi...
Bəzən cizgilərə nəzər yetirir,
Keçdiyi yolları yada gətirir.

* * *

Bayaq söylədiyim kiçik şəhərdə
İndi bu qəhrəman bir sovxoz qurur.
Çox zaman yatmayır o gecələr də,
Hər bağa, zəmiyə keşikçi durur.

Üzündə bir çapıq yeri də vardır –
Döyüş günlərindən bir yadigardır.
Xeyirxah, sadə bir təbiəti var,
Nə artıq pul sevir, nə də təmtəraq.
Gileysiz danışır ondan insanlar
Hər vaxt yaxşılıqla xatırlayaraq.

Həyatdır... Onun da dolanacağı,
Vaxt olur aşağı düşür, neyləmək?
Bəzən bahar vaxtı, ya da şam çağı
Yediyi sadəcə pendirlə çörək
Şirin bir nemət tək ona dad verir,
Şair bu insana Nemət ad verir...

Pul oldu-olmadı daima şaddır,
Evdə oturmayır o, qaşqabaqla.
Bütün ailəsi qəmdən azaddır,
Yaşayır hər zaman bu qanacaqla.
Qəlbində daima gülər bir bahar,
Dərdi də bir gülər üzlə qarşılar.

[Kimin ki, əməli safdır ürəkdə,
Ehtiyac içinə düşsə də, hərdən,
Yediyi quruca pendir-çörək də
Söz açar müqəddəs düşüncələrdən...
Baxıb başqasına həsəd də çəkməz,
Öz vicdan evindən bir daş da sökməz...

O, işıqda gəzər, yaşar vüqarla,
Qaranlıq yollardan əyilib keçməz...
Dözər aclığa da bir iftixarla,
Bir fincan suyu da gizlində içməz...
Hər yerdə, hər zaman şax baxar üzə,
İnsanlıq şərəfi öyrədər bizə!..]

**VI**

O il qış bərk gəldi Muğan çölünə,
Sel kimi töküldü göydən yağışlar.
Pul-pul səpələnmiş yağış gölünə
Gəldi qoşun-qoşun köçəri quşlar.

Palçıq dizə çıxdı, sərt əsdi külək,
Soyuqdan bozardı qızların üzü.

Tənbəllər yığışıb nağıl deyərək
Söhbətlə keçirdi gecə-gündüzü.

Yağışın dalınca bərk gəldi qar da,
Odundan kasadlıq çəkdi ocaqlar.
Neçə min ildir ki, bu səhralarda
Nə qalın meşələr, nə zolaqlar var.

Yalnız Araz üstə bir az meşə var,
Orda da ağaclar hələ seyrəkdir.
Çoxu söyüdlərdir, bir də ulğunlar;
Palıd da, çinar da orda tək-təkdir.

O il öz ömrünü çox uzatdı qış,
Ağardıb dişini güldü insana.
Hər səhər obaşdan don açılmamış
Maşınlar zor ilə çıxdı Muğana.

Ağ kəfən geyindi düzlər, yamaclar,
Nə bir ot göründü, nə də bir yarpaq;
Ac qalıb qırıldı körpə turaclar,
Nə qədər nemətlər itirdi torpaq...

Dondu gölməçələr, qamışlıqlar da,
Köçəri quşlar da uçub dağıldı.
Araz boyundakı şor qışlaqlarda
Doyunca nə qoyun, nə mal sağıldı.

Çayların üstündən buz körpü saldı,
Seyrəldi get-gedə gediş-gəliş də.
Könül intizarda, göz yolda qaldı,
Uçdu dodaqlardan, uçdu gülüş də...

Ürəklərdə qorxu, gözlərdə heyrət,
İnsanlar qaşını çatdı hiddətlə.
Yumub gözlərini o kor təbiət
Döydü yeri, göyü, döydü şiddətlə.

O qədər atını çapdı ruzgar ki.
Qurdlar da ulaşdı çöldə səs-səsə.
Muğanda nə bir dağ, nə meşə var ki,
Əsən küləklərin önünü kəsə...

Qum təpəsi kimi yeridikcə qar
Buludlar kişnədi, göylər ağladı.
Bəzən qar altında qaldı ağaclar,
Qurumuş budaqlar sırsır bağladı.

– Budur, yaxşı baxın! – deyərək Nemət.
Boranı göstərdi qəhrəmanlara.
– Baxın, divan tutur bizə təbiət,
Acımaq bilməyir o, insanlara!

Bu gün əkdiyimiz bu qatar-qatar
Ağaclar bir zaman orman olacaq.
Qopsa da tufanlar, sərt fırtınalar
Nə ot saralacaq, nə gül solacaq.

Araz donmayacaq, buğ gəmiləri
Üzəcək su üstdə sonalar kimi.
Şaxta vurmayacaq göy zəmiləri,
Qış gəlib keçəcək bir bahar kimi.

Gəlin, sinəmizlə qoruyaq gərək
Körpə zolaqları qardan, küləkdən.
Maşınlar yeridi hücum çəkərək,
Əllər də yapışdı beldən, kürəkdən.

Dəli qış getdikcə tufan qopardı,
Yeməyi, yatmağı Nemət unutdu.
Kimini iş üstə zorla apardı,
Kimini yalvarıb xoş dilə tutdu.

Qırov səpələndi çölə, yamaca,
Göylərdə buz kimi dondu ulduzlar.
Gecələr yatmayıb, hər bir ağaca
İsti paltar tikdi gəlinlər, qızlar.

Çöldə yapıncılı adamlar kimi
Göründü ağaclar ay işığında.
Onlar düşündü də fikri var kimi
Aylı gecələrin yaraşığında...

Buğlana-buğlana nəhəng maşınlar
Qar təpələrinə hücum çəkdi, bax!..
Basılmış ordu tək çəkildi ruzgar,
İnsana qovuşdu yenə də torpaq...

Keçdi o fırtına, keçdi o şiddət,
Hər ürək şad oldu öz əməlilə.
Neçə qəhrəmanın əksini Nemət
Şərəf lövhəsindən asdı əlilə.

## VII

Nə qədər ki, hava Muğanda xoşdur,
Hələ solmamışdır gül də, çiçək də,
Hər yaşıl zəmi də, göy biçənək də,
Bir vaxt Əmirxanın qəlbi də coşdu.

Quba bağlarından şitillər alıb,
Alma da, armud da, ərik də əkdi.
Bir zaman, onların qeydinə qalıb,
Bağlara hər səhər o, baş da çəkdi.

Torpağın nəbzinə, suyun səsinə
O qulaq asdıqca ilham alardı.
Saldığı bağların səliqəsinə
Aygün də heyrətlə valeh olardı.

Onda bir danışıq gücü də vardı,
Buz kimi saxlardı ancaq qəlbini.
Hər zaman hər yerdə müsahibini
Soyuq bir məntiqlə inandırardı.

Bir müddət Aygünlə o, səhər-səhər
Zövq aldı çöllərin mənzərəsindən:
Ömrü gödək olan bu xatirələr
Tez uçdu, tez getdi hafizəsindən.

Elə ki, əsnədi çovğunla külək,
Çöldə tar bağlayıb, qar çıxdı dizə,
Şaxta ata mindi qılınc çəkərək,
Təbiət insanla durdu üz-üzə.

Əmirxan bağladı pəncərələri,
Yalnız istisini Aygündən aldı.
Bir yeni həsrətlə andı şəhəri,
Tez-tez fikrə gedib xəyala daldı.

Keçdi gözlərindən keflər, məclislər,
Böyük teatrlar, böyük kinolar.
Dil açdı qəlbində acıqlı hisslər...
– Eh, – dedi, – bilmirəm bu çöldə nə var?!

Elə vaxt oldu ki, tamam bir həftə
Ayaq da basmadı evdən eşiyə.
Yediyi çörəyi yedikcə müftə,
Bəhanə gətirdi "xəstəyəm" deyə.

Arabir vicdanın qadir səsindən
Diksinib oyandı... Çıxdı iş üstə.
Onun bu ötərgi zümzüməsindən
Yarana bilmədi böyük bir nəğmə...

Elə ki, dörd divar canını sıxdı,
Qış günəşi kimi göründü tək-tək,
Kürən bir yabının üstə minərək
O da sahələri gəzməyə çıxdı.

Düşündü: "Mən hara, bu çöllər hara?"
Lovğalıq qurd kimi gəzdi başında;
Odur ki, verdiyi tapşırıqlara
Atüstü qol çəkdi yəhər qaşında...

Bir para xudpəsənd insanlar kimi
O da çoxlarını heç bəyənmədi;
Əmirxan hərcayi dumanlar kimi
Göydə dayanmadı, yerə enmədi...

## VIII

Gəl, ey nazlı bahar, gecikmə, tez gəl!
Gəl ki, qışın ömrü çox uzanmasın.
Mən sənin dostunam hamıdan əvvəl,
Gəl ki, həsrətinlə ürək yanmasın.

Qış çox ağır keçdi Muğanda bu il,
Qorxudan saraldı tarlalar xeyli.
Bahar, dostluğumuz ötərgi deyil,
Şirindir yaşamaq, yaratmaq meyli.

Gəl, yenə görüşüb əl-ələ verək,
Bizdən nəfəs alsın bağça da, bağ da.
Gəl ki, şeir yazaq, çörək yetirək,
Şad olsun anamız qara torpaq da.

* * *

Öz kəhər atının üstündə bahar
Bir qəhrəman kimi gəlmiş Muğana;
İnsana gəl deyir yenə səhralar,
Günəş salam verir hər qəhrəmana.

Baxıb üzə gülür gömgöy zəmilər,
Gül gülü çağırır, çiçək çiçəyi.
Narın yağışlar da hər axşam-səhər
Gah bağı isladır, gah biçənəyi.

Ömründən pay verir gecə gündüzə,
Günlər uzandıqca uzanır iş də.
Maşınlar, insanlar dağılır düzə,
Çoxalır səhrada gediş-gəliş də.

Od-alov nəfəsli, çarxlı nəhənglər
Yüz çuxur doldurur, təpə düzləyir.
Belləri bərk vuran qollar, biləklər
Sulara yol açır, arx təmizləyir.

Hələ qoşun-qoşun cərgələnərək
Dayanmış yamyaşıl ağaclara, bax.
Mənim dastanımın sətirləri tək,
Nə qədər baxsan da qurtarmayacaq...

**IX**

Aygün də zövq alıb bu xoş bahardan,
Səhərlər yuxudan quş kimi durdu.
Keçdi dəniz kimi göy tarlalardan,
Bəzən gün altında kətmən də vurdu.

Muğan qızlarına qoşulub o da
Başına bir güllü yaylıq bağladı.
Bu hal bir ötərgi həvəs olsa da,
Qəlbində arzular coşub çağladı.

O hərdən dayanıb durduqca təkcə,
Üzündən-gözündən nur tökülərdi.
Kətmən əllərində, fikrə getdikcə
Qızlar xısın-xısın baxıb gülərdi.

Ancaq ayrılmayıb düşüncələrdən,
Dinlərdi çöllərin həyat səsini.
Qəlbində bir nəğmə yaradıb hərdən,
Səssiz oxuyardı öz nəğməsini.

Sonrasa qarışıb yenə qızlara,
Hər gün oxudardı öz əsərini.
Küləklər yayardı geniş düzlərə,
Muğan qızlarının şərqilərini.

Mən bu sətirləri yazdığım zaman
Aybəniz yanımda xəyala vardı.
Mənalar süzüldü baxışlarından,
Hələ gözləri də bir az yaşardı.

Sinəmdə dil açıb danışdı ilham:
Ömrümdə ən əziz bir gün olaydı –
Mənim Aybənizim, mənim qız balam
Hünərdə, namusda Aygün olaydı.

**X**

O il Əmirxanın sahələrində
Bağlar öz vaxtında çiçək açmadı.
O niyə mıxlanıb qaldı yerində,
Gözünün yuxusu niyə qaçmadı?

Bir çox ağacları don vurdu o il,
Salamat çıxmadı qışdan bahara
Ağac da dünyada duyğusuz deyil,
O da nemət verir çalışanlara.

Kim ki, iş üstündə ürək əridir
Gülşənə döndərir bomboz çölləri.
Burda ağıllı bir sözün yeridir.
Daşda çiçək açar insan hünəri.

Gül-çiçək açmayan öz qüdrətinə
Əmirxan yandısa, çox da yanmadı.
Ancaq başqasının iş şöhrətinə
Düzünü söyləsək, paxıllanmadı.

**XI**

Qürbət kimi görünsə də Aygünə Muğan,
El içində yaşayardı el adətilə...
Şövqə gəlib insanların xoş rəftarından
Uşaq kimi sevinərdi səadətilə.

Yel əsəndə, qar yağanda, şaxta düşəndə
İstisini Əmirxandan alardı gəlin.
Bəzən onlar cüt danışıb, cüt gülüşəndə
Yaşamağa haqqı vardı o gülüşlərin...

Ancaq Aygün tamam-kamal bitirmədiyi
Öz musiqi məktəbini hərdən anardı.
Özü kimi boya-başa yetirmədiyi
Sənətini düşündükcə qəlbi yanardı.

Əmirxanın qısqanc olan təbiətini
Bildiyindən söz açmadı Aygün bu haqda.
Öz eşqinə qurban verdi öz sənətini,
Bu xüsusda biz haqq verib, haqq almasaq da...

Daş-qaşa da, ziynətə də uydu bir zaman,
– Əmirxanın səxavətli əli var, – dedi;
Dönə-dönə qulağına onun Əmirxan:
– Üzük qaşla, arvad ərlə tanınar, – dedi...

Oğul fikri, qız arzusu, qoşa qarımaq
Xəyalından çıxmayırdı o xoşbaxtların.
Yaxşısa da hər muraddan doyub yarımaq,
Bəzən ömrü gödək olur gözəl vaxtların.

## XII

Keçdi günlər... Fikirlidir bu gün Əmirxan,
Bir kül kimi bozarmışdır onun üzü də.
Elə bil ki, bulud yağır qaş-qabağından,
Boğazında kilidlənmiş ürək sözü də...

O özünün taqsırını duyur dərindən,
Ancaq açıb-ağartmayır Aygünə bunu.
İncimişdir o, Nemətin sərt sözlərindən,
Biz bilirik Əmirxanın tərs olduğunu.

Öz sirrini yoldaşına açıb deməyi
Öz kişilik vüqarına sığışdırmayır;
Bir tənhalıq keçirdikcə onun ürəyi
Hey döyünür, sinəsində sakit durmayır.

Hələ onun gözlərinin önündə Nemət
Hakim kimi çıxardığı hökm ilə durur.
Hələ iclas, hələ tənqid, o rəsmi töhmət...
Əmirxanın qəlbi hələ şiddətlə vurur...

"Necə... Onun mənliyinə dəymək olarmı?
Təhsili var, diplomu var, kişi "alimdir";
Hər şeyi də şişirtməyin mənası varmı?
İş üstündə səhvi, suçu olmayan kimdir?..

Ali məktəb qapısından keçməyənlər də
Əmirxana dərs öyrədir... Sən işə bir bax!
Hələ qışlaq yerlərindən köçməyənlər də,
Aqranomla üzə durub söz qaytaracaq!.."

Lovğa-lovğa düşündükcə bunları bir-bir
Gövdəsinə bumbuz olmuş bir tər də gəlir.
Öz kinindən ürəyini qurd kimi didir,
Nə bir yerdə qərar tutur, nə də dincəlir.

(Nə zaman ki, el içində öz səhvimizi
Boynumuza götürməyə biz qısqanırıq;
Xudpəsəndlik kölgə kimi izləyir bizi,
Ən xırdaca nöqsanı da bəzən danırıq.

Nə zaman ki, gözümüzdə tiri görməyib,
Başqasının gözlərində qılı seçirik.
Bizi tənqid edənlərə salam verməyib,
Yanlarından saymazyana gəlib keçirik.

Sinəmizdə yetim kimi ürək tək qalır,
Xəyalımız səssiz keçir səhralar kimi;
Elə bil ki, içimizdə güllər saralır.
Gün altında əriyirik dağda qar kimi.

Nə zaman ki, suçumuzu mərd-mərdanə
Boynumuza götürürük, hamı şad olur.
Çox sevinir Vətən adlı müqəddəs ana,
Fənalığın pəncəsindən qəlb azad olur.

Salamlayır bizi yenə el alqışları,
Tənhalıqdan ayrılaraq ürək də gülür.
Nələr deyir, dinməsə də dost baxışları,
Elə bil ki, üstümüzdən dağ götürülür...

Elə bil ki, qamışlıqda azıb yol gəzən
Yorğun ovçu göy çəmənli bir düzə gəlir.
Elə bil ki, bu dünyaya baxıb yenidən
İnsan ilə, günəş ilə üz-üzə gəlir.

Ürəyində çağladıqca yenə saf sular
O sevinir, o fəxr edir insanam deyə.
Onu qartal qanadına alıb arzular
El içində, yer üstündə qaldırır göyə...)

* * *

Əmirxansa yuxarıdan baxdı hər kəsə,
İş üstündə Fərhad kimi külüng çalmadı;
Qəhrəmanlar dünyasilə verib səs-səsə,
Başqasının hünərindən ilham almadı.

Alışmadı, zəhmətin şeriyyətinə,
Nə yoruldu, nə də şirin bir yuxu yatdı.
Bir də özü inanmadı öz qüdrətinə,
Başladığı hər bir işi yarımçıq atdı.

İş üstündə çətinliyə düşdüyü zaman
Nə kitabdan, nə insandan kömək istədi.
Özü lovğa, biliyi az, hövsələsi dar,
– Mən heç kəsin ayağına getmərəm, – dedi.

(Xudpəsəndlik çoxlarını yıxır, ey insan!
Bu dərd ilə tez qocalır bəzən ürəklər.
Dağ olsan da sən dağlara arxalanmasan,
Parça-parça sovuracaq səni küləklər!..)

– Bu sənətdən bir kar aşmaz, – dedi Aygünə, –
Gedək, gedək, tez qayıdaq bircə şəhərə.
Yenə Bakı tez çıxardar bizi ağ günə,
Mədəniyyət gəlməmişdir hələ kəndlərə.

Aygünün də ürəyindən oldu bu xəbər,
Kənd yerinə gec alışır şəhər qızları.
Ərlə arvad qərar verib, "gedək" dedilər;
Bir az sonra başa gəldi bu arzuları.

* * *

Əmirxanı qayəsizlik yerdən qopardı,
Aqronomluq sənətinə getmədi daha.
Öz ömrünü qurban verib nəfsə, iştaha,
Öz qəlbini zülmətlərə çəkib apardı.

O dedi ki: – Mən nə dahi, nə qəhrəmanam,
Qoy bəşərin dərdlərini onlar düşünsün.
Məni adi bir insancıq doğmuşdur anam
Ki, dünyada dövran sürüb, kef çəkim beş gün.

O dedi ki: – Bu dünyaya yoxdur etibar,
Beşcə günün qonağıyıq bu aləmdə biz.
Həyatın da, ölümün də öz növbəsi var,
Torpaq altda çürüyəcək sümüklərimiz...

Neçə yerdə neçə növbə "xidmət" elədi,
Məqsədə yox, qazanclara getdi apaçıq.
– Eh, bu nədir, hər bir işin alayarımçıq –
Deyib bəzən Aygün ona töhmət elədi.

Pul azarı hörümçək tək torlar toxuyub,
Soxulmuşdur bir çoxunun təbiətinə.
Əmirxan da nəfsə uyub, iştaha uyub,
Qayıtmadı, qayıtmadı öz sənətinə.

Sözün düzü, Əmirxanı mən çox izlədim,
Bir iş üstə dayanmadı, bircə ilsə də.
Zənn etmə ki, o surəti örtüb gizlədim,
Surət nədir, hünər deyil, iş deyilsə də?

Bəlkə bir gün göstərəcək öz simasını
İllər boyu can qoyduğu bir iş üstündə.
Mən də görüb yazacağam o xoşbəxt gündə
Onun əsl varlığını, düz mənasını.

O özü də, heç özü də bilməyir hələ,
Bilməyir ki, təbiəti yazdır, ya qışdır.
Mən get-gedə görünürəm, o gələ-gələ,
Bilirəm ki, bu axtarış düz axtarışdır...

## XIII

Radionu qurdu Aygün bir səhər çağı
Qulaq asdı konsert verən yoldaşlarına.
Gah qaraldı ağ sifəti bulud sayağı,
Gah sevindi tələbəlik sirdaşlarına

Danışdıqca pianonun sədəf dilləri,
De, Aygünün qəlbi nədən şiddətlə vurdu?
Şəfiqənin şam barmaqlı nazik əlləri
Şəkil kimi gözlərinin önündə durdu.

– Mən hər zaman "beş" alardım ixtisasımdan,
Şəfiqəsə "dörd" alardı, indi ona bax;
Vurğulara məna verir qız zaman-zaman...
Tay-tuşundan geri qalan bir mənəm, ancaq.

Gülzarın da fleytası yayılır cana,
Rəfiqənin sinəsində şura gəlir tar;
İnsan əli yüz dil verir neyə, kamana
Danışansa ürəklərdir, bir də arzular.

Hələ Elyar... hələ onun bariton səsi
Gurladıqca meydan açır, zəfərlər deyə.
Trambonla valtornanın güclü nəfəsi
Ordu kimi hücum çəkir mübarizəyə.

Ərğənun da ağır-ağır arabir dinir,
Dünya görmüş, zaman görmüş qocalar kimi.
Torpaq olmuş babalar da sanki sevinir,
Onların da bu sənətdə haqqı var kimi.

Aygün dönüb Əmirxana deyinir bu dəm:
– Eşidirsən? Tay-tuşlarım verib səs-səsə,
Hey çalırlar, oxuyurlar nəfəs-nəfəsə;
Mənsə baxıb ürəyimdə həsəd çəkirəm.
– Fikrin nədir?
          – Oxumaqdır!
                    – Harda oxumaq?
– Necə harda? Sən ki, bunu yaxşı bilirsən!
Bəstəkarlıq işinədir həvəsim, ancaq.
De, gülməli nə vardır ki, niyə gülürsən?
– Gülürəm ki, çox qəribə iştahın vardır,
Yer üzündə hansı qadın, de, bəstəkardır?
– Bəstəkar da, filosof da olur qadınlar,
Kişilərdən heç də geri deyildir onlar.
– Qadın gərək öz evinin səliqəsilə,
Öz ərinin, övladının xoş nəfəsilə
Ömür sürüb xoşbəxt ola, nə ki, səhnədən
Rast oxuya, min adamın üzünə gülə,
Ər də baxıb arvadına, əti tökülə...
Yox, sən deyən kişilərdən olammaram mən –
Aygün dönüb körpəsinin üzünə baxdı.
O dinməzdi, danışmazdı hirslənən vaxtı...

* * *

Ancaq Aygün qılınc kimi girmədi qına,
Fürsət tapıb məktəbə də getdi bir səhər.
Ürək açdı öz səmimi yoldaşlarına,
Çox sevindi müəllimlər, müəllimələr.

Dedilər ki, sənin gözəl istedadın var,
Gec deyildir, qayıt yenə, məktəbinə gəl,
Paslanmasın qəlbindəki gözəl duyğular,
Sənin kimi qızları biz gəzirik el-el.

## XIV

Pianomu səsə gəldi? Şirmayı dillər
Danışdıqca elə bil ki, dalğalar axdı.
Yelpazə tək qanad çalan göyərçin əllər
Səadətdən söhbət açdı bir axşam vaxtı.

Öz qəlbinin rübabını dindirən gəlin
Bəzən yumub gözlərini xəyala getdi.
O qərq oldu dünyasına düşüncələrin,
Al şəfəqli bir aləmi tərənnüm etdi.

Qonum-qonşu səs eşidib çıxdı eyvana,
Hörmət ilə qulaq asdı o saf sənətə.
Öz ömrünün dastanını açdıqca ana
Neçə ürək salam verdi o şeriyyətə...

Bəzən asta bir ney kimi süzülüb axdı,
Dilə gəldi nəvazişlə, mehri-ülfətlə.
Arabir də şimşək olub göylərdə çaxdı,
Buludları parçalayıb keçdi sürətlə.

İki saat, bəlkə də çox, qalxmadı gəlin,
Pianodan ayrılmadı onun əlləri.
Məhəbbətin, səadətin saf əməlləri.
Gözlərindən aşıb-daşdı o xoş xilqətin...

Əmirxan da qulaq asdı Aygünə bir az,
Yazıqlar ki, o sənəti duymadı bir an.
Xəyalında bir restoran, bir rəqs, bir də caz...
O, fışqırıq çala-çala çıxdı qapıdan.

(Yüngül başlı, boş ürəkli insanlar da var,
Biganədir ana yurdun öz sənətinə.
Fokstrot rəqslərindən zövq alır onlar,
Uyuşmayır öz yurdunun təbiətinə.)

Əmirxanın getməyini duymadı gəlin,
Ayrılmadı öz qəlbindən, öz dünyasından.
Çal, gözəlim! Yorulmasın çalan əllərin,
Nəğmələr de məhəbbətin saf mənasından!

## XV

Qış gecəsi uzun olur... Yenə də səhər
Gecikmişdir gözlənilən bir qonaq kimi.
Görünməmiş bir sükuta qərq olmuş şəhər
Dörd tərəfdən qıfıllanmış bir otaq kimi.

Hamı yatır öz evində, öz yatağında;
Qış yuxusu ölüm kimi çox ağır keçirə...
(Ağırlaşır ömrün, günün axır çağında
Son arzular, son xəyallar, son düşüncələr...)

Hamı yatır. Xeyr, xeyr! Bu deyil gerçək,
Bəzən olur şirin yuxu yatmayanlar da...
Odur, odur! Bir pəncərə arxasında tək
Dayanmış bir gəlin qəlbi çırpınır, darda...

Gəlin yalqız, otaq səssiz, hava darısqal,
O, başını söykəməyir yastığa bir an;
Bəzən gəlir gözlərinə yüz qara xəyal...
Dalğa-dalğa qəm tökülür baxışlarından.

(Kim bilməyir bu aləmdə nədir intizar?
Ürək üzər, can əridər nigarançılıq.
Bir ürəkdə qıfıllanıb qalsa arzular
Şamlar kimi şölə çəkib yanar apaçıq.)

Aygün açır pəncərəni, baxır küçəyə,
Quldur kimi qılınc çəkib soxulur külək;
Sərt ruzgarın dəhşətindən vəhmələnərək,
Pəncərəni tez-tələsik bağlayır yenə.

Ancaq yenə gözü, qəlbi yollarda qalır,
Öz-özünə deyindikcə kövrəlir səsi.
Xəzan vurmuş yarpaq kimi rəngi saralır,
Aman, deyir, nə uzunmuş bu qış gecəsi!

(İnsan oğlu səadətlə ömür sürəndə
Bir an kimi gəlib keçər onun hər günü.
Ya intizar, ya ayrılıq, ya dərd görəndə
Bir il sanar bir anın da gödək ömrünü...)

Əmirxansa məclisdədir... Qızmış beyinlər
Etibardan, səadətdən söz açır bu dəm.
Soruşmayın orda nə var, heyifdir əsər,
Mən o çirkin səhnəciyi təsvir etmirəm...

Aygün yenə intizarla çıxır eyvana,
Ağlına da gətirməyir o mənzərəni.
Öz müqəddəs ürəyilə yaşayan ana
Gah qapını açır yenə, gah pəncərəni...

* * *

Hüdudu var hər ağrının, hər işgəncənin;
Külək yatır, qar dayanır, açılır səhər.
Səhər ilə bir açılır sirri gecənin,
Qapı-qapı yer axtarır təzə xəbərlər...

Zəng çalınır. Gəlin qalxır qapını açır,
Zümzüməylə girir evə “əhli-kef” əri,

Ayaqları bir-birinə dəyib dolaşır,
Qan sığılıb, qızarmışdır iri gözləri...

Bət-bənizi meyit kimi ağarmış onun,
Nəfəsindən getməmişdir şərab qoxusu.
O məclislər aşiqinin, keflər oğlunun
Nə vaxtında yeməyi var, nə də yuxusu.

Çarpayıya ağzı üstə o döşənərək,
Xorna çəkir bütün günü axşama qədər.
Gəlininsə sinəsində çırpınır ürək,
Gözlərində yuva salır yenə də qəmlər.[125]

Aygün alıb çağasını bağrına basır,
Analara təsəllidir dar gündə övlad;
Uşaqcığın nəfəsinə o qulaq asır,
Bu mənaya səcdə qılır bütün kainat...

Uşaq açır gözlərini gülümsəyərək,
Sifətində nur saçılır ana qəlbinə.
Aygün bir an dərdlərini unudur, gerçək,
O xoşbaxtdır, qəm-qüssədən azaddır yenə.

Yazıqlar ki, çox sürməyir bu bəxtiyarlıq,
Rəngi dönüb bulud kimi birdən qaralır.
Xəzan kimi yarpaq tökür gözündə varlıq,
Bu vaxt onun sifəti də solub saralır:

– Etibarsız!.. Mən yanıram səhərə qədər,
Osa içib nəşələnir evindən uzaq.
Mənim cavan ürəyimi əridir qəmlər,
O kef çəkir, məndən ayrı məclis quraraq.

Bu qayğılar, bu fikirlər üzür gəlini,
Elə bil ki, ürək uçub canı tərk edir.
Çağasının başı altda qoyub əlini,
O, fikirlər dünyasında yuxuya gedir.

Ancaq onun bu ötərgi yuxusu belə
Bir quşcuğun yuxusu tək sayıq keçir, bax!
O, yatmamış bircə saat fikirlərilə
Yorğanını üstdən atır, birdən qalxaraq.

Gözlərinə işıq gəlir onun bir anlıq,
Dağlar kimi baş qaldırır qəlbində vüqar...
Sönüb gedir gözündəki alaqaranlıq,
Ürəyində dilə gəlir susmuş duyğular:

– Xeyr! Xeyr! Məhəbbətlə oynamaq olmaz!
Halal deyil Əmirxana mənim ismətim.
Deyirdim ki, məhəbbətin mənası solmaz,
Ah, budurmu ilk taleyim, əzəl qismətim?

Vədə verir, and da içir, sonra unudur,
İllər keçir... Məclislərdir onu azdıran.
Mənim cavan ürəyimsə qızıl qan udur,
Nə yazan var bu dərdimi, nə də yazdıran.

Bəsdir! Baxa bilməyirəm artıq üzünə,
Öz evinə isnişməsə bir insan kimi,
Elə bu gün, o yuxudan ayılan kimi
Bütün ürək sözlərimi deyib özünə,
Baş götürüb getməliyəm! –
Aygünün bu an
Ürəyində dilə gəlir xeyirxah bir səs:
"Sən haqlı da olsan əgər, azacıq dayan,
Aqil olan son sözünü qabaqca deməz...
Sən anasan, anaların səbri çox olar,
Birdən-birə köpüklənib yalnız sel daşar.
Bil ki, səbrin övladıdır hər böyük qərar,
Ədalətli qanunların hökmü çox yaşar.

Yaxşı düşün neyləyirsən... Yüz ölçüb bir biç!
Sorğu-sual eyləməmiş məhkəmə qurma!
Uşağının xatirinə günahından keç,
Öz əlinlə öz evini yıxıb uçurma!..

Bir də... O da bir insandır, bəlkə düzəldi,
Bəlkə yenə doğruluğun yoluna gəldi".

Düşündükcə o el qızı bunları bir-bir,
İlk baharın laləsi tək rəngi açılır.
Xəyalına xoşbaxt keçən günlər gətirir,
Can evinə günəş doğur, şəfəq saçılır...

**XVI**

Axşam oldu, yuxusunu aldı Əmirxan,
Elə bil ki, bu dünyaya gəldi yenidən.
O, gərnəşib öz yerindən qalxdığı zaman
Zora düşdü yeyib içmiş, ağır bir bədən.

Aygün deyir: "Gör nə qədər dəyişmiş, aman!..
Şümşad kimi bir gənc idi, o, üç il qabaq.
Ayırsaydım onu bircə qayğısızlıqdan,
Yoxsa yazıq bu gedişlə səfil olacaq..."

(Gözəl qadın! Nə xeyirxah bir ürəyin var,
Bu hissini duyacaqmı ürəkdən ərin?
Gözündəmi qalacaqdır bu xoş arzular,
Daşlaramı dəyəcəkdir yoxsa sözlərin?)

– Nə var yenə? Qaş-qabağın yerlə sürünür!
Yetimlərin başdan aşıb, ya ölənin var?
– Xeyr, sənin gözlərinə elə görünür,
Çırtıq vurub oynamaz ki, "xoşbaxt" olanlar...

– Kinayəylə danışırsan! Kimdən əskiksən?
De, çörəyin yetişməyir, yoxsa paltarın?
Beş kişinin qazancını qazanıram mən,
Bir üzü də nankorluqdur siz qadınların!

Bir ildırım kimi vurur Aygünü bu söz,
Qəzəbindən yanaqları od tutub yanır.
Ürəyinin yaraları açılır köz-köz,
Ancaq cavab qaytarmayıb yenə dayanır.

– Bilirsənmi nə var, aşna? Açıq danışaq!
Mən kişiyəm gəzəcəyəm istədiyim tək.
İndən belə bu qaşqabaq tökməyi burax,
Qoy dolanaq, baş girləyək, yaxamdan əl çək! –

Gəlin artıq tablamayır... Açılır birdən,
(Qayaları dəlib keçər yığışan bir su...
Qılıncdan da kəskin olur bir ipək bəzən,
Təbiətin qəhrəmanlıq sifətidir bu.)

– Əvvəl, mənə aşna demə! Bir anayam mən!
Bizim evə yaraşmayır bu küçə sözü;
Bir də çalış, gəl əl götür bu vərdişindən,
Öz evini yıxar yalnız insanın özü...

– Hansı vərdiş? Nə olub ki? Oğruyam, nəyəm?
Ya da məndən böyüklərə yaltaqlanıram?
– Məni məcbur eləmə ki, hər şeyi deyəm
Mən özümə... bu uşağa... sənə yanıram...
– Nahaq yerə!
              – Necə nahaq? Necə yanmayım?
Axı düşün, sən atasan, öz qədrini bil.
Söylə, necə mən od tutub alovlanmayım,
Mənim ərim öz evinin sahibi deyil.

Yaxşı, kimdir bizim evin sahibi, balam?
– Sahib mənəm, bir çağadır, bir də dörd divar...
Rəvamıdır gecə-gündüz mən yalqız qalam?
Harda qaldı bəs məhəbbət? Bəs hanı ilqar?

Çörəyi də, paltarı da başıma vurma,
Mənim dərdim bu dərdlərdən daha böyükdür.
Eşqimizin sarayını yıxıb uçurma,
Hər minnətin, hər sözün də boynumda yükdür.

Yalnız sənin xatirinə evdə oturdum,
Tay-tuşumun hər birisi bir sənətkardır;
Sənin bu dörd divarına keşikçi oldum,
Nə özümə, nə vətənə bir xeyrim vardır... –

Niyə susub dinməyirsən, “əhli-kef” oğlan?
Xəncər olub qəlbinəmi batır o sözlər?
Lal deyildir bu dünyada hər qadın olan,
Vüqarından yaşarmışdır o şəhla gözlər...

Görürsənmi? O qarşında bir çinar kimi
Dayanmışdır, saf alnında bir aydın vüqar.
Ucalıqda qanad çalar arzular kimi
Ürəyi də, vicdanı da təmiz olanlar...

Sözün düzü, Əmirxanın ürəyinə də
Məhəbbətin, nəzakətin şöləsi düşür.
Sönüb getmiş xatirinə onun yenə də
İlk günlərin, ilk ayların nəşəsi düşür.

O ayılır öz fikrində əyləncələrdən,
Öz evinin istisilə qızınır bu an.
Ancaq gəlin ayrılmayır düşüncələrdən,
Taqsırını öz boynuna alır Əmirxan.

– Yaxşı, yaxşı, qəzəblənmə, günahkar mənəm,
Bir də evə gecikmərəm, lap arxayın ol!
Daha səndən bir addım da uzaq getmərəm,
Doğrudan da xatalıdır düşdüyüm bu yol...

Qucaqlayır o gəlinin boynunu bu dəm,
Gah üzündən öpür onun, gah da əlindən;
Aygününsə gözlərindən uçub gedir qəm,
Sözə gəlib barışmaq da xoş olur bəzən.

Aygün susur, danışmayır, üzündə, ancaq
Görünməyir o bayaqkı qəzəbi, kini.
Üzün-gözün təsvirləri yaşamayacaq,
Şerə düzək o gözəlin qəlbindəkini.

O xoşbəxtdir... Ürəyində açılır səhər.
Görürsənmi, yanaqları nura boyanır?
Pəncərədən süzüldükcə əlvan şəfəqlər
Çağacıq da yuxusundan qalxıb oyanır.

Aygün baxır bir uşağa, bir də ərinə,
Şikayətçi deyil artıq öz taleyindən.
İnanmışdır Əmirxanın vədələrinə,
Gözlərində bir təbəssüm dil açır birdən:

– Taqsırını öz boynuna aldın mərdana,
Mən də sənin günahını bağışlayıram!
(Sağ ol, bacım! Sağ ol sən, ey qəhrəman ana!
Mən də sənin bu qəlbini alqışlayıram.)

**XVII**

Neçə ayın səadəti qonaq gələrək,
İlk baharın nəsimi tək əsdi o evə...
Gəlinciyin sinəsində sevindi ürək,
Öz ərini, uşağını bərk sevə-sevə.

Yaz açılır, ev-eşiyi düzəldim deyə,
Öz əliylə təmizlədi pəncərələri...
Şadlığından sığışmadı yer ilə göyə,
Bahar dostu, şeir dostu o gözəl pəri.

Üzə güldü otaqların hər səliqəsi,
Gül-çiçəklə o bəzədi yaşıl eyvanı.
Hansı şeyə toxundusa onun nəfəsi,
Elə bil ki, ətir saçdı bir dağ reyhanı.

Səməni də qoydu gəlin bayramqabağı;
Pal-paltarı, qab-qacağı çəkdikcə suya
Gülə döndü özünün də əli, ayağı,
Nəfəs aldı ilk baharı o duya-duya.

Körpəsinə paltar tikdi ana əlləri,
Gah üzündən, gah gözündən öpdü sevincək.
Uzandıqca uşaqcığın sarı telləri,
Öz ətrini yaydı evə gül qönçəsi tək.

Arabir də pianoda nəğmələr çalıb,
Musiqilə layla dedi öz körpəsinə.
O, yarımçıq hünərindən ilhamlar alıb,
Dönə-dönə qulaq asdı öz nəğməsinə.

## XVIII

Aygün Əmirxanla bir axşam yenə
Oxumaq üstündə bərk sözə gəldi.
Hər biri haqq verdi öz dediyinə,
Onlar qılınc kimi üz-üzə gəldi:

– Axı mən insanam, məqsədlərim var,
Əl götür, Əmirxan, bu tərsliyindən.
Məni məngənə tək sıxır dörd divar,
Qul yaranmamışam bir kişiyə mən...

Niyə tay-tuşumla ayaqlaşmayım?
De, kimdən əskikdir mənim hünərim?
Yenəmi ayları, illəri sayım,
Nə var ki, qısqancdır, qorxaqdır ərim?..

– Aygün! Bu inaddan sən əl götür, gəl!
Tutaq ki, doğrudan çox hünərin var;
Axı, sən anasan, hər şeydən əvvəl,
Gül kimi uşağın, bir də ərin var...
Olmaz ki, meylini evə salasan?
Öz ilhamını da bizdən alasan?
– Necə? Sevməyirəm mən sizi məgər?
– Tutaq ki, sevirsən dünyalar qədər,
Axırı nə olsun? Gündə bir səhnə,
Gündə bir qastrol, bir müsamirə...
Bəs soyutmayacaq səni evindən?
– Xeyr, öz eşqimə and içmişəm mən:
Ucalıb göylərə dəysə də başım,
Bir sən olacaqsan ömür yoldaşım,
İndi nə deyirsən?
– Onda qulaq as,
Örtülü bazarın dostluğu olmaz.
Mənim nə rütbəm var, nə böyük adım,
Nə də ki, sən deyən bir istedadım.
Bir də bilirəm ki, nə qədər sağam,
Elə bu boyda da mən qalacağam...
İndi fərz edək ki, doğrudan da sən

Bir bəstəkar olub yüksələcəksən,
O vaxt nəzərində, keçdikcə illər,
Mən kiçiləcəyəm bir nöqtə qədər...
Əlbəttə, sən məndən soyuyacaqsan,
Gülmə! Çiy süd əmib deyirlər insan;
Belədir... Sən bunu indidən düşün,
Məni sevirsənsə doğrudan, Aygün,
Böyüklük fikrini ürəyindən at,
Məşhur olmağı da başından çıxart.
Getsən, birdəfəlik gedəsən gərək...
Mənim bu qərarım dəyişməyəcək!

* * *

Yenə də getmədi gəlin evindən,
Ancaq xəstələndi o gündən bəri.
Onu ürəyindən oxladı, bilsən,
Öz qısqanc ərinin acı sözləri.

“Getsən, birdəfəlik gedəsən gərək...”
O necə dilinə gətirdi bunu?
Mən indi, mən indi ayıldım, gerçək,
Bildim Əmirxanın kim olduğunu...

O məni sevsəydi ürəkdən əgər,
Bu sözlər dilinə gələrdimi heç?
Uğursuz bir eşqin (keçsə də illər)
Sönüb kül olacaq odları tez-gec...

Bir ay gecə-gündüz o gözəl nigar
İztirab içində yandı şam kimi.
Müqəddəs qəlbində yanan arzular
Söndü təhqir olmuş bir ilham kimi.

Şəhla gözlərindən qəm yağa-yağa
Döşləri quruyub kəsildi süddən.
Gecələr ac qalıb ağladı çağa,
Ana balasını duymadı bəzən...

Düşdü Əmirxanın canı qorxuya,
Bəzən soyuqladı alnındakı tər...
Elə bil gəmisi qərq oldu suya,
Başında sıxlaşdı ağır fikirlər.

Söydü, dönə-dönə özünü söydü,
Dar oldu kainat gözlərinə, dar;
Hərdən də hirslənib başına döydü...
Sonradan ayılır qısqanc olanlar.

Bəzən əlindəki gözəl neməti
İtirəndən sonra ayılır insan...
Əmirxan! Duydunmu sən bu dəhşəti
Yenəmi aləmdə kor qalacaqsan?

(Oxucum, faciə gözləmə bu dəm,
Gəlin də, çağa da sağ qalasıdır.
Mən matəm şairi ola bilmərəm,
O ana ürəyi dağ qalasıdır!

Uçura bilərmi onu hər külək?
Yenə gün doğacaq onun üzünə.
Sənin də gözlərin gülümsəyərək,
Salam göndərəcək o el qızına.

Ürək də sinəmdə dil açıb deyir:
Qəhrəman ölərsə, şair sevinməz.
Yalnız səadətlə ucalar şeir...
Nə var bu aləmdə həyata əvəz?!

Odur, bax... seyr elə o xəstəni sən,
Bir qızartı gəlir yanaqlarına;
Elə bil üstündən boranlar keçən
Xəstə bir ağacın budaqlarına
Yaşıl yarpaqların nəfəsi gəlir,
Buzları ərimiş kiçik bir suyun
Yenə də ətrafa xoş səsi gəlir;
Siz də bu aləmi yaxından duyun!..)

* * *

Aygün xəstəlikdən qalxır ayağa,
Qaynayır gözündə yenə də həyat.
"İnqə-inqə" deyib, sevinir çağa,
Bir ana qəlbində gülür kainat.

Gül, ey səadətin, eşqin səhəri!
Aləmə nur yağsın gülüşünüzdən.
Bir qələm sahibi olandan bəri
Mən ilham almışam daima sizdən.

Ayrı düşməmişəm sizdən bir an da,
Biz səadət üçün yarandıq deyə.
Cəbhədə can verən hər qəhrəman da
Yol açdı bəxtiyar bir gələcəyə...

Bəzən üfüqləri çatıq görəndə
Oynamaq istərəm bir şimşək kimi.
Yerləri, göyləri səsləyib mən də
Dinirəm bir canda min ürək kimi.

Bahar günəşinin hərarəti tək
Xəyalım dünyanı salama gəlir...
Mənim nəfəsimlə nəfəsləşərək
Dağlar da, daşlar da ilhama gəlir.

Ürək də sinəmdə dil açıb deyir:
Qəhrəman ölərsə, şair sevinməz.
Yalnız səadətlə ucalar şeir...
Nə var bu aləmdə həyata əvəz!

**XIX**

Aygün axşamüstü çıxdı eyvana,
Gördü ki, həyatla qaynayır şəhər.
Baxıb göz gəzdirdi o dörd bir yana,
Nə qədər xoşbəxtdir, gəlib-gedənlər!..

Axşam havasına çıxmış insanlar,
Gəzin, nəfəs alın, uğurlar ola!
İnsan nəfəsilə sevinir bahar.
İnsan günəş ilə gəzir qol-qola.

Oğlanlar, qızlar da qoşa-qoşadır,
Küçələr al-əlvan rəngə boyanır.
Şəhər başdan-başa bir tamaşadır,
Göyün ulduzları yerdəmi yanır?..

Deyib-gülənlərin bəxtiyar səsi
Aygünün qəlbində dinir tar kimi.
Yaşamaq, yaratmaq, gülmək həvəsi
Qəlbində gül açır bir bahar kimi.

Onun sinəsinə sığmayır bu an
Ümidlər, arzular, gözəl duyğular.
Şəfəqlər tökülür qaşqabağından,
Qəlbində hazırdır sonuncu qərar.

Son dəfə boylanıb ilk ocağına
Yatacaq yerinə baxdı həsrətlə.
Alıb çağasını öz qucağına,
Qapıdan çıxmamış hələ sürətlə

Elə bil canına birdən yel əsdi,
Baxdı öz evinin səliqəsinə.
O ayaq saxlayıb, qulaq da asdı
Döyünən qəlbinin “getmə” səsinə.

Boylandı son dəfə daşa, divara,
Bir də çox sevdiyi güllü eyvana;
Elə bil varlığı çəkildi dara,
Ancaq qərarını pozmadı ana.

O getdi sürətli bir ildırım tək,
Ürək sinəsində qalxdı ayağa...

Ana qucağında vəhmələnərək
Özü də bilmədən qışqırdı çağa
Gəlin məna verdi tiflin səsinə:
“– Ay ana, getsək də qayıdaq yenə...”

**XX**

Bəs hanı Əmirxan, indi hardadır?
Üzünü xeyli var görməyirik biz.
Deyin, genişlikdə, yoxsa dardadır?
Sualı şair yox, siz verirsiniz.

O indi evdədir, qanı da qara,
Baxır, nə Aygün var, nə çağa vardır.
Ev də qərq olmuşdur qaranlıqlara,
Xırdaca bir məktub son yadigardır:

“Bir vaxt gülə-gülə gəldim bu evə,
İndisə ağlayıb gedirəm mən, ah!..
Yalnız öz nəfsini sən sevə-sevə
Məni düşünmədin... Səndədir günah...

Sinəmdə dil açan böyük arzular
Gözəl bir sabaha çağırdı məni.
Səninsə buz kimi bir ürəyin var –
Nə şeri sevirsən, nə də nəğməni.

“Getsən, birdəfəlik gedəsən gərək”,
Deyib öz əhdini sən unutdun, sən!
Bilmirəm, yenəmi hərcayilər tək
Qayəsiz, məqsədsiz keçinəcəksən.

Yazıqsan, Əmirxan, öz qədrini bil.
Neçə yol demişəm sənə bu haqda.
(Səssiz yuxu kimi keçdi bu üç il).
Biz artıq bir yerdə yaşamasaq da,
Çalış, öz balanın üzünə bir gün
Sən də bir hünərlə, bir işlə görün...”

* * *

Əmirxan oxuyub məktubu, bir an
Çatıb qaşlarını əsnədi bərk-bərk;
Şaxtalı bir soyuq keçdi canından,
Əsdi varlığına tozlu bir külək.

Dağ boyda gövdəsi döndü yumağa,
Bəs necə? Kişidir!.. Qeyrəti vardır.
Arvad yox olmuşdur, üstəlik, çağa, –
Qeyrəti olana bu böyük ardır...

– Qadındır, nə qədər qəzəblənsə də,
Acığı beş gündə soyuyub gedər.
Dadındır, özünə Allah desə də,
İradə hardadır axıra qədər?!

## XXI

Bu gün kimin qarşısında dayanmış gəlin?
Deyin, kimdir o ağsaçlı müqəddəs insan?
O canlı bir övladıdır qərinələrin,
Yaşayacaq nəsil-nəsil o hər bir zaman.

O fəxridir, şöhrətidir bizim sənətin,
Azərbaycan torpağında ilk bəstəkardır.
Çiçəkləri saralmayan bir şeriyyətin
Onun şanlı rübabında mənası vardır.

Sevir, sevir o müqəddəs bir məhəbbətlə
Yeri, göyü, xəyalatı, insan səsini.
Sevir bizi, sevir bizi səmimiyyətlə,
Duyur daşın, torpağın da öz nəfəsini...

(Duyur, dedim, nə xoşbəxtdir duyan sənətkar.
Hansı qəlbi o yandırar, alovlanmasa?
Sicim-sicim söz yığını yazanlar da var,
Mən bunları heç deməzdim ürək yanmasa.)

Deyin, kimin qarşısında dayanmış gəlin?
Deyin, kimdir o ağsaçlı müqəddəs insan?
O sıx qaşlar altındakı qartal gözlərin
Baxışında zəfər çalır ölümə insan...

O sənətkar rübabının zərif telləri
Min zəfərə, min hünərə çağırdı bizi.
Hər pərdədə titrədikcə onun əlləri
Gah ağlatdı, gah güldürdü ürəyimizi.

O inandı, o inandı öz vətəninin
İdrakına, sevdasına, istedadına.
Ey sənətkar! Bu eşq üçün vətən də sənin
Hər ürəkdə heykəl qoydu böyük adına.

O inandı kommunizmin al bayrağına,
Salamladı insanlığın bu dünyasını.
Yazdı könül dəftərinin hər varağına
Qəhrəmanlar dünyasının simfoniyasını.

O bir çoban tütəyinin sadə səsində
Duydu vətən torpağının ilk sevdasını...
Gözəl çaldı rübabının hər nəğməsində
Ana yurdun öz eşqini, öz mənasını.

Avropanın kölgəsində o dincəlmədi,
Tör-töküntü yığanlardan sənətkar olmaz!
Öz yurduna səyyah kimi qonaq gəlmədi,
Yamaqlardan tikilməmiş bütöv bir libas...

O bəzən də dəniz kimi düşdü lərzəyə,
Çalxalandı göz işləməz bir ümman kimi.
Sənətkarın ilk şöhrəti hünərdir deyə,
Gəlib getdi bu aləmə qəhrəman kimi...

O, şeri də şair qədər sevərdi, dostlar!
O, dostuydu səadətin, bir də baharın.

Ürəyində neçə sözü qaldı yadigar
Nəğmə dostu, şeir dostu o bəstəkarın...

O gedəndə dünyamızdan mən də ağladım,
Elə bil ki, ürəyimdə bir dağ uçdu, ah!..
Ancaq bizim gəncliyə də ümid bağladım,
O öz böyük nəğməsini deyəcək sabah...

Deyin, kimin qarşısında dayanmış gəlin?
Hansı böyük bir bəstəkar ona dərs deyir?
O, canlı bir övladıdır qərinələrin...
Aman dostlar, doğrudanmı öldü Üzeyir?..

## XXII

Nə var? Yerlə gedir qaşın-qabağın!
Yoxsa qərq olmuşdur sularda gəmin?..
Yoxmudur dünyada ömür həmdəmin?
De, niyə soyuqdur yataq otağın?
Din görək, necəsən indi, Əmirxan?
Sənmisən gecələr yanıb qovrulan?
Hanı otaqların xoş səliqəsi?
Hanı o çiçəkli, o güllü eyvan?
Keçdi ər olduğun o xoşbəxt zaman...
Keçdi o günlər ki, bir uşaq səsi
Bu evdə gah gülər, gah ağlayardı;
Daşın, divarın da istisi vardı...
Bir evdən kəsilsə qadın ayağı,
Yetimlər qəlbinə qaranlıq çökər,
Soyuyar havası, sönər ocağı,
Divarlar ağlayıb, göz yaşı tökər...

Qadın əllərilə hər ev, hər ocaq
Ətirlər qoxuyub, gül-çiçək açar.
Həyatın nəfəsi qadındır, ancaq,
Bağlı qapıları o əllər açar.

De, kefin necədir, “əhli-kef” oğlan?
Neçin yatmayırsan sabaha qədər?
Didirmi gövdəni taxtabitilər?
Xörəyin də boyat, üç gündən qalan...
Nə oldu, bəs hanı sənin o şəstin?
Buydumu məqsədin, buydumu qəsdin?
Badə dostların da başından bir-bir
Sürüşüb, rədd olub hara getmişdir?..

(Həyat dəniz kimi təmizlik sevər,
Sahilə çıxarar zir-zibilləri,
Keçdikcə zamanın, ömrün illəri
Səadət carçısı hər yeni səhər
Aləmi isti bir şəfəqlə yuyur,
İnsan öz hüsnünü bir az da duyur.)

**XXIII**

Aygünü görmədim o vaxtdan beş il,
Bilmədim başından daha nə keçdi?
Eşqin bulağından yenəmi içdi?
Bəlkə də bir daha o sevən deyil.

O indi hardadır? Nədir sənəti?
Deyirəm bir yurdu, yuvası varmı?
Dünyada ilk eşqi, ilk məhəbbəti
Uçanlar yenə də xoşbəxt olarmı?

Deyirəm güldümü o bir qönçə tək?
Ürək yaraları çıxdımı sağa?
Ana qucağında həyat sürərək,
Böyüyüb boy-başa yetdimi çağa?

Deyirəm ev sevən, ailə sevən
O qadın dözdümü ev həsrətinə?
Bir də öz ərini düşünüb, bəzən
Yenə qərq oldumu can möhnətinə?

Bəlkə də ay keçib, il dolandıqca
Başqa birisini sevmiş ürəyi.
Yeni bir eşq ilə qəlbi yandıqca
Açılmış üzündə dağlar çiçəyi?

Bəlkə də insandan, həyatdan uzaq,
Artıq inanmayır o heç bir kəsə.
Kim ona qəlb açıb sevirəm desə,
Dilinə "yox!" sözü gətirir, ancaq...

Yox, yox, həyat üçün o doğulmuşdur,
Səadət yaraşır, ona səadət!
O, insan eşqilə insan olmuşdur,
O, nə vəfasızdır, nə də ki, afət!

Sevirik aləmdə yaxşıları biz,
Şərikik onların hər qəminə də,
Bir yerdə yol açır əməllərimiz
Eşqin, səadətin aləminə də...

Bir yaxşı dünyadan vaxtsız gedəndə
Min sızıltı qopur ürəyimizdən,
Elə bil, yanğılar qopur bədəndə,
Bir alov parçası ayrılır bizdən...

Bizim qəhrəman da yaxşılardandır,
Yaxşılıq insana bir adət olsun!
Deyirəm qəlbimdə xeyli zamandır,
Gəlinin nəsibi səadət olsun!

## XXIV

Orkestro dilə gəlir neçə nəfəslə,
Qaşlarını çatır, bərk-bərk hamı susaraq.
Ürəklərdən ürəklərə keçən min səslə
Məşəl kimi alovlanır hər gözdə maraq.

Gah ucalıb, gah endikcə o pərdə-pərdə
Bu iqlimdən o iqlimə yol açıb keçir.
Elə bil ki, qartal süzür mavi göylərdə,
Qoca Qafqaz dağlarını dolaşıb keçir,
Bu iqlimdən o iqlimə yol açıb keçir..

Alim kimi qaşlarını çatır o bəzən,
Cumub gedir fikirlərə, düşüncələrə,
Söhbət açır o, gələcək qərinələrdən.
Kommunizmin gülşənindən gül dərə-dərə
Cumub gedir fikirlərə, düşüncələrə.

Qəhrəmanlar hünərindən o, ilham alıb
Şövqə gəlmiş dünyamıza sözü var kimi.
Mətləbciyi qurtaranda, boğaza salıb
Qışqırmayır o mənasız adamlar kimi...
Şövqə gəlmiş dünyamıza sözü var kimi.

Hər pərdədə söhbət açır insan ürəyi,
Vəcdə gəlir min əməlin şeriyyəti də...
Oxşadıqca duyğuları bahar küləyi
İnsan oğlu xoşbəxt görür təbiəti də,
Vəcdə gəlir min əməyin şeriyyəti də.

Bəzən olur dəniz kimi o, dalğa-dalğa,
Fırtınalar, təlatümlər andırır bizə.
Ahıl dağlar qəlbimizdə qalxır ayağa,
Kor təbiət salam verir iradəmizə,
Fırtınalar, təlatümlər baş əyir bizə.

Boz səhralar çiçək açır, sular durulur,
Dağlar üstə dağlar qoyur insan hünəri.
Hər addımda səadətə bir ev qurulur,
Bütün dünya alqışlayır bizimkiləri,
Dağlar üstə dağlar qoyur insan hünəri.

Arabir də asta-asta, lap ehtiyatla
Elə bil ki, qulaqlara söz pıçıldayır.
Şerim kimi nəfəs alır o da həyatla,

Ürəklərə neçə zəfər müjdəsi yayır.
Elə bil ki, qulaqlara söz pıçıldayır.

(Gül ey dünya, nəsibindir səadət sənin,
Yalnız zəfər yaraşmışdır insan şəninə,
Dalğalarda qərq olmasın hünər yelkənin,
Qoy başımız ucaldıqca ucalsın yenə,
Yalnız zəfər yaraşmışdır insan şəninə.

Etiladan doymamışdır, doyarmı ürək,
Əql evinin nə divarı, nə hasarı var...
İnsan ömrü daha xoşbəxt günlər görəcək,
Bir dünyada hər ürəyin min baharı var,
Əql evinin nə divarı, nə hasarı var...

Ey fəxrimiz, şöhrətimiz, böyük Nizami!
Dedin: "Şüur kainatı gəzib seyr edər,
Ucalsa da insan fikri, insan kəlamı,
Qanad çalar bir müəyyən nöqtəyə qədər..."

Bəs bu gözəl simfonyanı dinlədikcə mən,
Niyə fikrim bir nöqtədə kilidlənməyir?
Bir dünya yox, neçə dünya keçir qəlbimdən,
Günəşin də mövqeyinə idrak enməyir?
Niyə fikrim bir nöqtədə kilidlənməyir?

Yaradanı bir qadındır bu xoş sənətin,
Orkestri dolandırır öz əllərilə.
O, hüdudsuz bir idrakın, bir şeriyyətin
Dünyasından söhbət açır əməllərilə,
Orkestri dolandırır öz əllərilə).

**XXV**

Əmirxanın başı dəydi əhlət daşına,
O ayıldı: məclislərin gec yuxusundan...
Böyük fikir gəlmədisə yenə başına,
Çox soyudu ehtirasdan, pul arzusundan.

Vaxt oldu ki, qonaq getdi həmyaşlarına,
Neçə evdə bir tükənməz səadət gördü.
Qibtəylə də baxdı bəzən yoldaşlarına,
Ürək açan təzə-təzə yüz adət gördü...

Atasıyla, anasıyla sevinənləri
Gördüyü vaxt bağrı başı dönüb qan oldu;
Yada saldı öz balası körpə Ülkəri,
Ata qəlbi neçə dəfə nigaran oldu...

Ərlə arvad ünvanına qoşa sağlıqlar
Deyildikcə fikrə getdi qəm yeyə-yeyə;
Bərk yapışdı boğazından namus ilə ar,
Öz evini öz əlinlə uçurdun, deyə...

Məclislərdə göründüsə arabir yenə,
Dincəlmədi, oturmadı axıra qədər.
Kef vaxtında pərişanlıq çökdü qəlbinə,
Başındasa yuva saldı lal düşüncələr.

– Ev dağıldı, uşaq getdi, yalqızam daha,
Yaddan çıxıb gedir tamam öz sənətim də.
Bir gümanım qalmamışdır artıq sabaha,
Ağırlaşır ildən-ilə təbiətim də...

Bu qayğılar pəncəsində darıxdıqca tək,
Öz ahında dönə-dönə yanıb əridi.
Arabir də ürəyinə toxtaq verərək,
Ayaq üstə can çəksə də, yenə yeridi...

İllər keçdi, o tanınmış bir şəxs olmadı,
Adicə bir həyat oldu fikri, diləyi;
Düzdür, əli bir gün belə işsiz qalmadı,
Ancaq yenə düşünmədi o, gələcəyi...

Aygündənsə ümidini kəsdi büsbütün,
Təsadüfən gördü onu ildə bir kərə.
Hər il qızın yarandığı, doğulduğu gün
Atasından hədiyyələr getdi Ülkərə.

Hər bir insan öz yerini tutdu həyatda,
Şöhrət tapdı öz sənəti, öz hünərilə.
(Hər kürənin bir yeri var bu kainatda.
Öz yerində dövrə vurar öz mehvərilə...)

Mühəndis də, müəllim də, təbib də hər an
Öz işilə, peşəsilə məqsədə çatdı.
Çoxlarına həyan oldu zamanla məkan,
Hər ağac da bir müəyyən yerdə boy atdı.

Əmirxansa öz yerini itirdiyindən
Neçə səmtə əsib getdi gilavar kimi.
Utandı da tamaşaya biletsiz gələn,
Ayaq üstə yersiz duran adamlar kimi...

İdrak onu çox danladı: öz sənətin var,
Məqsədsizmi keçirirsən, de, ömrünü sən?
Taylarındır ildə neçə orden alanlar,
Sənsə hələ orda-burda can çürüdürsən.

Gec deyildir... Qayıt yenə öz sənətinə,
Yerdən yapış, yer qaldırar bir gün səni də!
(Şərik oldum mən idrakın nəsihətinə.
Yer qaldırar hər şeri də, hər nəğməni də...)

Açdı bəzən gözlərini o, gələcəyə,
Ümidinin şölələri tez söndü yenə.
Daha gecdir, daha gecdir baş tutmaz deyə,
İnanmadı, inanmadı öz qüdrətinə...

Ancaq zaman dolandıqca, keçdikcə illər,
O zövq aldı insanların hünər səsindən.
İldən-ilə ucaldıqca bizim nəsillər,
Əmirxan da "adi həyat" fəlsəfəsindən
Qurtarmağa cəhd elədi bir xeyli müddət,
Neyləyək ki, gec dəyişir hökmünü adət.

## XXVI

Deyirsən bu illər ərzində Aygün
Yada gətirdimi heç Əmirxanı?
Yoxsa ürəyindən çıxarıb bütün
Başqa birinəmi qaynadı qanı?

Yox, sevə bilmədi o heç bir kəsi,
(Sevgi oyun deyil, ürək oyuncaq.)
Başına düşmədi sevda həvəsi,
Bir də şad olmadı qəlbi doyunca...

– Ana, atam hanı, – dedikcə Ülkər,
Aygün Əmirxanı gətirdi yada;
Canlandı qəlbində ilk xatirələr,
O keçən günlərə qayıtmasa da...

Ancaq öz ərinə yandı da hərdən,
O müqəddəs qadın, müqəddəs ana.
Ülkəri gözü tək istədiyindən
Düşmən kəsilmədi o, Əmirxana...

Niyə qayıtmadı bəs öz evinə,
İnadmı qəlbini çürüdüb yedi?
Yox, yox, Əmirxandan o qorxdu yenə,
Təhsilim yarımçıq qalmasın, – dedi.

Düzü də beləydi... Əmirxan hələ
Əl götürməmişdi öz inadından.
Yaşayıb əvvəlki əqidəsilə,
Qorxurdu Aygünün istedadından.

* * *

Gəlin sənət ilə yaşadı yalnız,
Ona sirdaş oldu hər bir əsəri
Dinib danışdıqca qələmlə kağız
Aygünün dağınıq düşüncələri.





Yığışıb bir yerə, bir dastan oldu,
Sevindi qəlbində xoşbəxt bir aləm...
O, həyat aşiqi bir insan oldu,
Nə hicran yurd saldı qəlbində, nə qəm.

Sonsuz bir eşq ilə sevdi varlığı,
Sevdi təbiəti, axar suları,
Sevdi hər zəfəri, bəxtiyarlığı,
Yüksək əməlləri, saf arzuları.

Dörd divar içində yalqız durmadı,
O, duydu hər qışı, hər baharı da.
Xəyal dünyasında tək oturmadı,
Gəzdi zavodları, tarlaları da.

Bəzən eşitdiyi hər yeni səsdən
Gözəl rübabında bir nəğmə çaldı.
Hər canlı hünərdən, hər xoş nəfəsdən,
Hər yeni nəğmədən bir ilham aldı.

Aylarla qalxmadı bəzən iş üstdən,
O, yüz düşüncədən birini seçdi,
Elə bil qovladı, o, vaxtı qəsdən,
İllər bir-birindən tez gəlib keçdi.

Ülkərin boyundan oxudu, bəzən
Aygün bu sürətlə keçən illəri.
Kiçik bir zeh açdı saçlarına dən,
Başda çiçək açar insan hünəri...

## XXVII

Bu axşam Aygünün evində gülən
Bu şənlik, bu büsat, bu cəlal nədir?
Ürəkdən-ürəyə axıb süzülən
Söyləyin, şeirdir, yoxsa nəğmədir?

Gör bizim bəstəkar nə qədər şaddır,
Yanır yanaqları dağ laləsi tək.
Bu gün hər qayğıdan, qəmdən azaddır,
Gülür çəmən kimi o, çiçək-çiçək.

Başdan-ayağadək geyib qırmızı,
Məclisə gün kimi şölələr yayır.
Gələn qonaqlara bu ellər qızı
Üstü zəfəranlı plov paylayır.

Yayılmış nanənin, reyhanın ətri,
Süfrədə rəngbərəng şərablar da var.
Otağa sığmayıb gül dəstələri,
Sağ olsun səmimi, mehriban dostlar.

Ülkər də seyr edib öz anasını,
Ortada quş kimi qol-qanad açır.
Duyub sağlıqların saf mənasını
Gözündən ətrafa şəfəqlər saçır.

(Sevin, ey yurdumun əziz körpəsi,
Nə qəm gör aləmdə, nə də qüssə çək!
Bir an da ağlasa bir uşaq səsi
Qəlbimə sancılar o səs nizə tək.)

Aygünün qəlbində gün tək alışan
Bir dünya duyuram göylərdən dərin.
Yanır sağ döşündə qızıl bir nişan,
Üstündə əksi var bizim rəhbərin...

Təbrik nitqləri, odlu alqışlar
Bir an kəsilməyir axşamdan bəri;
Əl çalıb oynayır dostlar, tanışlar.
Külək də titrədir pəncərələri.

(Beşinci badədən sonrasa Elyar
Mənim tək qızışıb qalxır ayağa).
Bizim qarabağlı, o gənc nəğməkar
Oxuyur, yayılır səsi uzağa:

– “Ay işığı, bulaq başı, göy çəmən,
Bir dünyamız, bir sən özün, bir də mən,
Pərdə-pərdə gah ağlayan, gah gülən
Nəfəsinlə oxu, gözəl, qoy səsin
Ürəyimdə kaman kimi titrəsin...

Karvan-karvan göydən ulduzlar köçür,
Öz bəxtinə hər kəs bir ülkər seçir.
Qocalırıq... Ömür keçir, gün keçir,
Oxu, gözəl! Oxu, gözəl, qoy səsin
Ürəyimdə kaman kimi titrəsin...

Can evimə sığışmayan arzular
Bir dünyada neçə dünya arzular,
Məhəbbətin nə ilki, nə sonu var,
Oxu gözəl, oxu gözəl, qoy səsin
Ürəyimdə kaman kimi titrəsin...”

Elyar oxuduqca incəlir səsi,
Məclis sükut edir ona hörmətlə;
Canlara yayılır onun nəfəsi –
Oxuyan ürəkdir bir məhəbbətlə...

Elyar “Oxu, gözəl” dedikcə hər an,
Nə üçün Aygünün üzünə baxır?
Nə məna süzülür baxışlarından,
Odlu gözlərində şimşəkmi çaxır?

Aygün də hiss edir o baxışları,
Rəng alıb, rəng verir gəlinin üzü;
Sözsüz də anlayır, duyur Elyarı.
(Duymaqla keçirək öz ömrümüzü.)

Qızlar fürsət tapıb pıçıldaşırlar:
– Deyəsən yamanca vurulub Elyar.
– Mən də bu rütbəyə çatsaydım əgər,
Məni də, məni də bəyənərdilər...

– Görünür bəxti var... Rənginə bir bax!
– Elə bil dağ gülü çiçək açacaq.
– Nə olsun? Duldur ki... Uşağı da var...
– Eh... Dula baxmayır aşiq olanlar...
Yamanca ucaldı kişinin qızı!
– Yaxşı, danlamayaq öz baxtımızı,
Bizə nə olub ki... Tək imiş Elyar?
– Kül olsun başıma! Otuz yaşım var,
Hələ bir elçi də gəlməyib bizə...
– Özgə suyunasa qoy daş atmayaq...
(Bizsə bu qeybəti çox uzatmayaq,
Qayıdaq yenə də mətləbimizə).

Üç dəfə çalındı qapının zəngi...
Kimdir qonaqlığa bu vaxtsız gələn?
Ağardı qar kimi Aygünün rəngi...
Yonulmuş daş kimi arıq bir bədən
Dayandı gəlinin qarşısında lal.
O heç danışmadı, dinmədi bir an,
Aygünə bir dəstə gül verib, dərhal,
Gözləri yaşarmış çıxdı qapıdan...
Bu dəm pəncərədə dayandı külək,
Sükuta qərq oldu məclisdəkilər.
Gedənin dalınca tez yüyürərək,
– Ata, ata! – deyib qışqırdı Ülkər.

Bozardı Aygünün rəngi kül kimi,
Soyudu get-gedə məclisin odu;
Ülkər saraldıqca qızılgül kimi,
Atalar, analar pərişan oldu.

İnsanlar ağladı bu qəlb yasına,
Gah açıq dedilər, gah xısın-xısın:
– Heç kəsin balası öz atasına,
Ya öz anasına həsrət qalmasın...

Gecədən çox keçdi, qonaq gələnlər
Qalxıb dağılışdı bir-bir, iki-bir;

Qonaq da köçəri bir quşa bənzər,
Yalnız ev sahibi uçan deyildir.

Aygünü bir dərin fikir apardı,
Gecəni yatmadı sabaha qədər;
Üz-üzə çarpışan nəşələr, qəmlər
Bir insan qəlbində tufan qopardı.

Bir əsər yaranır hər düşüncədən,
Hər qəlb vurğusunun öz mənası var.
Sonu acı keçən o xoş gecədən
Mənalı bir romans qaldı yadigar:

“Üfüqlər qızarır al güllər kimi,
Günəş boy göstərir, açılır səhər.
Yığışın qəlbinə bülbüllər kimi,
Ey ilk xatirələr, ilk xatirələr!

Mən onu sevmişdim bir saf ürəklə,
O mənim eşqimi duysaydı əgər...
Girin pəncərəmdən əsən küləklə,
Ey ilk xatirələr, ilk xatirələr!

İndi mən piyada, siz atlısınız.
Qaldımı eşqimdən kiçik bir əsər?
Nədəndir gah acı, gah dadlısınız,
Ey ilk xatirələr, ilk xatirələr!”

Aygünün başında bu düşüncələr,
Uzanıb qızının yanında yatdı;
Elə bil göylərdə Ay ilə Ülkər
Günəş yayıldıqca buluda batdı...

## XXVIII

Elyar da yatmadı bütün gecəni,
Düşündü, daşındı mənzilində tək.
“Aygün sevəcəkmi, sevərmi məni?” –
Dedikcə çırpındı köksündə ürək.

“Bəlkə də ürəyi soyumamış heç
Uğursuz dediyi ilk məhəbbətdən?
Bəlkə qovuşacaq ərinə tez-gec,
Kaş ki, düşməyəydim bu sevdaya mən.

Yox! Bu ola bilməz!.. Aygün bir daha
Sözünü çeynəyib qayıtmaz geri...
Ümidlə, ümidlə baxım sabaha,
Mənim ürəyimdir onun son yeri...

Mənimdir o meyxoş, o dolğun çiçək,
Sevəcək, sevəcək o dilbər məni.
Mənimlə bir yerdə dövran sürəcək,
Ayırmaq olarmı səsdən nəğməni?..

Bir də ki, Əmirxan... O artıq hanı?
Həyatdan nə qədər geri qalmışdır.
Bir də sevə bilməz o, Əmirxanı,
Aygün yaxşı bilir, çox ucalmışdır.

Qaydadır aləmdə: ucalan enməz...
Yox, yox, xatırlamaz keçən günləri...
Yaydan ayrılan ox geriyə dönməz;
İrəli baş alar, yalnız irəli”.

Dünənki məclisi yad etdi Elyar,
Gözündə canlandı o kiçik səhnə;
O baxış, o romans, o pıçıltılar
Elyarı inada çağırdı yenə.

Madam ki, eşqini sezdirdin açıq,
Sözündə bərk dayan, dönmə geriyə;
Meydana müsəlləh əsgər kimi çıx,
Sabahın zəfəri mənimdir deyə!

Səadət gül açdı onun üzündə
Süsənli, sünbüllü bir bahar kimi.
Ümid şöləbləri yandı gözündə
Cənub göylərində ulduzlar kimi.

Hardasan, Əmirxan, hardasan indi?
Yoxsa ağır yatıb yuxu görürsən?
Bir oyan qəflətdən, meydan sənindir,
Oyan ki, Aygünü əldən verirsən.

Hardasan, a başı bəlalı cahal?
Tez-tez qızınınsa gözünə görün!
Olub keçənləri ondan xəbər al,
Bəlkə də insafa gələcək Aygün...

**XXIX**

Əmirxan o axşam getdi məclisdən,
Gecəni yatmadı sabaha qədər.
Qəlbinə zor verdi qəm qəmin üstdən,
Sıxdı məngənə tək onu fikirlər.

Eh, nahaq göründüm... Nə deyəcəklər,
O böyük bir adam, mən adi bir şəxs...
Daima yüksələn böyük bir hünər
Özündən aşağı əyilə bilməz...

Qəflət yuxusunda neçə il qabaq
Heç bir hünərinə inanmadığım,
Bir də duymadığım, o qanmadığım
Aygünün indiki cəlalına bax!

Qəribə dövrandır. Adi bir insan
Nə böyük sürətlə gedir irəli.
Atını dördnala çapdıqca zaman
Tanımaq olmayır keçən günləri.

Mənsə dala qaldım, hamıdan dala...
Qeyrətim olmadı bir qadın qədər.
Ölüm də yoxdur ki, canımı ala;
Mənim də adıma kişi deyirlər...

Bir də mən Aygünə görünsəm əgər,
O, mənim üzümə baxaraq tərs-tərs:

İndi şöhrətimi sevirsən deyər,
Üzümə xoş sifət, xoş üz göstərməz.

Yox, yox, o doğrudan çox ucalmışdır...
Mənsə sürünürəm, o yerə enməz:
Taleyim nə yaman günə qalmışdır,
Məni bu günümdə heç kəs bəyənməz.

Bəlkə boyun əymək... Bəlkə yalvarmaq.
Eh, ölsəm yaxşıdır bundan bir dəfə.
Başıma uçsa da qayalı bir dağ
Bir də üz qoymaram Aygün tərəfə!

**XXX**

Dolandı həftələr, dolandı aylar,
Sənətlə bir yerdə ucaldı Aygün.
Qəlbində insanlar, ulduzlar, aylar
Bəstəkar yaşadı, yaratdı hər gün.

Məktəbə apardı hər gün Ülkəri,
Daima göz qoydu qızın dərsinə.
Qız da səkkiz yaşa çatandan bəri
Hamı valeh oldu onun səsinə.

Ülkər anasının nəğmələrini
Bəzən oxuduqca bir xoş nəfəslə,
Elə bil bir şair ilk əsərini
Oxudu bir səsdə min bir həvəslə.

Böyüdü yüz dəfə ana ürəyi,
Yerlərə sığmadı bəxtiyarlığı.
(Qız olur ananın yaxın köməyi,
Qıza çox bağlıdır ana varlığı.)

Fəqət, qız bilmədi, bilmədi niyə
Atası kənarda gəzir onlardan.
Uşağın ürəyi sınmasın deyə,
Aygün olanları açmadı bir an.

Qoy sevsin, deyərək, atasını qız,
Bəzən Əmirxanı təriflədi də.
Açıb ağartmadı o, sirri vaxtsız,
Atanı küsdürən mənəm, dedi də.

* * *

Bəs neçin Ülkərin qara qaşları
Yay kimi çatılmış bu axşam, neçin?
Nədir üzündəki o göz yaşları?
De, nədən ağlayır o için-için?

Hətta anasının üzünə belə,
Başını qaldırıb baxmayır bir an.
Anası tutduqca onu xoş dilə
Az qala partlasın qız acığından.

– Qızım, ağrın alım, nə oldu sana?
Niyə dinməyirsən, bir danış, qızım?
Bəs sənin hörmətin budur anana?
Mənim əziz balam, körpəcə quzum,
Mən ki, dəyməmişəm sənin xətrinə...

Ülkər inad qızdır, dinməyir yenə.
Aygün dönə-dönə yalvarır ona,
Dolayır qolunu qızın boynuna.
Sonra mehribanca üzündən öpür,
Silib göz yaşını gözündən öpür.

Yumşalır get-gedə uşağın qəlbi,
Dinir kəlmə-kəlmə bir tuti kimi:
– Bayaq... dərsdən sonra... keçirdim bağdan,
Atamı... atamı gördüm uzaqdan...
O da məni gördü...
– Görüşmədiniz?
– Niyə, qucaqlaşıb öpüşdük də biz...
O məni bağrının başına basdı,
Bütün sözlərimə qulaq da asdı.
Qayıq seyrinə də apardı məni,

Sənin “Xatirələr” adlı nəğməni
Üç dəfə oxutdu... O, qəmgin oldu,
Hə, hə, uşaq kimi gözü də doldu...
Dedim ki: – Ay ata, nə üçün bizdən
Ayrı yaşayırsan... Atamsan ki, sən?
O mənə dedi ki... dedi ki: – Anan
Böyük adam olub, bəyənmir məni.
Aygün xəyalına gətirdi bir an
Bu kiçik söhbəti, kiçik səhnəni.
Keçdi düşüncələr başından bir-bir:
“O tənə vurmağı tərgitməmişdir...
Yaxşı ki, qızını sevir ürəkdən,
Yaxşı ki, zövq alır bala deməkdən.
Yaxşı ki, Ülkər də çox sevir onu,
Bilmir müqəssirin kim olduğunu...
Bilməsin... bilməsin qoy hələ Ülkər.
Zaman dolandıqca, keçdikcə illər
Boya-başa çatar kamala dolar,
İşin tarixindən qız agah olar.
Hələlik “müqəssir” mənəm deyərək,
Qızı dərdlənməyə qoymayam gərək”.

Ana öz bağrına basıb qızını,
Oxşadı ömrünün dan ulduzunu.
Qara saçlarına lent də bağladı,
(O, sirri yenə də gizli saxladı.)
Üzdəsə Ülkərin üzünə güldü,
Ağzından inci tək sözlər töküldü:
– Qızım, ağrın alım, çox inadam mən,
Acığım getməyib hələ qəlbindən.
Atanı çox istə, get görüş yenə,
Vaxt olar qayıdıb gələr evinə.
Bir də dərd eləmə özünə bunu,
Tapar su gələndə öz yolumunu...
Di dur, yaxşı balam, dərslərinə bax! –
Ülkər şadlığından qanad açaraq,
Uçdu anasının üstə quş kimi,
Qəmlər qəfəsindən qurtulmuş kimi...

## XXXI

Gecə yorğanını çəkmiş başına,
Aygün də uzanmış öz yatağına.
Ancaq o möhtacdır can sirdaşına,
Soyuq bir yel əsir qəlb otağına.
Otuza az qalır Aygünün yaşı,
Yenə od kimidir al yanaqları.
Bir aypara kimi əyilmiş qaşı;
Onun xoş ətirli gül dodaqları
Neçə il bir öpüş görməmiş, inan!
Gah sola çevrilir, o gah da sağa,
Arabir yataqdan qalxıb ayağa,
Ayrılmaq istəyir xəyallarından...
Nədir düşündüyü? Mehriban bir səs,
Alovlu bir ürək, isti bir nəfəs.
Müqəddəs bir sevgi, təmiz bir əməl,
Saçını oxşayan lütfkar bir əl,
Bir əl ki, bağrına bassın gəlini,
Bu saf gözəlliyin saf heykəlini;
Bir açıq qaşqabaq, bir xoş, gülər üz,
Mehriban bir baxış, mehriban bir söz,
Evdə kişi səsi, qadir bir hünər,
Eşqin keşiyində dayanan bir ər!..

Duyub düşündükcə Aygün bunları,
Gözünün yuxusu çəkilir dəm-dəm.
Yel əsir, qar yağır, gecəsə yarı,
Üşüyür qəlbində bütün bir aləm.
Sonra başındakı bu düşüncələr
Bir-bir ulduz kimi batır heçliyə.
Gecə uzanırsa açılır səhər,
Bütün insanlara “oyanın!” deyə.

Səhərin eşqilə Aygün oyandı,
Geydi saxladığı toy paltarını...
Yenə yanaqları od kimi yandı,

Andırdı gəncliyin ilk baharını.
Əyləşdi piano qarşısında tək,
Onun sinəsində dil açdı ürək:

“Mən indi bildim ki, ürəyim acdır...
Elə bil çörəyə, suya möhtacdır.
Məhəbbət əbədi bir ehtiyacdır,
Mənim də dünyada sevənim varmı?

Doğrudur, insanlar mənə əl çalır,
Ancaq səadətim yarımçıq qalır...
Dağlar da eşq ilə qalxıb ucalır,
Eşqsiz bir bahar, deyin, baharmı?

Hanı saçlarımı oxşayan bir əl,
Bir mehriban nəfəs, bir isti əməl?
Gəl, ey məhəbbətin müjdəsi, tez gəl!
Məni düşündürən bu arzularmı?”

O yenə düşündü, yenə də çaldı...
Basıldı üç dəfə qapının zəngi.
Aygün səhər-səhər bir məktub aldı,
Dəyişdi otağın bütün ahəngi.

“Bəlkə də yazdığım bu məktubla mən
Xəbər verməyirəm ürəyinizdən...
Odur ki, əvvəlcə üzr istəyirəm
Ki, sizə “sevgilim Aygün” deyirəm.

Bəli, mən sevirəm... Haqqım var buna,
Məhəbbət şərəfdir insan oğluna.
Yalnız məhəbbətlə insan ucalar,
Eşqsiz bir ürək vaxtsız qocalar.
Fəqət sevməmişdim mən indiyədək
Hər qızda bir cürə ayıb görərək.
İndisə xoşbəxtəm... Sevirəm sizi,
Sizin şairanə xilqətinizi.
Elə ki, simanız qarşımda durur,

Ürəyim döyünüb şiddətlə vurur...
Bəzən yuxum belə qaçır gözümdən.
(Açıq bir fikirlə deyirəm bunu)
Dünyada bir sizi sevməliyəm mən
Bildim məhəbbətin nə olduğunu...
Nə qədər şirindir bu ləziz nemət!
Şərbət tək içilir bu yolda qəm də.
İnsana yaraşır yalnız məhəbbət,
Deyə bir səs ötür hər vaxt sinəmdə...
Eşidin qəlbimdən qopan bu səsi,
Baxmayın üzümə biganələr tək.
İçimdə yandıqca eşqin nəfəsi.
Ürəyim odlanır pərvanələr tək.
Mən bir nəğməkaram, sizsə bəstəkar,
Sənət rübabının qoşa simiyik,
Bizim bir yolumuz, bir qayəmiz var,
Bir canda biz iki ürək kimiyik.

Var olsun birləşən ürəklərimiz,
Solmasın əbədi bir bahar kimi.
Sənət dünyasının göylərində biz,
Gəlin qoşa süzək qartallar kimi".

Aygün oxuduqca nəzər saldı ki,
İnci tək düzülmüş sözlər yanaşı.
O qədər xəyala, fikrə daldı ki,
Köksünün üstünə əyildi başı...

O bir də məktuba hörmətlə baxdı,
"Müqəddəs duyğular, arzular" deyə;
Qəlbi iftixarla buluda qalxdı,
Məni də dünyada sevən var deyə.

Bir anlıq gözündə rəqs etdi aləm,
Bir cüt ulduz kimi gözləri yandı.
Fəqət xəyalının önündə bu dəm
Əmirxan kölgə tək gəlib dayandı...

Bir də ilk eşqinin ilk nübarını
Andı dan yerinin ulduzu kimi.
Ülkər yerə döydü ayaqlarını
Bordaqda saxlanmış bir quzu kimi...

* * *

Bilmədim o vaxtdan keçdi neçə gün,
Nəyimə gərəkdir hər günün adı?
Bir onu bildim ki, dostumuz Aygün
Məktubu Ülkərdən gizli saxladı...

Düşünüb fikrində bəzən Elyarı,
Açdı arzuları çiçəklər kimi.
Ancaq başındakı bu arzuları,
Qovdu öz əlilə, milçəklər kimi.

Bir də danışmadı heç yerdə bunu;
Söz düşməsin, dedi, boş ağızlara...
Dərk edib özünün kim olduğunu,
Bir kağız göndərdi Aygün Elyara:

“Sizin yazdığınız məktubu aldım.
Təmizdir qəlbiniz, safdır eşqiniz.
Oxuyub, bir müddət heyran da qaldım,
Eşqə, səadətə layiqsiniz siz.

Mənimsə ürəyim sınıqdır hələ,
Qəlbimin yarası sağalmamışdır...
Bəlkə də sevgiyə heç indən belə
Könlümün evində yer qalmamışdır.

Yalnız sənətimlə yaşayıram mən,
Bir də ki, gözümün işığı Ülkər...
Niyə gizlədim ki, bəzən qəlbimdən
İsti bir nəfəs də keçir, müxtəsər.

Fəqət sevməyirəm mən heç bir kəsi,
Xəyalım bir yerdə qərar tutmayır.

Üzümə dəydikcə övlad nəfəsi
Ürəyim ilk eşqi heç unutmayır...

Geri dönməsə də o keçən günlər,
Ayaq basmasam da o boş saraya,
Doğma atasını çox sevir Ülkər,
Qaynayıb qarışmaz ögey ataya...

Məndən inciməyin... Düzü belədir,
Sizə ağrıyıram, baxıb gülmürəm.
Yalan danışmağın mənası nədir,
Mən hələ heç kəsi sevə bilmirəm..."

## XXXII

Bir yeni sürətlə keçdikcə günlər
Yayıldı şəhərə yeni bir xəbər –
O axşamkı məclis, o pıçıltılar,
O baxış, o romans, o sükut, o səs;
Dedilər Aygünə vurulmuş Elyar,
O bir də ərinin üstünə getməz.

Dedilər gecələr ay işığında
Onlar qoşa gəzir bağçada, bağda.
Dedilər yatmayır qılınclar qında...
Onlar qoşa yatır hətta otaqda...

Dedilər dəyişir səmti ruzgarın,
Bu gün-sabahlıqdır iş-işdən keçib.
Dedilər, o gecə Aygün Elyarın
Hələ sağlığına şərab da içib...

Kişilər canbirdir... Lap arvad, lap ər...
Onları ayırmaq olmaz bir daha.
(Ah, ey şayiələr, ey şayiələr!
Salamat çıxmayın bir də sabaha!..)

– Yalandır, yalandır, – dedi Əmirxan,
Yaxşı tanıyıram mən ki, Aygünü;
O, hissə qapılmaz, hər yerdə, hər an
Namusla keçirmiş bütün ömrünü.

Yox! Qayda-qanunla getməmiş ərə,
Öpməyə də qoymaz Aygün əlini.
De, səni kim saldı şayiələrə,
Ey atam gəlini, anam gəlini!

## XXXIII

O getdi. Bu dəfə namusla getdi;
Yenə də Aygünlə üz-üzə durdu.
Aygünün darıxmış vaxtına yetdi,
Ərk ilə bir sorğu-sual da qurdu:
– De, səni doğrudan sevirmi Elyar?
Ancaq düzünü de... Mən bir qonağam...
– Bunu soruşmaqdan nə məqsədin var?
–Məqsəd, mən nə qədər dünyada sağam,
Sənin namusunu göz bəbəyim tək
Bütün böhtanlardan qoruyam gərək.
Çünki anasısan mənim qızımın,
Oxu daşa dəymiş ilk baxtımızın...
– Bu təlaş artıqdır. Hamıdan çox sən
Mənim əxlaqımı yaxşı bilirsən...
Ayrı nə sözün var?
                    – Sənin sağlığın...
Ancaq o Elyarı tap mənə ver bir,
Ona göstərim ki, ev yıxmaq nədir?!
– De, kimin evini yıxır ki, Elyar,
Sənin evinmi var, ailənmi var?
Bu evi sən yıxdın öz əllərinlə,
Sərxoş arzuların, əməllərinlə.
– Məlumdur... Görünür sevirsən onu,
Ayığam, demə ki, yenə sərxoşam...

– Eşqin, məhəbbətin nə olduğunu
Səndən ayrılalı mən unutmuşam.
O vaxtdan heç kəsi sevə bilmirəm...
Diddi Əmirxanın ürəyini qəm.
Nə desin? Doğrudur bu acı töhmət;
Üzdən qımışdısa içdən gülmədi.
Aygünün üzünə bir xeyli müddət
Başını qaldırıb baxa bilmədi.
– Bəli, öz evimi öz əlim yıxdı, –
Deyib, danışmağa dili varmadı.
Səssizcə qalxaraq qapıdan çıxdı,
Bir ümid işığı o aparmadı...

Getdi yol uzunu hey düşünərək:
"Onun baxışları nə yaman sərtdir!
Görünür yapışmaz sınan bir ürək,
Eh, qadın xilqəti gizli xilqətdir...

Bəlkə də söz verib, sevir Elyarı,
Üzümə üzdənsə gülmədi mənim.
Söndü ümidimin son ulduzları,
Çürümüş ət kimi tökül, bədənim!".

* * *

Aygün də özünü danladı bir az:
– Deyəsən yazığın qəlbinə dəydim;
Yenə Əmirxanı sevə biləydim,
Nə deyim... Baş tutar, bu yoxsa tutmaz?..
Bir insan olsaydı vaxtında ərim
Bütün ailəni salmazdı dərdə,
Birə yüz artardı mənim hünərim.
Bu çirkin, bu qara şayiələr də
Heç uydurulmazdı ərsizəm deyə,
İndisə, döşünə bərk döyə-döyə
Qeyrətdən danışır, deyir kişiyəm,
Deyir ki, mən namus keşikçisiyəm.

Eh, bir də illərcə yaşadı evsiz,
Bəlkə də qəlbində yurd saldı iblis...
Kişidir... yəqin ki, neçə üz gördü,
Qapılar tanıdı evlərə girdi...

### XXXIV

Aygün, əziz bacım, bilirsən ki, mən
Dünyaca sevirəm səni ürəkdən.
Sevirəm səndəki gözəl sənəti,
O saf qəlbindəki saf şeriyyəti.
Sevirəm mən sənin vüqarını da,
Andını, əhdini, ilqarını da.
Hələ bu sifətlər qalsın bir yana,
Doğrudan, anasan, gözəl bir ana!
Axı, çox güzəştə gedir analar,
Ata dərdi çəkən ayparan da var.
Qoy sənin qəlbini yıxmasın inad,
Vaxtdır, xeyrə doğru, gəl addımlar at.
Artıq, Əmirxan da sən görən deyil,
Çox ağır olsa da, o dəyişir bil...
Əmirxan keflərə, əyləncələrə
Gedir, ya getməyir ayda bir kərə.
İçsə də şad deyil, pərişan olur,
Səni xatırlayıb gözləri dolur.
Ancaq açılmayır, o qorxur ki sən
Onu birdəfəlik rədd eləyəsən.
Dəyişir, dəyişir o, ürəyini...
İndi halal yeyir öz çörəyini...
Paxıl da deyildir o, yana-yana
Baxıb küsənməyir heç bir insana.
Bu yaxşı sifətdir, çox gözəl işdir,
Əmirxan doğrudan çox dəyişmişdir...
Böyük bir nöqsanı var ancaq onun,
O geridə qalmış həyat oğlunun:
“Gündəlik dolanma, gündəlik çörək”
Fikri, fəlsəfəsi başında qalır...
Odur ki, adi bir ömür sürərək,





Nə bir ad çıxarır, nə də ucalır.
Bir də öz gücünə o inanmayır,
Böyük bir ilhamla qəlbi yanmayır;
Bir para insanlar kimi dünyada
Burnundan irəli baxmayır o da...
De görək neyləyək? Baxıb güləkmi?
Yoxsa yıxılanı tuta bilərmi?
Gəl onu axtaraq, baş çəkək yenə,
Qaranlıq qəlbində məşəl yandıraq.
O inanmasa da, öz qüdrətinə
Çalışaq, birtəhər biz inandıraq.

Danışdıq Aygünlə bu xüsusda biz,
Nə qədər şad oldu ürəklərimiz!
Açıldı gül kimi Ülkərin qəlbi.
Ancaq qabaqladı bizi bir xəbər,
Biz onu axtarıb tapana kimi –
Əmirxan Bakıdan çıxmış – dedilər...

**XXXV**

Aygünə dedim ki, sən qalma işdən,
Gedim mən axtarım, görüm hardadır.
Onu söz gücünə tez taparam mən,
Qorxub-eləmə ki, uzaqlardadır.

Düşdüm sorağına mən Əmirxanın,
Dağlar ayaqlayıb, dərələr keçdim.
Gəzdim hər yanını Milin, Muğanın,
Yandıqca arxların suyundan içdim.

"Muğan" dastanımda əks olunmadı
O yerdə gördüyüm gözəl bir səhnə;
Sonralar bildim ki, "ilğımdır" adı
Düşsün şerimizin söz xəznəsinə;

Muğanda yay günü, görürsən bəzən
Torpağın bürküsü axır su kimi.

Əvvəl gəl-gəl deyib, sonra gizlənən
Bir qızın sevilmək arzusu kimi.

Biz yaxınlaşdıqca, o qaçır bizdən
Şirin bir yuxunun nemətləri tək.
Uzağa getdikcə gözlərimizdən
Elə bil, biryolluq gözdən itəcək.

Bizim Əmirxan da ilğımlar kimi
Gah gözə görünür, gah qaçır gözdən;
Ancaq inadlı bir sənətkar kimi,
Onu axtaracaq, tapacağam mən!..

Axır sorağını mən Əmirxanın
“Lenin” sovxozundan axtarıb aldım.
Axtarış borcudur şair olanın,
Bir axşam mən ona qonaq da qaldım.

Söhbət şirin keçdi, yazmıram, ancaq
Hələ görmədiyim iş hünərini.
Üstünə heç bir şey artırmayaraq
Yazıram özünün dediklərini:

– Mən aqronom idim neçə il qabaq,
Özümün gül kimi sənətim vardı.
Ağacdan-ağaca calaq vuraraq,
Əllərim sevinib xoşbəxt olardı.

Böyük söz olmasın, bəzən insanlar
Kor olub, göz yumur səadətinə.
Qəlbində yurd salır qara bir azar,
Qudurub xor baxır öz sənətinə.

Mənim də qəlbimə girdi bir iblis,
Məni də azdırdı acgöz ehtiras.
Dedim bu sənətdən bir xeyir çıxmaz,
Gedim pul qazanım... Güləcəksiniz...

(Mən onun sözünü kəsərək bir an
Dedim: – Səndə deyil yalnız bu azar.
Pul eşqi getməmiş bir çoxlarından,
Bu dərdə tutulmuş alimlər də var.

Onlar zaman-zaman verib səs-səsə
Nə xəyala gedir, nə fikrə bir gün,
Elmə can yandırmaq əvəzindəsə
İdarələr gəzir çoxlu pul üçün.

Onlar oynadıqca istedadıyla
Əql evi boş olur, sözü kəsərsiz;
Döşünə döysə də alim adıyla
Yaşayır əsərsiz, ölür əsərsiz...)

– Bəli... Pul iştahı, pul acgözlüyü
Gözəl sənətimdən ayırdı məni.
Bəzən yalan dedim, dandım düzlüyü.
Danışsam başımdan gəlib keçəni
Sizə zəhmət olar...
Keflər, məclislər,
Başsız ehtiraslar, cilovsuz hisslər
Soyutdu get-gedə məni evimdən...
İnsan öz evini bu cürə yıxır.
Aygünü, Ülkəri andıqca, bəzən
Başımdan tüstülər, dumanlar qalxır.

Bu vaxt Əmirxanın rəngi saraldı,
Köksünü ötürüb, bir nəfəs aldı...
– İndisə... Mənzilim düşdü bu yana,
Bu qara torpaqdan çıxır çörəyim.
Əsil sənətimlə gəldim Muğana,
Gələli xoşbaxtdır, dincdir ürəyim.
Yoxsa da sən deyən bir istedadım...
Elmim yarımçıqsa, ömrüm də yarı,
Deyirəm burda bir bağça yaradım,
Bir kənd yerindəsə tanınım barı.

***

Keçirdik gecəni, açıldı səhər,
O mənə göstərdi saldığı bağı.
Xırdaca yarpaqlı körpə şitillər
Üzümə güldükcə tifil sayağı,
Dedim: “Tez böyüyüb qol-budaq atın!
Mənim oğlum kimi boy-başa çatın!”

Sonra Əmirxanla vidalaşaraq,
Gəlib nəql elədim Aygünə bunu.
Dedim: “Yaşadacaq o qara torpaq
Yerə arxalanmış o yer oğlunu”.

## XXXVI

Muğan düzündəki səssiz gecələr,
Sıxdı Əmirxanı bir qəfəs kimi.
Şəhər, meydançalar, dolu küçələr
Gəldi qulağına bəzən səs kimi.

Sakit təbiətə tez alışmadı,
O keflər aşiqi, məclislər əri...
Darıxdı bir müddət, çox çalışmadı,
Ağac kölgəsində keçdi günləri.

Fikrini dağıtmaq məqsədilə tək
O, Araz üstünü gəzdi piyada.
Sonra xam at kimi haldan düşərək
Axırda yorulub dincəldi o da.

Çoxaldı get-gedə dostlar, tanışlar,
O da bəyənildi, o da bəyəndi...
Keçdiksə baharlar, keçdikcə qışlar
O ev-ev tanıdı bir neçə kəndi.

Nə xeyirdən qaldı, nə də ki, şərdən,
Onun yanına da gələn çox oldu.
Ayrıldı pərişan düşüncələrdən,
Yalqızlıq qayğısı uçub yox oldu.

Gecələr demə ki, o yalqız qaldı,
Çalışdı çox zaman kitabxanada.
Meylini sənətə, biliyə saldı,
Miçurin dərs verdi Əmirxana da.

Sevdi, o bərk sevdi qəhrəmanları,
Çox şey də öyrəndi bu az müddətdə.
İşdə saç ağartmış mərd insanları
Hörmətlə dinlədi sözdə, söhbətdə.

Bilmədiklərini soruşdu hər an,
Yuxarı tutmadı başını daha...
Gah əvvəl, gah sonra çıxdı yarışdan,
Gündə bir arzuyla baxdı sabaha...

O indi bildi ki, əlbirlik nədir,
Dalğanın qüvvəti dənizdə coşar...
Elsiz igidlik də bir əfsanədir,
Hər ürək bir bədən içində yaşar...

Hər bir ağaca da saldı mehrini,
Hər solan yarpağın, cılız şitilin
Axtardı sirrini, tapdı sehrini.
Hər günün, gecənin, hər ayın, ilin
Udduqca ciyəri saf havasını
Duydu əsil ömrün xoş mənasını...
Baxıb Əmirxanın gördüyü işə
Nə qədər şad oldu Nemət ürəkdən.
Yanında söz açdı onun həmişə
Uğurlu, məqsədli bir gələcəkdən...
Onu öz evində saxladı Nemət,
Sınğındır, yalqızlıq çəkməsin deyə.
(Bəzən yıxılanı, sadə bir hörmət
Qolundan yapışıb qaldırır göyə).

Əmirxan Aygünü, Ülkəri anıb,
Dolmuş ürəyini boşaldan zaman,
Onunla bir yerdə Nemət də yanıb,
Gözləri dolardı həyəcanından...

Bəzən Əmirxanın iş hünərindən
Danışıb özü də ləzzət alardı.
Bəzən də söz açıb səhvlərindən
Şirin bir dil ilə başa salardı.

Bəzən də ordenli qəhrəmanları
Göstərib deyərdi: "Beşcə il qabaq,
Sən bəyənmədiyin bu insanları
Bu boyda rütbəyə qaldırdı torpaq".

Əmirxan onlara baxdıqca hərdən,
Bir qüvvə duyardı öz biləyində.
Ayrılıb hərcayi düşüncələrdən
Arzular bəslərdi öz ürəyində...

(Adətlər övladı yaranmışıq biz,
Təmiz duyğulara, ürəklərə də.
Gah isti, gah soyuq küləklərə də
Ömürlük bağlanır hisslərimiz.

Meylini saldığın sadə bir daş da,
Bəzən ömrün boyu yadında qalır.
Ülfətin oğludur dost da, sirdaş da
İnsana isnişib insan ucalır).

İndi o hərcayi Əmirxana bax!
Gör necə bağlanmış ana torpağa;
Hər səhər quşlardan tez oyanaraq,
Tələsik baş çəkir saldığı bağa.

Yel soyuq əsdimi, şaxta keçdimi,
Çiçək tökmədi ki, ağaclar gecə?
Torpaq öz suyunu yaxşı içdimi?
Ümidlər, arzular çıxmasın heçə!

Əsir yarpaq kimi hər yarpaq üstdə,
Ürəkdir titrəyən əməllərilə.
Görüncə bir kiçik budağı xəstə
Kəsir cərrah kimi öz əllərilə.

Bəzən də bir ağac boysuz olanda
Onun gövdəsinə dərmanlar vurur.
O ağac böyüyüb yaşa dolanda
Sərin kölgəsində məclis də qurur.

O hələ zövq alır pul xərcləməkdən,
Çox açıq əllidir dosta, yoldaşa.
Bütün gəlirini xərcləyib bəzən
Güc ilə çatdırır ayı baş-başa.

Qoy olsun, dəyməyək daha xətrinə,
Ağız ləzzətilə yeyir çörəyi.
Biz ona sərxoş da deməyək yenə,
Qoy içsin, istəsə hərdən ürəyi...

* * *

Keçdi o zamandan üç qış, üç bahar,
Zaman çox məqsədi başa yetirdi.
O sovxoz bağında bitən ağaclar
Üç cürə, beş cürə meyvə yetirdi.

Bəzən bir ağacın üstündə gerçək,
Alma da, armud da, heyva da dəydi;
Əriklər, gilaslar sayrışdı rəng-rəng,
Ağır şaftalılar yerə baş əydi.

(Muğanda gördüyün çöllər, yamaclar
Bütün torpaqlardan bərəkətlidir.
Qışda yaşıl qalır orda ağaclar,
Zəmilər, yoncalar xoş sifətlidir.

Arazın suyundan bol-bol içərək,
Daş kimi çiyələk yetirir aran.
Sağalmış yaranın qaysaqları tək
Qopub parça-parça tökülür şoran.

Araz dünya gəzir bir insan kimi,
Min yerin şirəsi hopur canına:
Şüşəyə tutulmuş bir saf qan kimi
İşləyir Muğanın damarlarına.

Muğanda yetişən ilk nübarları
Yemək də olmayır şirinliyindən.
Gəncənin üzümü, Göyçayın narı
Baxıb həsəd çəkir onlara bilsən).

Bağın nemətləri olduqca dən-dən
Əmirxan onları vaxtında dərdi.
Canla bəslədiyi o meyvələrdən
Ülkərə hər fəsil pay da göndərdi.

* * *

Təsvir elədiyim bu gözəl bağa
İnsanlar ad verdi “Əmirxan bağı”.
Şairin ürəyi döndü bir dağa,
Sevindi dastanın hər bir varağı.

Kən-kənd, şəhər-şəhər bu bağın adı,
Şöhrəti yayıldı bizim ellərə.
Yoldaş Əmirxanın bu istedadı
Düşdü nağıl kimi bütün dillərə.

(Bəzən görürsən ki, yaxşı bir hünər
Gizlənir insanın öz varlığında.
Döyüşsüz, cəbhəsiz keçəndə illər
Qılınc da paslanır yatdığı qında...)

Həyatın əzəldən bir qanunu var:
İşsiz hünər yoxdur, hünərsiz də iş.
Dəmir də, polad da, iş üstə parlar,
Ən böyük ilhamdır zəhmətə vərdiş.

* * *

Elə mən özüm də bir həftə, bir ay
Yazmasam, şeirdən çox soyuyuram
Buludlar yığışır üstümə lay-lay,
İçimdə bir boşluq, heçlik duyuram.





Əsər yazmadığım işsiz zamanlar
Şair olmağımı danıram özüm;
Çox geniş olsa da göy asimanlar
Mənasız boylanır aləmə gözüm.

Elə ki, sətirlər durur yan-yana,
Yarpaqlar yığışır yarpaqlar üstə.
Elə bil dünyalar verilir mana,
Dağlar qoymasam da, mən dağlar üstə.

Böyüdü get-gedə Əmirxan bağı,
Hər ili ardınca bir il apardı...
O bağdan Muğanın hər bir bucağı
Qocalmış bağlara şitil apardı.

Əmirxan özü də gözləmədən heç,
Bir də inanmadan öz qüdrətinə,
Ellər dünyasında tanındı tez-gec,
Taleyi tuş gəldi el hörmətinə.

Dostlar, bəllidir ki, qoca dünyada
Yerin nəfəsilə yaşayırıq biz.
Heç kəsin zəhməti getməyir bada.
Yaratmaq əsridir bizim əsrimiz.

## XXXVII

Günlərin birində Muğan düzündə
Əmirxan Bakıdan bir məktub aldı.
Bir şadlıq oynadı onun üzündə,
Fəqət bir neçə gün o, fikrə daldı.

Ona nazirlikdən yazmışdılar ki:
"Məsul vəzifəyə gələrsinizmi?
Ancaq, bu xüsusda danışıq var ki,
Siz bağdan ayrıla bilərsinizmi?"

Nə yazım? Nə deyim? Nə cavab verim?
Deyərək düşündü Əmirxan xeyli;
Başına düşmədi vəzifə meyli.
“Gözəldir sənətim, rahatdır yerim,
Ayrıldım eşqimdən, məhəbbətimdən,
Barı ayrılmayım öz sənətimdən...

Taleyim bundadır, belədir”, – deyə
Bir cavab göndərdi o, nazirliyə:
“Səmimi ürəklə yazıram sizə,
Lütfünüzə qarşı çox minnətdaram.
Sözüm toxunmasın ürəyinizə,
Nə qədər mən sağam, nə qədər varam
Ayrıla bilmərəm bu ilk bağımdan.
Qızğın iş üstündə keçdikcə illər
Mən hər ağacımdan, hər yarpağımdan
Baxıb zövq alıram dünyalar qədər...
Ağaclar bir mənə alışıb yalnız,
Mənsiz nə yem yeyər, nə də su içər.
Çoxdur iş bacaran insanlarımız,
Zənnimcə, nazirlik mənsiz də keçər”

Bir gün Aygünə də çatdı bu xəbər,
Nə qədər şad olub buna sevindi.
Dil açdı qəlbində onun hisslər:
“Əmirxan başqadır, başqadır indi...”

## XXXVIII

“Qızım, ağrın alım, ağır xəstəyəm,
Bəlkə də bir uzaq səfər üstəyəm...
Dayanma, can bala, gəl görüşək bir,
Anan bilirəm ki, gəlməyəcəkdir...
Ona gəl deməyə üzüm də yoxdur,
Yanında taqsırım, günahım çoxdur...
Yıxıl dizlərinə lap üzün üstə,

Mənim tərəfimdən sən üzür istə,
De, keçsin son dəfə günahlarımdan,
Mən özüm ayrıldım öz baharımdan...”

Məktubu gizlədi Ülkərdən Aygün.
Duyub düşündükcə bir ana qəlbi
Səhərdən axşama sızladı o gün,
Simləri qırılmış bir rübab kimi...

Axşam Ülkəri də alıb yanına,
Birinci qatarla o düşdü yola...
Analıq eşqinin bu dastanına
Yeni bir fəsil açaq, uğurlar ola!

## XXXIX

“Lenin” sovxozuna bir gecə yarı,
Gəldi, qoşa gəldi Ay ilə Ülkər,
Piyada getdikcə asfalt yolları,
Bu ki lap şəhərdir, şəhər, – dedilər.

İkimərtəbəli aynabəndlər də
Hörmətlə onların güldü üzünə,
Sovxoz yanındakı yeni kəndlər də
Yaraşıq verirdi Muğan düzünə.
– Yoldaş! Xəstəxana burda hardadır?
– Odur, bax, “Əmirxan bağı”ndan sağda,
Onillik məktəbdən bir az uzaqda,
Böyük darvazalı bir hasardadır.

“Əmirxan bağı”ndan... Ülkər eşitcək,
Elə bil üzündə şəfəq söküldü,
Ürəkdə Aygün də sevinib güldü;
O ayaq saxladı bağa yetişcək,
Bir ağac dibində nəfəs də aldı.
Gördü ki, sərvlər qatar-qatardır,

Bu xoş səliqəyə o heyran qaldı.
Səliqə sevən də bir sənətkardır.
– Ay ana, gəl gedək, gedək, tez ol bir,
İndi bağ seyrinin vaxtı deyildir, –
Deyib, anasını tərpətdi Ülkər,
“Əmirxan bağı”nı ötüb keçdilər.

* * *

Bir ağ çarpayının üstə Əmirxan
Neçə gündən bəri ağır xəstədir.
Nə həyat görünür üzündə, nə qan,
Elə bil doğrudan ölüm üstədir.

Başının üstündə Ülkərmi durmuş?
O körpə xilqətə yaraşmayır qəm.
Ayaq tərəfində Aymı oturmuş?
Onu rəssam kimi çəkə bilmirəm.

Xəstənin gözləri kölgələndikcə
Aygünün ürəyi yandı şam kimi.
Qabarıq sinəsi qalxıb-endikcə
Qaraldı sifəti bir axşam kimi.

Xəstə bərk yatdısa, ciyər azarı
Onun ürəyinə girə bilmədi.
Ancaq açılmadı göz qapaqları,
Gələn qonaqları görə bilmədi...

Qalxa bilmədisə o öz yerindən
Eşitdi Aygünün “can, can!” səsini.
Üzündə, gözündə hiss etdi, bəzən
Doğma balasının xoş nəfəsini...

(Mehriban, lütfkar, doğma bir səs də
Bəzən ordu kimi yol açır bizə...
Ən ağır vaxtlarda bir xoş nəfəs də
Dağ boyda güc verir ürəyimizə.)

Aygünə teleqram gəldi Bakıdan:
“Yığışıb qayıdın, tez gəlin ki, siz
Sabah Moskvaya gedəcəksiniz”.
Onunsa qəlbində iki həyəcan –

Baxdı Əmirxana, baxdı həsrətlə,
Yeni bir səadət keçdi gözündən,
Sonra da dirilmiş bir məhəbbətlə
Öpdü Əmirxanın solğun üzündən.

O getdi. Yenə də keçdi o bağdan...
Duydu, torpağı da, daşı da duydu;
Əlilə yapışıb neçə budaqdan
Yaşıl yarpaqlara üzünü qoydu...

Ülkər atasının yanında qaldı;
Şəfqət bacıları qızın bir zaman
Doğma ana kimi qeydinə qaldı.
Bir səhər gözünü açan Əmirxan
Başının üstündə görüb Ülkəri,
Zəif qollarilə bağrına basdı.
Onu görməmişdi üç ildən bəri,
Döyünən qəlbinə qulaq da asdı...

**XL**

Moskva... Bir sərin payız gecəsi,
İttifaq Evinin böyük salonu.
Ötür orkestrin qəlb açan səsi,
Sükutla dinləyir min insan onu.

Çilçıraqlar üstə yanır ağ şamlar,
Möhtəşəm sütunlar nura boyanır.
Burda gündüz kimi keçir axşamlar,
Elə bil üfüqdə səhər oyanır...

Zal ağzına kimi tamam dolmuşdur,
Nə qədər dostu var şerin, sənətin!

Hamı bir nəfər tək sakit olmuşdur,
Bu da timsalıdır mədəniyyətin.

Çalır orkestro. Oxuyur Elyar
Aygünün yazdığı bir xoş nəğməni.
Zövq ilə danışır salondakılar
“Mənim səsim” adlı bir təranəni:

“Mən səadət aşiqiyəm əzəl gündən,
Yaranmışam ilk baharın gülüşündən.
Eşit məni, ana torpaq, ana vətən!
Mən yenə də səadətə səs verirəm.

Tel-tel olsun qərənfillər, yasəmənlər,
Yaşıl geysin göy dənizlər, göy çəmənlər.
Bülbül desin bu nəğməmi səhər-səhər:
Mən insana, ədalətə səs verirəm.

Azad qələm, azad rübab əlimdədir,
Arzularım ulusumda, elimdədir,
Qardaşlığın ilk nəğməsi dilimdədir;
Eşqi azad yüz millətə səs verirəm.

Nə xoşdur ki, bu dövranda yarandım mən,
Nankor olmaz bu dünyada qədir bilən.
Bütün eldir məclisimdə deyib-gülən,
Bu məclisə, bu söhbətə səs verirəm”.

* * *

Salona səs saldı odlu alqışlar,
Böyük rus qəlbinin məhəbbətilə.
Səhnəyə güllərlə gəldi ilk bahar,
Gəldi insanların səadətilə...

Hamıya hörmətlə Elyar baş əydi,
Oxudu nəğməkar bir də, iki də...
Aygünün başısa buluda dəydi,
Sevindi özü də, qəlbindəki də...

O xoşbaxt gecənin o xoşbaxt səsi
Axıb dalğa-dalğa yayıldı göyə.
Şeirlə nəğmənin əziz nəfəsi
Dil açdı yaşayaq, yaradaq deyə!

O gecə Kiyev də, Leninqrad da
Böyük bir eşq ilə dinlədi bizi...
Yaxın Tbilisi də, uzaq Bağdad da
Duydu rübab tutan əllərimizi.

Xurma kölgəsində ərəb qızları
Ah, azadlıq! Deyib xəyala daldı.
Misrin, Fələstinin qumsal düzləri,
Şimala həsrətlə baxıb saraldı...

Sanki Hindistan da,Vyetnam da, Çin də
Bizim o axşamkı bayrama gəldi.
Koreya torpağı odlar içində
Moskva! – deyərək ilhama gəldi.

* * *

Çoxdan "danışmayır" Aygünlə Elyar,
Dostlar neçə vaxtdır ehtiyatlıdır.
Keçən hadisədən dərs almış onlar
Ki, yaman xəbərlər quş qanadlıdır.

Aygünsə Elyarın hər baxışından
Oxuyur daima canlı bir sual...
Arabir səssiz də danışır insan,
Arabir sözsüz də keçir həsb-hal.

Fəqət seyrə çıxmış onlar bu səhər
Moskva çayının sahil yanını.
Aygünün üzündə gülür şəfəqlər,
Onun ürək adlı xanimanını
Özü də görməmiş heç bu qədər şad,

Yanır yanaqları yenə lalə tək;
Şəhla gözləri də qüssədən azad,
Parlayır aynalı bir şəlalə tək.

Nədir sevindirən onu bu qədər?
Bir yeni sevginin cəlalımıdır?
Nədir başındakı o düşüncələr?
Yeni simfoniyalar xəyalımıdır?

Bəlkə də eşitmiş təzə bir xəbər?
(Artıq sual verib cavab da alma.)
Ona bir teleqram göndərmiş Ülkər:
Atam sağalmışdır, nigaran qalma!

Elyar dilə gəldi: – Aygün, bilirəm,
Duyuram, doğrudan duyuram ki, siz
Məni bir damcı da sevməyirsiniz...
Nahaq mən eşqimlə vəcdə gəlirəm.

Doğrumu deyirəm?..
                    – Doğrudur, bəli.
Layiq olsanız da siz məhəbbətə,
Hər bir ehtirama, hər bir hörmətə,
Şirindir taleyin, eşqin əzəli...

Mənsə ayrılığa düşəndən bəri
Başqa bir insanı sevə bilmədim.
Otuza çatdısa ömrün illəri
Heç kəslə sevişib, deyib gülmədim.

Elyar təəccüblə: – Çox qəribədir,
Qədim vaxtlardakı rahibələr tək
Bir ömrü eşqsiz, qəlbsiz keçirmək...
Doğrusu, bilmirəm nə fəlsəfədir?..

– Yox, Elyar, mən yenə, yenə sevirəm,
Əmirxan başqadır, başqadır indi.
Elə bil Aygünü eşidib bu dəm
Ata da, bala da birdən sevindi.

Elyar ümidini bilmərrə kəsdi,
Aygünün üzünə daha baxmadı.
Onun can evinə yellərmi əsdi?
Ancaq gözlərində şimşək çaxmadı...

Aygünsə xeyirxah, uca bir səslə
Dedi: – Qəmlənməyin, qardaşım Elyar,
Yaşayın, yaradın yenə həvəslə,
Sizi də, sizi də sevən tapılar.

Sevməyi bacaran qadir bir ürək
Bir sevilməzsə də, bir seviləcək...
Elyar üz döndərib Aygün tərəfə,
Baxıb o gözlərə, baxdı son dəfə...

(Oxucum, Elyarı gəl qınama sən,
Ağırdır ayrılmaq hər məhəbbətdən.
Elə ki, məhəbbət cavabsız qalır,
Ürək bulud kimi dolub, boşalır.)

Elyarın gözündə ucaldı bu an,
Aygünün saf qəlbi, təmiz siması.
Gəlinin mənalı baxışlarından
Keçdi bulud-bulud eşqin mənası...

Gizli saxlamıram bu sirri də mən:
Elyar öz eşqinə əlvida deyə,
Aygünün əlindən öpmək istərkən
Əlini çəkmədi Aygün geriyə...

Ancaq o mehriban busənin odu
Əlin dərisindən keçmədi qana...
Elyar bu hörmətə minnətdar oldu
Ah, müqəddəs qadın, müqəddəs ana!

Sən öz varlığını bir daha düşün:
Nə qədər güclüsən, əzəmətlisən!
Lütfün, mərhəmətin, hər nəvazişin
Kor ehtirasları söndürür, bilsən...

Bəzən heyran qalır xoş xilqətinə,
Hirsli bir pələng də dönür quzuya.
Sənin varlığını can duya-duya,
Qayıdır insanlıq təbiətinə...

– Bəs Əmirxan hanı? İndi hardadır?
Deyərək Aygündən soruşdu Elyar.
– İndi Muğandadır, uzaqlardadır...
İndi hünəri də, sənəti də var.
Ancaq elə bilir sevirəm səni...
Elyar xatırladı o şayiəni...
Dərin fikrə gedib düşündü bir az.
Onun düşündüyü xeyirsiz olmaz...

**XLI**

Hicran yerlərini dolaşdıq, yetər,
Vüsal yollarını izləyək daha.
Nə var bu dünyada, de, qəmdən betər,
Şadlıq arzulayaq hər bir sabaha.

Xəstəmiz sağaldı, qalxdı ayağa...
Bakıya, məktəbə qayıtdı Ülkər.
Əmirxan özünü yetirdi bağa,
Gördü ki, onsuz da mehriban əllər,
Bağın qayğısına yaxşı qalmışdır.
Ağaclar gümrahdır, meyvələr sulu,
Nə yarpaq, nə də bir ot saralmışdır;
Hər bahar nəfəsli, bahar duyğulu
Bağın, bağçanın da şairiyəm mən,
Yaz ətri gəlirmi şeirlərimdən?

* * *

Əmirxan Aygünü yad edib bəzən,
İş vaxtı, boş vaxtı xəyala getdi.
– Özü qurtarmamış məni ölümdən
Niyə tez qayıtdı, niyə tez getdi?..

Bəlkə də eldərdi gəlmişdir Aygün,
Ülkərin qəlbinə dəyməmək üçün...
Bəlkə də yazığı gəlmişdir mənə,
Sonradan peşiman olmuşdur yenə;
Bəlkə də o məni xəstə görərək,
Qəlbində demiş ki, dirilməyəcək...
Bəlkə də o sevir, sevir Elyarı,
Sənət ayırmayır sənətkarları...
Keçdi Əmirxanın başından nələr!
(Ah, siz ey bəlkələr, siz ey bəlkələr,
Görüm yuvanızı sellər aparsın,
Bütün varlığınız heçliyə varsın!)

## XLII

Bir axşam qayıdıb işdən Əmirxan,
Kitab oxuyurdu eyvanında tək.
O yaşıl eyvana elə bu zaman
Elyar ayaq basdı, salam verərək,

Soyuq qarşıladı Əmirxan onu,
"Əyləşin" söyləyib, yer verdi naçar...
Ancaq Əmirxanın tərs olduğunu
Aygündən eşidib bilmişdi Elyar.

– Qonağı gülərüz qarşılayarlar,
Mənsə yol gəlmişəm, həm də qonağam.
Sizlə görüşməyə ehtiyacım var,
Bir böyük iş haqda danışacağam...

– Buyurun, mən qulaq asıram sizə,
Başqa şey gəlməsin ürəyinizə...
– Əvvəl tanış olaq, əl verin görək, –
Deyə Əmirxana gülümsəyərək,
Elyar əl uzatdı. Əl verdi o da,
(Rəqiblər dost olur bizim dünyada).
– Sizə, qardaş kimi gəlmişəm bu gün,

Gəlmişəm deyəm ki, zövcəniz Aygün
Uzun illər sürən bu ayrılıqdan
Dərd çəkir...
                              Qaşını çatdı Əmirxan...
– Nə üçün dərd çəkir? Bəs deyirlər siz
Leyli-Məcnun kimi sevişirsiniz...
İndi bu söhbətin mənası nədir?
– Xeyr, deyilənlər bir şayiədir!
Doğrudur, Aygünü sevirdim mən də,
Deyirdim eşqimi yeri gələndə,
Sizdən nə gizlədim, beləydi... Ancaq
O məni sevmədi, sevmədi bir an.
Dedi ki, bu sevda baş tutmayacaq,
Qəlbimdən çıxmayır çünki Əmirxan...
Zənnimcə, dediyim bu sözlər bəsdir.
Mənə göndərdiyi məktubu alın,
Siz ona idrakla bir nəzər salın,
Bilin ki, hələ də o müqəddəsdir...

Əmirxan oxudu məktubu bütün,
Bir də şadlığından gözü yaşardı...
Gözündə gün kimi parladı Aygün,
Sonra Elyar haqda xəyala vardı:
– Qonağım dünənki rəqib olsa da,
Nə gözəl insanlar varmış dünyada!

* * *

Yenidən əl verib öpüşdü onlar
Çoxdan ayrı düşmüş qardaşlar kimi,
Ağzı möhkəm olan sirdaşlar kimi.
Dönüb Əmirxandan soruşdu Elyar:
– Deyirlər tərifli bir bağınız var,
Onu "yad qonağa" göstərmək olar?

Əmirxan quş kimi qalxdı ayağa,
Dostlar deyə-gülə getdilər bağa.
Doğrudan hər ağac, hər yaşıl yarpaq

Təzə gəlin kimi üzə gülürdü...
Baxıb çalarına sevinir torpaq,
Göyün də üzündən nur tökülürdü.

Elə bu vaxtdaca Aygünlə Ülkər
Bir ağac dalında gizlənmişdilər...
Çəkib Əmirxanın qolundan Elyar,
Apardı onların üstünə sarı.
Aranı kəsmişdi alma şaxları.
(Səhnəsiz də olur bəzən oyunlar.)

Onların səsini Ülkər eşitcək,
Bir qəhqəhə çəkdi dağ kəkliyi tək...
Sonra qanad çalıb qalxdı komadan,
Göydə qucaqladı qızı Əmirxan.
Ülkərin dalınca Aygün də qalxdı,
Əmirxan bu dəfə Elyara baxdı...
– Gördüyüm yuxudur, nədir? – deyərək,
Dönüb qucaqladı Aygünü bərk-bərk,
Onlar sevindilər, sevinək biz də,
Sevinsin hər yeni əsərimiz də...

*1950-1951*

## MÜNDƏRİCAT

### POEMALAR

